**Elmi redaktoru filologiya elmləri doktoru, prof., İSMAYIL VƏLİYEV**

**Redaktoru ƏLİ MAHMUD**

**Rəyçisi fəlsəfə elmləri namizədi, prof., TOFİQ RƏSULOV**

**Məhərrəmov Ziyəddin Həmil oğlu. Sözün yaddaşı əbədidir.Bakı, 2003, 220 səhifə.**

*Bu kitabda əsasən Şuşanın tarixindən yığcam məlumatla yanaşı, ötən əsrin altmışıncı illərindən etibarən burada çalışan rəhbər işçilərin fəaliyyətinin bəzi məqamları, onların keçmiş Dağlıq Qarabağ Muxtar Vilayətinin seperatçı erməni başçılarının təzyiqlərinə məruz qaldıqları, erməni millətçilərinin torpaqlarımıza və xalqımıza qarşı yönəltdiyi düşmənçilik siyasətinin acı nəticələri , Qarabağ torpaqları uğrunda həlak olan qeyrətli oğullarımızın, qəlbində Qarabağ, Azərbaycan sevgisi olan, özündə Vətən, torpaq təəssübünü yaşadan görkəmli elm adamlarının tərcümeyi-hal oçerkləri öz əksini tapmış, itirilən torpaqlara qayıdış duyğularını aşılayan publisist yazılar, ədəbiyyatşünaslıq və dilçilik materiallari verilmişdir.*

## REDAKTORDAN

Filologiya elmləri namizədi, dosent, Göyçə aşıq məktəbinin tədqiqatçısı, «XX əsr Göyçə aşıq mühiti» monoqrafiyasının, «Unudulmaz sazlı-sözlü yurdumuz» toplusunun müəllifi, Müşkül Musanın «Torpağında izim qalan Göyçə», Qaçay Bəhmənoğlunun «O yerlərin yönü bəri» kitablarının tərtibçi müəllifi, dəyərli jurnalist Ziyəddin Məhərrəmovun «Sözün yaddaşı əbədidir» kitabı məni bir daha Şuşalı, Qarabağlı, Göyçəli günlərimizə qaytardı. Müəllif Şuşaya ilk səfərindən, burada tanış olduğu, qaynayıb-qarışdığı, qayğı, ülfət, sədaqət, etibar gördüyü insanlardan ürəklə söhbət açır. Sözün, doğma torpağa məhəbbətin işığına müqəddəs diyarı addım-addım gəzir. Ötən yüzilliklərdə ermənilərin, o cümlədən keçmiş Dağlıq Qarabağ Muxtar Vilayətində yaşayan ermənilərin Azərbaycan xalqına qarşı yeritdiyi məkrli siyasətə qarşı Şuşa ziyalılarının apardığı mübarizə, rus canişinlərinin daşnak liderləri ilə əməl, əqidə dostluqları barədə ətraflı söhbət açır.

Azərbaycanın qeyrət qalası, gözəllik tacı Şuşa Ziyəddin Məhərrəmovun müxtəlif səpkili yazılarında, müsahibələrində, müşahidə edib qəlbinə köçürdüyü lövhələrdə olduğu kimi təsvir edilir, soydaşlarımızı düşmənə müvəqqəti «ərmağan» edilən qeyrət tacımızın, mənlik papağımızın geriyə qaytarılması uğrunda mübarizəyə, səfərbər olmağa, döyüşə çağırır.

«Sözün yaddaşı əbədidir» kitabı sətir-sətir, söz-söz abidələr şəhərinin qala bürclərinin, qurğuşun özüllü binalarının, az qala hər evində bir dahi doğulan qədim məhəllələrin hər qarışından keçir. «İsa bulağı»nın sərinliyini duyur, «Cıdır düzü»nün şehinə yuyunur, Natəvan poeziyasının sehrində müdrikləşir, Bülbül, Xan Şuşinski, Cabbar Qaryağdıoğlu zəngulələrində tarixin min illik səhifələrini vərəqləyir, Üzeyir musiqisinin ecazkarlığı ilə bəşər sivlizasiyasına meydan oxuyursan.

Şuşada tanınmış nəsillər, orada işləyib yaşamış qeyrətli insanlar, onların daxili aləmi Ziyəddinin özünə məxsus yolla oxuculara çatdırılır. Oxucuda belə bir qənaət yaranmasın ki,

«Sözün yaddaşı əbədidir» kitabı yalnız Şuşadan və şuşalılardan bəhs edir. Burada həmçinin müəllifin yaxşı tanıdığı, dostluq etdiyi alimlər, digər bölgələrin el ağsaqqalları, respublikanın rəhbər orqanlarında çalışan qeyrətli insanlar barədə yazılara da geniş yer verilmişdir.

İnanıram ki, kitab geniş oxucu kütləsinin dərin marağına səbəb olacaqdır.

## ÖN SÖZ YERİNƏ

Azərbaycan oxucularına görkəmli rus alimi, publisisti, tarixçisi və jurnalisti Vasili Lvoviç Veliçkonun adı, onun rus işi və beynəlxalq məsələlərə həsr etdiyi, 1904-cü ildə çap olunan «Kafkaz» kitabı yaxşı tanışdır. V. Veliçko uzun müddət Zaqafqaziyada işlədiyindən Qafqaz xalqlarının adət-ənənəsini, mədəniyyətini, məişətini, məşğuliyyətini, psixologiyasını, tarixini mükəmməl öyrənmişdir. Bu kitabında hələ o zamanlar Qafqazda yaşayan xalqların, xüsusən Azərbaycan, gürcü, erməni xalqlarının geniş səciyyəsini vermiş, onların münasibətləri haqqında dolğun təsəvvür yaratmış, regiondakı vəziyyət və münasibətlər haqqında çarizmə raport-məlumat xarekteri daşıyan rəsmi dövlət sənədi kimi hazırlanıb təqdim edilmişdir. Burada ermənilər barədə yazılanlar müasir dövr üçün də xarakterikdir. Azərbaycanın ayrılmaz hissəsi olan Dağlıq Qarabağda və ona yaxın rayonlarda erməni seperatçılarının 1988-ci ildən bəri apardığı işğalçılıq siyasətinin tarixi köklərini haradan götürdüyünü oxucuya aydınlığı ilə çatdırmaq üçün «Elm» nəşriyyatı Qanlı 20 Yanvar hadisələrindən sonra Veliçkonun həmin kitabının üzünü çıxararaq oxucuların mütaliəsinə vermişdir.

«Sözün yaddaşı əbədidir» toplusunun müəllifi ermənilərin xisləti, xasiyyəti, mövqeyi barədə tez-tez söhbət açmağa lüzum bilmədiyindən V. L. Veliçkonun «Kafkaz» əsərindən bəzi məntiqli ifadə və sətirləri artırıb-əksiltməyə yol vermədən bu topluya daxil etməyi zəruri saymışdı:

*«Hələ qədim zamanlardan ermənilər haqqında çox pis fikir formalvşmışdır və bu da tarixi faktlara əsaslanaraq özünü doğruldur. Çünki biz bu əsasları bütöv bir xalqın müxtəlif vaxtlarda ermənilərə olan münasibətləri ilə müqayisədə tapırıq.*

*Puşkin qoca dağlının diliylə deyir: «Sən qorxaqsan, qulsan, ermənisən !» Gürcü xalqı deyir: erməni gəldi və özü ilə yeni dərd gətirdi. Qafqaz tatarları deyirlər: «Barmaqlarının onunu da şam kimi yandırıb erməninin yoluna işıq sal, o sənə sağ ol deməz». Rus xalqı erməniləri gülünc və alçaldıcı adlarla adlandırmağa çoxdan meyllidir. Mütərəqqi və humanist şair Nekrasov deyir:*

*Əsəbi bir ədayla sevdiyinə yox dedi,*
*Naməlum bir erməniylə izdivaca yol verdi…*

*Jemçujnikov (Kozma Prutkov da) belə oxuyur:*

*Ensiz bir çarpayıda uzanmışam mənha-tək,*
*Qonşuluqda erməni qışqırır bərk-bərk.*

*«Bağırmaq» sözü ermənilər üçün fövqəladə tipikdir. Çünki ermənilər çığırmağa, əsası oldu-olmadı, meyllidirlər. Onları özgə evinə buraxmadıqda, əyriliklərinin üstünü açdıqda, yaxud da onların arasından xırda oğruları tutub məhkum etdikdə nəinki qışqır-bağır salırlar, hətta ayrı millətdən olan digər küt və satqınları da qışqır-bağır salmağa məcbur edirlər. Hətta bizim qızğın sadə ədəbiyyatçılarımız da ermənilərə qeyri-məqbul münasibət bəsləyirlər. Leskovun «Kilsə adamları»nda, məsələn, Termosesov adlı oturağı çox yekə olan bir şantajist var…*

*Ermənistanı, Kürdüstanı və Mesopotomiyanı gəzmiş Fransa səyyahı qraf de- Şole ermənilər haqqında deyir: «…. Yalanları olduqca zəhlətökən, alçaqlıqları o qədər həyasız və əclaflıqları*

***o dərəcədə dözülməz idi ki, mənə onlarla dostlaşmaq heç vaxt müyəssər olmurdu».***

***Alman səyyahı Alfred Kerta özünün «Anadolu eskizləri»ndə aşağıdakı fikirləri söyləyir: « Bu əyalətlərdə yaşayan xalqların tərkibi ilə tanış olan hər bir kəs türklərə hörmət bəsləməyə və onları sevməyə, yunanlara aşağı nəzərlərlə baxmağa , ermənilərə nifrət və ikrahla ilə yanaşmağa məcbur olur. Hər yerdə belə məsəl özünü doğruldur ki, yunan iki yahudini, erməni isə iki yunanı aldadır. Qətiyyətlə demək olar ki, sizi Anadoluda və başqa bir yerdə aldadsalar, deməli, siz ermənilərlə iş görmüşsünüz».***

***Həmin müəllif Əski Şəhrdə samballı bir podryatçı işgüzarın sözlərini misal gətirir: « Mən hər hansı bir iş barədə türklə şərtləşəndə yazılı müqaviləsiz keçinirəm, çünki onun sözü kifayətdir, yunan və ya başqa livanlı ilə isə yazılı şərt bağlayıram, ona görə ki, bu lazımlıdır və sərfəlidir. Ermənilərlə heç bir yazılı da iş görmürəm, çünki onların yalan və böhtanlarından adamı heç yazılı şərt də müdafiə edə bilmir».***

***Kələkbazlıq, aldatma nadanların, eləcə də mal satan xalqların vacib keyfiyyətidir. Bu keyfiyyətlər ermənilərə daha çox xas olan xüsusiyyətlərdir: onlar üçün alqı-satqı zamanı hər cür aldatma yol verilən haldır, hər hansı bir əşyanı zorla əldə etmək isə qanun hesab edilir. Gəlir əldə edilə bilən hər yerdə mütləq erməni tapılır. Aldatmaq məqsədi onların bütün düşüncə və hərəkətlərinin başlıca mühərrikidir.***

Həyatımın 50 ilini ictimaiyyət arasında keçirmişəm . Dünyaya göz açdığım Göyçədə, təhsil aldığım elm ocaqlarında, işlədiyim kollektivlərdə rastlaşıb-görüşdüyüm, haqqında eşitdiyim, ünsiyyətdə və təmasda olduğum insanların: böyüklüyü ilə fəxr etdiyim görkəmli elm adamlarının, müəllimlərimin, tələbə dostlarımın, iş yoldaşlarımın, ideal sandığım rəhbər işçilərin, insanlığın bütün şərtlərinə əməl edən hər bir kəsin xoş cöhrəsi mənim üçün unudulmazdır. Ermənilər barədə Veliçkonun

yuxarıdakı mülahizələri və həyatda gördüyümüz reallıqlar hər bir azərbaycanlının yaddaşında erməni obrazının həkk olunan daha səciyyəvi cəhətlərini çözələyir. ..

## ÖZÜ DƏ, İNSANLARI DA DOĞMA ŞUŞA…

Şuşa haqqında adicə bir söz eşidəndə adamı ciddi narahatçılıq bürüyür. Burada keçirdiyimiz firavan günlərin xatirələri, sovet imperiyasının yeritdiyi ikibaşlı məkrli siyasətin başımıza gətirdiyi olmazın oyunları nəticəsində doğma yurd-yuvamızdan dərbədər salındığımız günləri unutmaq olmur. Dağlar gözəli Şuşanı yad etdikcə onun gözoxşayan mənzərələri, könülaçan saf havası, bir də hamı üçün mehriban, gülərüz insanları göz önünə gəlir. Düşüncələrə dalırsan. Axı, bu diyarın xalqımızın mədəniyyətinə, incəsənətinə , ədəbiyyatına bəxş etdiyi nadir istedadların yaradıcılığı bu əsrarəngiz gözəlliklərin qoynunda formalaşıb. Bu rəngarəng «libasların» ağuşunda nazlı Şuşa ondan neçə yüz kilometrlik məsafədə, çox-çox uzaqlarda müvəqqəti köçkün sakinlərinə yaxın məsafədəkindən də olduqca cazibədar, qənirsiz görünür. Hər tərəfdən əhatə olunduğu əzəmətli dağları, sıldırımlı qayaları, qarlı zirvələri ucalığın son nöqtəsini andırır…

Tarixin müəyyən məqamlarında Qarabağ xanlığı yadellilərin hərbi təcavüzünə məruz qalmaq təhlükəsi olanda bu ərazidə müdafiə üçün qalalar, bürclər, istehkamlar qurulmuş, həmçinin Pənahəli bəy Şuşa şəhərinin indiki yerində öz iqamətgahını möhkəmləndirmiş, buranı öz adı ilə --Pənahabad adlandırmışdır. Bura həm hərbi-müdafiə, həm sağlamlıq, həm də ticarət cəhətdən çox əlverişli olduğundan Qarabağ xanlığının inzibati-mədəni mərkəzi sayılmışdır. Sonralar şəhər Qala, daha sonra Şuşa qalası və ən nəhayət Şuşa adlandırılmışdır. Mərdlik, mətanət, cəsarət, dözüm, dəyanət simvolu olan bu şəhər heç zaman düşmənə öz qucağında sığınmağa imkan verməmişdir… Qarabağın ağır günlərində - 1990-ci ilin avqustunda Şuşanın (Pənahabadın) 240 illiyi münasibətilə keçirilən elmi-nəzəri konfransda SSRİ Xalq deputatı, mərhum dostum Vaqif Cəfərovun giriş sözündəki məntiqli ifadələr, **«Qarabağnamələrin»** müəlliflərindən biri, professor Nazim Axundovun, filologiya elmləri namizədi Namiq Babayevin, bərpaçı mühəndis İlhami Fətəliyevin məruzələrində

söylənilən tarixi faktlar hamımızı «öldü var, döndü yoxdu»ya çağırırdı… Lakin səriştəsiz hərbçilərimizin, təfəkkürsüz, uzağı görməyi bacarmayan «başbilənlərimizin» səbatsızlığı nəticəsində erməni-rus hərbi birləşmələri 1992-ci ilin fevral ayının 25-dən 26-na keçən gecə Xocalı şəhərində müqayisəsi olmayan soyqırımı törətdi. «Qarabağ» qəzeti 27 fevral 1992-ci il tarixli sayında yazırdı: ***«Xocalı yerlə yeksan edildi, tarixdə misli görünməmiş qırğın törədildi. Rus və erməni ordusunun zirehli birləşmələri şəhəri viran etmişlər.***

***Rusiya prezidenti B. Yeltsinin, Rus imperiyasının müdafiə naziri Şapaşnikovun, istilaçı Ermənistan Respublikasının prezidenti Ter-Petrosyanın gizli görüşlərindən sonra – fevralın 25-də, axşam saat 22 radələrində muzdlu rus hərbi birləşmələrinin zirehli dəstələri və dişinəcən silahlanmış erməni ordusunun əsgərləri Xocalı şəhərinə basqın etmişlər. Tarixdə görünməmiş kütləvi qırğın törətmiş, qocalara, qadınlara, körpələrə və xəstələrə aman verməmişlər. Şəhərin Qaladərəsi deyilən hissəsində yeni məskunlaşmış məhsəti türklərinin əksəriyyəti evlərindəcə yandırılmışdır. Sağ qalan əhalinin şəhəri tərk edə bilən hissəsi Əsgəran şəhəri, Kətik kəndi arasında PDM-lərlə, tanklarla, ZDM-lərlə iühasirəyə alınmış, qan su yerinə axıdılmışdır.***

***Əhalinin bir hissəsi qarlı, çovğunlu və dumanlı havada istiqamətlərini itirmiş, erməni kəndlərinin ərazilərinə dağılmışlar. Bu zaman əvvəlcədən yolları, keçidləri kəsən ermənilər onları da qanlarına qəltan etmişlər.***

***Əsgəranın qarşı tərəfində öldürülmüş onlarla insanın meyitini götürmək və yaralılara kömək etmək hələlik mümkün deyil.***

***Ağdam şəhərinə gələ bilmiş şəhidlərin verdiyi məlumata görə, şəhər dairəvi mühasirəyə alınmışdır. İndi Xocalının alovu, tüstüsü göylərə dirəklənir. Respublika rəhbərləri isə ölkə əhalisini dincliyə, milli qırğının qarşısını almaq üçün siyasi dialoqlara çağırırlar. Azərbaycan xalqı erməni və rus***

***kimi qəddar bir düşmənlə təkbətək qalsa da, Bakıda vəzifə kürsüləri üstündə mübarizə gedir.***

***Şəhər yandırılarkən xocalıların son sözü belə olmuşdur: «Azərbaycan sahibsizdir. Torpaqlarımızı verdiyimiz üçün qeyrətsizlik yükünün altındayıq».***

***Qeyrəti olanlar, heç olmasa, öz ailəsinin, qızının, qadınının qeyrətini çəkə bilənlər torpağımızın müdafiəsinə qalxsınlar».***

Faciənin davam etdiyi günlərdə aşağı rayonlardan göndərilmiş avtomaşınlarla şələ-bərxana döyüş zonası sayılan Şuşadan müvəqqəti olaraq çıxarıldıq, mayın əvvəllərində əhali təzə-təzə doğma şəhərinə qayıtdığı bir vaxtda şuşalıların müsibətləri başladı.

Əslində İttifaq rəhbərliyinin məkrli siyasəti nəticəsində Qarakənd səmasında hərbi, Xankəndi-Şuşa ərazisində mülki vertalyotların qəzaya uğraması və Azərbaycanın ürəyi, dövlətçiliyimizin aparıcı simaları sayılan sayseçmə oğullarımızın müəmmalı ölümündən sonra bütün Qarabağın, o cümlədən Şuşanın fəlakətli günləri başlamışdı.

Şuşalılar 1992-ci ilin 8 mayından respublikanın müxtəlif rayonlarına səpələnib. Didərginliyin acısını dada-dada yaşasalar da, ictimai həyatda baş verən hadisələrə biganə qala bilmirlər. Doğma Şuşanın işğalı gününü hər il böyük həyacan və kədərlə yad etməklə, onun xəyanətin qurbanı olduğunu tədbirlərdə iştirak edən rəsmilər qarşısında təfərrüatı ilə vurğulayırlar. Möhtərəm Prezidentimiz Heydər Əliyev cənablarının ***«Şuşasız, Ağdamsız, ümumiyyətlə, Qarabağsız Azərbaycan yoxdur»*** kəlamını mübariz şüara çevirən bütün Qarabağ əhli 2001-ci ilin 14 martında Akademik Milli Dram Teatrında «Şuşa (Pənahabad) - 250» mövzusunda görkəmli elm adamlarının iştirakı ilə keirilən elmi-praktik konfransda Şuşa şəhərinin yaranması, inkişafı, memarlığı, Azərbaycan təhsilinin inkişafında maarifçilərinin yeri, Türk dünyasının Şuşa mənşəli ictimai xadimləri, Qarabağ ədəbi mühiti və sair barədə geniş söhbət açmaqla torpaqlarımızın işğaldan azad edilməsi üçün dünya dövlətlərinin iştirakı ilə qəbul

olunan sənədlərə hələlik məhəl qoyulmadığı, məsələnin uzadıldığı diqqətə çatdırılmışdır…

O vaxtdan doğma yurda mütləq qayıdacağımız günü səbrsizliklə gözləyirik. Özü də buna böyük əminliyimiz vardır… Dünyada baş verən hadisələr, respublikamızın rəhbərliyinin əməkdaşlıq etdiyimiz ölkələrlə apardığı diplomatik işlər və onların verdiyi dəstəklər Azərbaycanın qəsb olunmuş ərazilərinin yaxın vaxtlarda sülh yolu ilə geri qaytarılacağına böyük ümidlər doğurur…

## «QALA»YA İLK SƏFƏR

Univermağın girəcəyində qonşu Qayabaşı kəndinin sakini Həsən Hümbətovla rastlaşdım. Səmimi görüşdük. Ümumi vəziyyətlə maraqlanandan sonra bir neçə gün əvvəl Bakıda olarkən Qəşəm müəllimlə görüşdüyünü, onun göyçəlilərin gün-güzəranı, bir çox ailələrlə yanaşı, bizim ailənin dolanışığı, nə işlə məşğul olmağımız, nə üçün onun yanına gedib görüşmədiyimiz ilə yaxından maraqlandığını bildirdi…

Şuşaya səfər etdiyimiz həmin gün rayonda keçirilən tədbirlə əlaqədar Qəşəm müəllimi görmək mümkün olmadı, Cəvahir bacı onlarda qalmağımızı təklif etsə də, mehmanxanada yerimiz olduğunu bildirdik və şəhərin tarixi yerlərini gəzəcəyimizi söylədik. «Xan qızı» bulağının üstündə ayaq saxladıq, qəzet işçisi olduğumdan fikrimdə redaksiyaya baş çəkməyi nəzərdə tutmuşdum. Burada, bir neçə addımlıqda yerləşən, Azərbaycan musiqi sənətinin korifeylərindən Üzeyir Hacıbəyovun və Bülbül (əsl adı Murtuzadır) Məmmədovun büstləri ilə öz əzəmətini , vüqarını nümayiş etdirən «Mədəniyyət evinin», Xurşud Banu Natəvanın malikanəsinin sol tərəfində ucalan inzibati binanın qarşısında elə bil ki zərurətdənmi, təsadüfdənmi redaksiyanın şəhər həyatı və məktublar şöbəsinin müdiri işləyən keçmiş tələbə yoldaşım İlduzə Babayeva ilə gözlənilmədən rastlaşdıq. O, məni dərhal tanıdı, yanındakılara kimliyimizi söylədi, onlarla sağollaşdı, tədbirdə iştirak edə bilməyəcəyini üzürlü saymaqlarını bildirdi. Onunla binanın dördüncü mərtəbəsinə qalxdıq. Bizi tanışlıq üçün komsomolun birinci katibinin otağına apardı, içəridə bizi qarşılayan bəyaz saçlı nurani bu gəncin bizi görməzə-bilməzə uzun illərin tanışları kimi qarşılamasından ürəkdən məmnun qaldım. Xeyli söhbətdən sonra mən Bəykişi əmini və ailəsinin adını bildiyim üzvlərini soruşdum. Tacir müəllim bildirdi ki, əmim kənd təsərrüfatı idarəsində çalışır, Tərlan xala evdardır, uşaqlarımızın əziyyətini o çəkir … Bir neçə söz Tacir müəllim barədə: ***ailədə üç uşaq olublar, atası müharibədən qayıtmayıb.***

***Anası Humay xala övladlarının təhsilinə tələbkarlıqla yanaşıb. Tacir hərbi xidmətini başa vurduqdan sonra ali məktəbi bitirib, həyatda öz yerini tutub, komsomoldan partiya işinə irəli çəkilib, uzun illərdir ki,Şuşa rayon təhsil şöbəsinə rəhbərlik edir…***

İşçilər nahar fasiləsinə hazırlaşırdı, biz xudahafizləşib getmək istəyəndə Tacir müəllim dedi ki, evdə Sizi gözləyirlər, nə danışırsınız! Cəld yerindən durub paltosunu geyindi və daxili telofonla bir az gec gələcəyini Hidayət Bəylərova bildirdi.

Tərlan xanımın yüksək zövqlə bəzədiyi süfrənin qonağı olduq. Ailənin mehmannəvazlığı, Xəyyamın qarmonda, Talehin tarda ifa etdikləri musiqi nömrələri, Sədaqətin balaca bacısı Nəzakətlə bizim üçün şerlər söyləməsi, kiçik Şəhriyarın musiqiyə heyranlıqla qulaq asması bizə çox xoş təsir bağışladı… Mütləq mehmanxanada qalacağımıza görə icazə istədik… Çünki burada dünən tanış olduğumuz, bir neçə gün əvvəl rayon məlumat hesablama idarəsinə rəis təyin olunmuş Əkbər Göyüşov və bir də mehmanxananın müdiri Əhəd Əliyev gözləyirdi.

Axşam təxminən saat səkkiz olardı. Şəhərin ortasından axan «Turş su» bulağından su içib Mikayıl Əsədovun müdiri olduğu «Xəngəlxana»nın önünə düşəndə içəridən bizə əl elədiklərini gördük, tez içəri gəlməyimizi bildirdilər. Öyrəndik ki, Qəşəm müəllim zəng edib, bizi soruşub. Burada olmadığımıza görə özümüzü məzəmmətlədik. Heç bir neçə dəqiqə keçməmişdi ki, uzun telefon zəngi çalındı. Əhəd müəllim dəstəyi götürüb danışanda ***«Yoldaş Aslanov, qonaqlar artıq buradadır, arxeyin olun, hər şey qaydasındadır»,-*** deməsi və onun bizim birimizin telefona cavab verməyimizi bildirməsi qeyri-adi görünsə də, qardaşım Fəxrəddin bildirdi ki, gecdir, onsuz da səhər görüşünüzə gələcəyik. O, telefonda israr etdi, hazırlaşın, Nəbini göndərirəm, - dedi…

İçəridə ayrı qonaqları da vardı, onlarla tanış olduq, onları yola salandan sonra bizi sorğu-suala tutdu. Tacir Əliyevin qonağı olduğumuzu öyrəndi. Son iki ildə görülən quruculuq və abadlıq

işləri, yeni iş yerlərinin açılması, respublika miqyaslı tədbirlərin, əmək və mahnı bayramlarının keçirilməsi barədə maraqlı söhbətləri ilə məndə burada işləmək istəyini yaratdı, telefonu götürüb bir neçə adama zəng edib «vakansiyalar»ı ilə maraqlandı. Səhər tezdən «Şuşa» qəzetinin redaktoru İsrafil Əbilovla görüşüb onunla birgə Kamil Fərəcovun yanında olmağımızı bildirdi…

***Haşiyə əvəzi olaraq, Şuşada tanınmış, adlı-sanlı nəsillərdən biri olan Fərəcovlar ailəsi və Kamil müəllim barədə bir neçə kəlmə: Kamil müəllimin tərcümeyi-halı mənə bəlli idi. Xankəndindəki 4№-li məktəbdə müəllim, dərs hissə müdiri, Şuşa Xalq Maarif Şöbəsində inspektor, daha sonra müdir işləmiş, işgüzarlığına, tələbkarlığına və obyektivliyinə görə raykomun təşkilat şöbəsinə müdir vəzifəsinə irəli çəkilmişdi. Ailələrində on bir övlad böyüyüb ərsəyə çatmışdır. Bacı və qardaşları – Mahirə, Məhluqə, Lətifə, Səmayə, Həqiqət, Sofiya, Dilşad, Rahilə, İsa , Nadir – bunların əksəriyyəti ali təhsil , xalqına ləyaqətlə xidmət edən müxtəlif ixtisaslı mütəxəssis kimi tanınırdı. Çox səmimi, təvazökar idilər. Kamil müəllim həm zəhmli, həm də mehriban bir insan idi. İşi çətinə salınan, milliyyətcə azərbaycanlı olan kadrları büro üzvü, xalq nəzarəti komitəsinin sədri kimi qəti etirazları ilə erməni şərindən xilas edirdi.***

Kamil müəllimin qəbulunda olduq, o, bir neçə variant təklif etdi, sonra da ünvan qoyub getməyimi məsləhət gördü… Aradan üç ay keçmişdi. Novruz bayramı idi, kəndin içində toplaşıb yaz əkini ilə maraqlananların həmsöhbətlərindən biri də məniydim. Kəndin poçtalyonu Feruz məni kənara çağırıb ünvanıma gələn teleqrammanı verdi. Orada rusca yazılan sözlərin məzmununda işə dəvət olunduğum bildirilirdi… Həmin günün səhəri Şuşaya yola düşdüm…

## «DANIŞIR ŞUŞA»

İdeoloji sahəyə baxan katib Sevil xanımla görüşümüz çox səmimilik, mehribanlıq şəraitində keçdi. Hələlik yerli radio verilişlərinin təşkilatçı-müxbiri vəzifəsində işləməyim nəzərdə tutulduğunu və bu işin məsuliyyəti barədə məlumat verdi və qarşıya çıxan problemlərin əməli həllində köməklik üçün şöbə müdiri Tacir Əliyevə müraciət etməyimi məsləhət bildi… İşə başladım. Verilişlərin canlı və maraqlı olması üçün radio bülletenlərini ilk vaxtlar yaxından dostluq etdiyim, tez-tez bir süfrə arxasında əyləşdiyim jurnalistlərdən Elman Mirzəyev və Əli Mahmudla birgə lentə köçürüb efirə oxuyardıq. Efirdə büüetenlərin aydın oxunmasına texniki cəhətdən nəzarət avtomat telofon stansiyasının məsul işçilərindən Eldar Ağayev və Oruc Namozov tərəfindən təmin olunurdu. Radionun diktoru Tamaşa Həsənovanı körpə uşağı olduğundan çox zaman bülletenləri oxumaqdan azad edərdik. Yerli verilişləri çox adam vilayət və respublika radiosundan ayırd edə bilmirdi. «Danışır Şuşa»: - Hamı bu ifadəyə və tanış səsə öyrəşmişdi.

Sevil xanım Babayevanın tövsiyəsi ilə Böyük Vətən müharibəsində tarixi qələbənin 30 illiyi ilə əlaqədar «Şuşa» qəzetində «heç kəs unudulmur, heç nə yaddan çıxmır» rubrikası ilə dərc olunan «İnam» adlı ilk irihəcmli yazımla rayon ictimaiyyəti ilə ünsiyyətim yaranmağa başladı. Yeni adət-ənənələrin, peşə və əmək bayramlarının keçirilməsi ilə əlaqədar hazırlanan ssenarilər, radio bülletenlərinin qəzet materiallarından tamamilə fərqlənməsi, respublikanın istirahətə və müalicəyə gələn görkəmli elm adamlarının radioda canlı çıxışlarının təşkili sensasiya doğururdu. Rayon qəzetində xalq təsərrüfatının müxtəlif sahələrindən xəbər verən problemli məqalələr yazmağıma zərurət yaradırdı…

Respublika Könüllü Kitabsevənlər Cəmiyyətinin məsul işçiləri, xüsusən də gənc şair Zəlimxan Yaqubov vaxtaşırı Şuşada olurdu. Mən Şuşa Rayon təşkilatının məsul katibi olduğumdan Zəlimxan müəllimlə aramızda səmimi münasibət yaranmışdı. Daşıdığım ictimai vəzifə rəngarəng tədbirlərin keçirilməsini tələb edirdi.

Həmin cəmiyyətin təşəbbüsü ilə Ümumittifaq sovet ədəbiyyatı günləri, uşaq ədəbiyyatı həftəsi, Sabir poeziya günləri, xalqımızın ölməz şairi Səməd Vurğunun 70 illiyi ilə əlaqədar Azərbaycan Elmlər Akademiyasının Nizami adına Ədəbiyyat İnstitutu, Respublika Yazıçılar İttifaqı, «Bilik» cəmiyyəti və M. Əzizbəyov adına Şuşa Pedaqoji Məktəblə birgə keçirdiyi elmi-praktik konfransda filologiya elmləri doktoru, şair-dramaturq Atif Zeynallının, filologiya elmləri namizədləri Rasim Tağıyevin və Qurban Bayramovun çıxışlarında şairin həyatından, yaradıcılığından hələ heç kəsə məlum olmayan faktların qəzet səhifəsində ümumiləşdirilmiş şəkildə oxuculara təqdim edilməsi növbəti tədbirlərə bir nümunə kimi maraq yaratmışdı. Radioda ***«Şuşa qonaqların gözü ilə», «Kurort şəhərinin problemləri», «Sağlamlıq ocaqlarında», «Gənclərimizin yaradıcılığı», «Məktəblilərin yay istirahət düşərgələrində», «Mütəxəssisin tribunası», «İnşaatçı sözü», «Buraxılış obyektlərində»*** və sair mövzularda verilən xəbərlər verilişləri daha da zənginləşdirirdi. Qəşəm müəllim müntəzəm olaraq radionun fəaliyyəti ilə maraqlanar, öz dəyərli məsləhətlərini verər, iradlarını bildirərdi. Həmçinin, tez-tez qəzet işçilərinin yaradıcılıq müşavirələrində iştirak edər, kəskin, əsaslı tənqidi qeydlərini söyləyərdi. Qəzetin redaktoru İsrafil Əbilova böyük hörmət və rəğbəti olduğundan əsən küləkdən də onu qoruyardı. Redaktoru həyat yoldaşının vaxtsız vəfatı bərk sarsıtdığını katib bildiyindən qəsdən müəyyən məsələrlə əlaqədar ümumən rayon üzrə görülən işlər barədə ən yaxın bir dost kimi gündə ona məlumat verməyi tapşırar, plenum və büro məsələlərinin hazırlanmasını, ən iri təsərrüfatların məsul təhkimçiliyini ona həvalə etməklə pessimizmə qapılmaqdan xilas eyləyərdi . Necə deyərlər, onu «süfrə yoldaşlarından» ayrı salmağa, daimi ictimai gərginlikdə saxlamağa çalışardı ki, xəstələnməsin, gələcəyi olan bir milli ziyalı kimi sağlamlığını qorusun, özünü sıradan çıxarmasın, yeganə oğlu Rövşən anadan yetim qalsa da, heç olmasa, ata qayğısından məhrum olmasın… Amma gözəl insan, istedadlı jurnalist, böyük ürək sahibi, hamını

özünə yaxın dost bilən, qardaş sayan İsrafil, onunla uzun illər duz-çörək kəsənlərin laqeydliyinə və biganəliyinə dözməkdən bu gözəl həyatla vaxtsız xudahafizləşməyi üstün tutdu, taleyinə yazılanları özü bilərəkdən məhv etdi…

İsrafil müəllimin ciyərparası Rövşən doğmalarının qayğısı ilə böyüdü, vətənin müdafiəsinə qalxdı, didərginliyin acılı-şirinli günlərini, dözülməz aylarını, nəhayətsiz illərini yaşadı, qəlbini sıxan həsrət və qubara tab gətirə bilmədi, vaxtsız ölümü ilə atasının dostlarını, əmilsi Vaqifi, bibiləri - Tinatini, Tahirəni, Ramellanı, Sənubəri, yaxın qohumlarından Əlövsət Məhərrəmovu, Vəli Quliyevi yamanca sarsıtdı…

Belə faktlardan nə qədər desən söhbət açmaq olar. Bu topluda Şuşa mühitində tanış olduğum, doğma və yaxın sandığım gərəkli insanların ürək sözlərini, təsüratlarını, ictimai fəaliyyətlərini, hadisələrin ən ağır çağlarında Qarabağ əhalisi ilə bir yerdə olan ziyalıların tərcümeyi-hallarını daxil etməklə sözün yaddaşını əbədiləşdirməyi məqsədəuyğun saydıq.

## DAĞLIQ QARABAĞIN RƏHBƏR AZƏRBAYCANLI K A D R L A R I

Dağlıq Qarabağı Azərbaycandan qoparmaq üçün gizli tədbirlər görüldüyünü, planlar hazırlandığını burada çalışan milli azərbaycan kadrları mərkəzdəkilərdən daha yaxşı müşahidə edirdilər. Keçmiş DQMV- inin müxtəlif strukturlarının rəhbər vəzifələrində çalışanlar 1920-ci ildən bəri respublikamızdan ərazilər qopartmağa nail olan torpaq hərislərinin hər cür fitnəkarlığa əl atdıqlarının canlı şahidi olsalar da, onların yuxarı orqanlara sızdırdıqları məlumatlara çox zaman istənilən səviyyədə məhəl qoyulmadığından, görülən tədbirlərin ardıcıllığına lazımi əhəmiyyət verilmədiyindən ermənilərin seperatçı iddiaları günü-gündən güclənməyə başlayırdı. Dəfələrlə DQ ermənilərin avanturist , millətçi hərəkatlarının baş qaldırmasının, onların

Moskvadakı havadarları tərəfindən müdafiə olunmalarının acı nəticələr verəcəyi barədə söylənilən fikirlərə biganəliyin gələcəkdə acı nəticələr verəcəyini vurğulayan vilayətin rəhbər azərbaycanlı kadırlarından bir çoxunun müxtəlif bəhanələrlə işdən uzaqlaşdırıldığını Şuşanın yaşlı adamları söz düşəndə maraqlı faktlar əsasında danışardılar. Vilayət yarandığı illərdə görkəmli dövlət xadimi Süleyman Vəzirov buradan Aran rayonlarına pənah aparmış soydaşlarının geri qayıdıb doğma ocaqlarında yaşamaları üçün lazımi təşkilatçılıq işləri həyata keçirmişdi.

Vilayətin mövcud olduğu müddətdə çoxsaylı azərbaycanlı kadrlar buranın mərkəzində və rayonlarında çalışmışdır. Onlardan Bahadur İbrahimov, İdris Məhərrəmov, İbiş Məmmədov, Fərrux Hüseynov, Nağı Dadaşov, İdris Hacıyev, Bəhmən Məmmədov, Cəmil Bəylərov, Eldar sgərxanov, İbad Məmmədov, Asif Əliyev, Nurəddin Ağayev, Valeh Kazımov, Qanboy Ağayev, Surxay Cahangirov, Qurban Quliyev, Ramella Allahverdiyeva, Ramil Usubov, Tofiq Babayev, Vaqif Cəfərov, Ağababv Qasımov, Nadir Sadıqov, Aydın Abbasov, Cavanşir Əbilov, Rafiq Mürsəlov, Çingiz İsmayılov, Nüsrət Əzizov, Yusif İsmayılov, Miramil Ağamirov, Dəmir Bayramov, Şahmalı Məmmədov,.Flora Ağayeva, Aydın Hüseynov, Arif Əliyev, Fazil Hacıyev, Rafiq Şirinov, Qədir İsmayılov, İbrahim Vəzirov, Cahid Kərimov, Fərman Salahov, Fərman Sadıqov, Rasim Hacıyev, Adil Babışov, Əkbər Hacıyev, Zahid Abbasov və onlarca başqalarının adını çəkmək olar. Onların gördüklərini, bildiklərini, eşitdiklərini yaddaşlardan yazıya köçürən olsa, ermənilərin Azərbaycan xalqının əleyhinə, Azərbaycan dövlətçiliyinin ziddinə apardıqları mənfur siyasətin mahiyyətinin nədən ibarət olduğu barədə aydın təsəvvür yaradar. Bu topluda onların bir çoxunun həyat və fəaliyyəti haqqında qeydlərin verilməsinə də yer ayrılmışdır.



## ŞUŞANIN TALEYİNDƏ ƏVƏZOLUNMAZ RƏHBƏRLƏRDƏN BİRİ …

Yazıçı-jurnalist dostum Vasif Quliyevin 2001-ci ildə «Şuşa» nəşriyyatında çapdan çıxmış **«Ən yaxın dost»** kitabında **«Qızıl əsgər»in məsul katibi»** və **«Yolum Uzaq Şərqədir»** adlı portret-oçerklərində Məhərrəmovlar nəslindən İdris Məhəmməd oğlu və Seymur Şükür oğlu barəsində geniş məlumat verildiyindən müəllif İdris müəllimin həyatının, ictimai-siyasi fəaliyyətinin oxucu marağına səbəb olacaq bir çox məqamlarını xüsusilə zəruri sayır…

İdris Məhəmməd oğlu Məhərrəmov 1913-cü ildə Şuşa rayonunun Malıbəyli kəndində yoxsul kəndli ailəsində anadan olmuşdur. İlk təhsilini Malıbəyli ibtidai məktəbində almış, 1928-ci ildə Şuşa Pedaqoji Məktəbinə daxil olmuş və buranı 1932-ci ildə müvəffəqiyyətlə bitirmişdir. Pedaqoji təhsil aldıqdan sonra bir müddət DQMV-nın Stepanakert(Xankəndi) və Martuni rayonlarında müəllim işləmiş, ali təhsil almış və 1942-ci ilin mart ayında Ordu sıralarına çağrılmışdır.

Alman faşistlərinə qarşı vuruşmalarda fədakarlıq göstərən İdris Məhərrəmov ağır yaralanmış və 1944-cü ilin fevralında Vətən müharibəsi əlili kimi ehtiyata buraxılmışdır. İdris Məhərrəmovu cəbhə qəzetində dərc olunan məqalələrindən qiyabi

tanıyan, öz-özlüyündə doğma, mehriban, səmimi münasibət bəsləyən, məktublaşmaları ilə ünsiyyətdə olan, 416-cı diviziyanın məxfi işlərinə nəzarət edən, 44-cü ordu qərərgahının əks-kəşfiyyat şöbəsində çalışan dağlı qızı Şərqiyyə xanım birdən-birə İdrisin məktublarının arasının kəsildiyindən narahat olmuş və onun taleyi ilə maraqlanmış, ordu sıralarından tərxis edildikdən sonra partiya aparatına irəli çəkildiyini öyrənmişdir. O, Stepanakertə gələrək ilk dəfə İdris Məhərrəmovla üzbəsurət görüşmüş…, sonradan nəsillərə nümunə olan bir ailə qurmuşlar. Bu müqəddəs ailədə Ramiq, Çingiz, Ehtiram adlı xalqına gərəkli, layiqli övladlar dünyaya göz açmışdır…

İdris Məhərrəmov 1944-cü ilin fevralından 1947-ci ilin dekabr ayına kimi Azərbaycan KP Dağlıq Qarabağ Vilayət Komitəsində təlimatçı, 1947-ci ilin dekabrından 1949-cu ilin yanvar ayına kimi vilayət partiya komitəsi kadrlar şöbəsi sədrinin müavini, plan-maliyyə-ticarət şöbəsinin müdiri vəzifələrində işləmiş, 1949-1951-ci illərdə Azərbaycan KP MK yanında ikiillik partiya məktəbinin dinləyicisi olmuşdur. Ali partiya məktəbini fərqlənmə diplomu ilə bitirməsi, yüksək təşkilatçılıq bacarığına malik olması nəzərə alınaraq, ona Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin katibi vəzifəsində işləmək təklif edirlər. Lakin anası Nisə xanımın etirazına görə və bacısının, qardaşı İbrahimin ailə üzvlərinin aqibətini düşünərək, Bakıya dəvət olunduğu işdən imtina edir. Bir müddət vilayət partiya komitəsi katibinin köməkçisi işləyir. 1951-ci ilin dekabr ayında DQMV Mardakert (Ağdərə) RP Komitəsinə ikinci katib göndərilir. Cəmisi səkkiz ay burada çalışır, az vaxtda azərbaycanlı kadrlarla apardığı iş, bacarıqlı və istedadlı gənclərin oxumağa göndərilməsi, xalqın mənafeyini qoruyan adamların rəhbər vəzifələrə irəli çəkilməsi sahəsində məqsədyönlü fəaliyyəti qiymətləndirilir. 1952-ci ildə Sov. İKP MK katibi A.N. Suslovun şəxsi rəyi ilə İ. Məhərrəmov Azərbaycan KP Şuşa RK-nın birinci katibi seçilir. Bir sıra vəzifəlilər özlərinə rəqib olmasın deyə rəhbər kadrların hazırlanmasına mane olmaları kimi zərərli praktikanın əksinə olaraq, Şuşada əsl kadr hazırlığına nail olunur.

Yerli gənclərin, xüsusən də gənc qızlardan Mahirə Fərəcova, Şəfiqə Abdullayeva, Məlahət Dərgahova, Şəfiqə Məmmədova və başqalarının rəhbər vəzifələrə irəli çəkilməsinə zəmanət verir, Şuşanın kadr potensialı olan bir baza rayonu kimi kadrlarının bir neçəsinin respublikanın müxxəlif rayonlarına rəhbər vəzifələrə təyin olunmasına şərait yaradır.

İ. Məhərrəmov doğma rayonuna rəhbər seçildiyi gündən etibarən Qarabağ xanlığının paytaxt şəhəri, Qafqazın mədəniyyət və ticarətində mühüm yer tutan, 1905-ci ilə qədər sürətlə tikilən, 1920-ci il erməni-müsəlman davasında yandırılaraq xarabazarlığa çevrilən,1923-cü ildə ermənilər muxtariyyat əldə edəndə «girov» götürülən, binaları sökülən, materialları Xankəndinə yeni şəhər salınmaq üçün daşınan, sıxışdırılan əhalisi aran rayonlarına pənah aparan, elitasına, ziyalılarına ermənilər tərəfindən xalq düşməni, kulak damğası vurularaq divan tutulan Şuşanın gələcəyi barədə həmişə düşünərdi. 1941-1945-ci il müharibəsindən dərhal sonra erməni mənşəli bir amerikalı milyonçunun Stalinə məktubla müraciət edərək, öz vəsaiti hesabına Şuşanı bərpa edib qızının şərəfinə bu şəhəri Şuşan adlandırmağa razılıq verməsini xahiş etmişdir. Həmin məktub müzakirə üçün DQMV-ya ünvanlanmışdır. İdris müəllimiqn özünün iştirakı ilə Şuşa RPK üzvlərinin iqtisadiyyatı dirçəltdikdən sonra Şuşanı özləri bərpa edəcəkləri barədə qəbul etdiyi qərarın ləng yerinə yetirilməsi onu rahat buraxmadığından ilk öncə tarixi abidələr şəhərinin baş planının hazırlanmasını və sökülmüş tikililərin bərpası məsələlərini diqqət mərkəzində saxladı. Şəhərin bərpası və inkişafı üçün kurort istiqamətini əsaslandırmaq ən münasib variant idi.

Şəhərin yuxarı hissəsindəki xarabalıqlar onun ümumi görkəminə xələl gətirməklə yanaşı, mənəviyyatı da zəhərləyirdi. Erməni daşnaqları öz soydaşlarını, xüsusən də gəncləri Ermənistandan müntəzəm olaraq buraya gətirib azərbaycanlıları – türkləri təcavüzkar, qatı düşmən kimi təqdim etdiklərini İdris müəllim dəfələrlə eşitmiş, uçuqların şəklini çəkdiklərinin, bizi

bəşər svilizasiyasını məhv edən yırtıcı simasında təbliğ etmələrinin canlı şahidi olmuşdur.

İ. Məhərrəmov Şuşanın kurort istiqamətinin perspektivinin daha real olduğunu əsas götürərək, Azərbaycan MİK-nin 1928-ci il tarixli Y çağırış III sessiyasının ikili standarta əsaslanan, Şuşanın və Stepanakertin dövlət əhəmiyyətli kurort hesab edilməsi barədəki qərarının icrası baxımından görülən işlərə qayıdılması, 1932-ci ildə yaradılan 30 çarpayılıq istirahət evinin, 1938-ci ildən Xan Qızı Natəvanın malikanəsində fəaliyyətə başlayan pioner düşərgəsinin bazasında «Şuşa uşaq vərəm sanatoriyası»nın daha səmərəli işləməsi, epizodik öyrənilmiş Şuşa kurortunun yenidən elmi öyrənilməsinə qayıdılması üçün geniş tədbirlər planı işləyib hazırlamışdır. Nəzərdə tutulan məsələlərə elmi təkan vermək üçün 1953-cü ilin iyul ayında N. Nərimanov adına Azərbaycan Dövlət Tibb İnstitutunun bir qrup alimi akademik Topçibaşevin sədrliyi ilə «Şuşa kurortu və onun inkişaf perspektivləri»nə həsr olunmuş elmi sessiyasındakı tezis və rəylər Şuşanın kurort istiqamətində inkişafının eimi pasportu olmuşdur. Azərbaycanın ən görkəmli alimlərinin iştirak etdiyi bu elmi məclis Şuşa şəhərinin baş tikinti planında kurort prinsiplərini əsas götürməyi zəruri hesab etmişdi. Şəhərin yuxarı hissəsi kurort zonası və çoxmərtəbəli yaşayış binaları tikmək üçün nəzərdə tutulduğu üçün, ilk növbədə, mövcud xarabalıqların sökülməsi lazım idi. İdris Məhərrəmovun gərgin səyləri sayəsində bu işlərin bir hissəsi görüldü və 1954-cü ildə kurort şəhəri Şuşanın əsas planı təsdiq olundu. Elmi sessiyadan sonra Şuşanın dağ-iqlim faktoru, Turşsu və Şırlan turşsu mənbələri, suyun müalicəvi əhəmiyyəti ardıcıl olaraq elmi müzakirə obyektinə çevrildi. Bu baxımdan 1920-1953-cü illər ərzində 5 elmi məruzə oxunduğu halda, 1953-1959-cu illərdə həmin mövzuda 67 elmi məruzə edilmiş, «Şuşa şəhərinin abadlaşdırılması tədbirləri haqqında» Azərbaycan SSR Nazirlər Sovetinin 1955-ci ilin martında xüsusi qərarı qəbul olunmuşdur.

İdris Məhərrəmovun gərgin əməyi, hamı tərəfindən alqışlanan təşəbbüskarlığı, son dərəcədə tələbkarlığı və əməli bəhrəsi tez bir zamanda özünü büruzə verən təşkilatçılığı sayəsində respublikanın ayrı-ayrı nazirliklərinin Şuşaya marağı artmağa başlamışdır. Nazirliklər Şuşa şəhərindən onlar üçün torpaq sahələri ayrılması məsələsini qaldırmış, istirahət evləri, pioner düşərgələri tikdirməklə şəhərin kurort istiqamətində inkişafına bilavasitə yardımçı olmuşlar. Görkəmli dövlət və ictimai xadim Süleyman Vəzirovun rəhbərliyi ilə onun rəis olduğu Azneft Sənaye Birliyi Şuşada ilk kurort binasının- «Azneftin sanatoriyası» deyilən binanın tikintisinə, Kommunal təsərrüfatı nazirliyi tərəfindən isə 100 çarpayılıq pioner düşərgəsinin inşaasına başlanıldı. İstirahət evlərinin imkanları genişləndi, korpuslarının sayı artırıldı. İstirahət evi üçün torpaq sahəsi, mal-qara, qoyunçuluq fermaları, arıçılıq təsərrüfatları yaradıldı: 500 nəfərlik klub tikildi, şəhərdə köhnə uçuq 75 bina bərpa edildi. Şəhərin girəcəyində yeni avtovağzal, Mamayı bulağının yanında 8 mənzilli iki yaşayış evi, mərkəzi küçədə universal mağaza binası, Meydan bulağının yanındakı karvansarayda açıq və üstü örtülü kolxoz bazarının tikintisi, Cıdır düzündə Molla Pənah Vaqifin büstünün qoyulması, Üzeyir Hacıbəyovun ev muzeyinin açılması təmin edildi, su xətləri əsaslı təmir olundu. Ümumiyyətlə, Şuşa şəhərində və onun kəndlərində xalq təsərrüfatının bütün sahələri üzrə inkişafın təmin olunması üçün görülən işlərin miqyası genişləndirildi, rayonun kənd təsərrüfatının dirçəldilməsinə yönəldilən tədbirlər tədbirlər həyata keçirildi. Rayon özü kənd təsərrüfatındakı uğurlarına görə Ümumittifaq Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisinin iştirakçısı oldu.

Stepanakert inşaatçılarının Şuşada başladıqları binaların tikintisinin qəsdən illərlə yubadıldığı və işlərin keyfiyyətsizliyi üçün rayonun rəhbərliyi öz tikinti və təmir-tikinti idarələrinin maddi-texniki bazasının möhkəmləndirilməsinə nail oldu. Nəticədə şəhərdə tikinti-abadlıq işləri genişləndi, rayon abadlıq

işlərinə görə Respublika Kommunal Təsərrüfatı Nazirliyinin Keçici bayrağına layiq görüldü.

Sosial-mədən sahədə aparılan ardıcıl işlərin ümumi bəhrəsi olaraq rayon mədəniyyət evinin və xalq teatrının, xalq çalğı alətləri ansanblının, nəfəs alətləri orkestrının, tibb məntəqələrinin, kənd doğum evlərinin, rabitə şöbələrinin yaradılmasına nail olundu. Kəndlərdəki məktəblərin, mədəni-maarif ocaqlarının, kino və idman qurğularının, bu və ya digər sosial-iqtisadi problemlərin həlli məsələlərini diqqət mərkəzində saxlanıldı.

Yerli mətbuat və radionun işindəki durğunluğu səriştəli kadrlar hesabına aradan qaldırdı. Uğurlarının sayını artırmaqda davam edən İ. Məhərrəmov 1958-ci ilin dekabrında yuxarı vəsilə partiya rəhbərliyində çalışan Cəfərli soylu bir məmurun ondan neçə il işləməsini, nə qazanmasını, kimə «xeyir» verməsini soruşur və mədəni surətdə pul alıb-verməyən adamın onlara gərəksizliyini söyləyir. Nəticdə İ. Məhərrəmovun rayon partiya təşkilatının konfransında başqa işə keçməsi ilə əlaqədar vəzifəsindən azad olunduğu elan edilir. O, qısa müddət orta məktəbdə müəllim, dərs hissə müdiri, fəhlə-gənclər məktəbində direktor əvəzi işləyir, ilk internat məktəbin təşkilini təmin edir. Bu arada Azərbaycan KP MK-nın plenumunun qərarı ilə tanış olarkən onun vəzifəsinin öhdəsindən gələ bilmədiyi, milliyyətçi əhval-ruhiyyəsi dini etiqadına görə işdən azad olunduğunu öyrənəndə qərarın təsvirindən yuxarı partiya orqanlarına şikayət etməklə, barəsindəki haqsız qərara yenidən baxılmasına müvəffəq olur. Rəhbərlik etdiyi dövrün statistik analizinə əsaslanaraq, şəhərin ermənilər yaşayan ərazisindəki evlərin plana salınmasını, milli zəmində ədavətə səbəb olan xarabalıqların sökülməsini milli ədavət deyil, şüurların təmizlənməsinə etdiyini, məscidlərin təmiri dinə deyil, memarlıq abidələrinə, tarixə, incəsənətə xidmət kimi anladığını bildirir, millətini, xalqını sevənlə «millətçi»ni fərqləndirməyi xahiş edir. Məlum olur ki, vəzifəsindən haqsız yerə İdris müəllimlə birgə respublikanın 20-dən çox rayonunun rüşvət vermək bacarığı olmayan katibi vəzifəsindən azad edilib.

İdris müəllim millətçi olmadığını əməli fəaliyyəti ilə təsdiq etmək üçün 1960-cı ilin əvvəlində yenidən Ağdərəyə rəhbər partiya işinə göndərilir. Birinci katib iqtisadiyyat üzrə alim, ermənicə İdris müəllimdən yaxşı yazıb oxuya bilmədiyi, həm də rusdilli olduğu üçün işin ağırlığı ikinci katib kimi onun üzərinə düşür. Burada vaxtı ilə Azərbaycan KP MK –nın birinci katibi işləmiş və İdris müəllimin

Şuşa RPK-nın birinci katibi vəzifəsindən çıxması qərarını imzalamış, seleksiya təcrübə sahəsinə gəlib-gedən akademik İman Mustafayevlə yaxından təmasda olması, söhbət əsnasında tamahsız, bir sıra bacarıqlı işçilər, həmçinin onun barəsində yalançı məlumatları əsas tutaraq səhvə yol verildiyini İman Daşdəmiroğlu səmimiyyətlə etiraf edir.

Mardakertdə işlədiyi vaxt ailə vəziyyətinə görə iş yerini dəyişmək barədəki ərizəsinə əsasən İdris müəllimə Göyçay, Ağdam və bir sıra başqa rayonlarda yüksək vəzifələr təklif edilsə də, bu təkliflərlə razılaşmır, İ. Məhərrəmov Stepanaker istehsalat rayonunun tərkibində olan Şuşa Şəhər ZDS İK-in sədri vəzifəsində işləməyi üstün tutur…

Şuşanın problemləri ilə şəhər İK sədri seçildiyi ilk gündən daha yaxından maraqlanır. Rayonun ermənilər tərəfindən qəsdən ləğv edilmiş inzibati-ərazi bölgüsünün bərpasına, vaxtilə burada fəaliyyət göstərən idarə və müəssisələrin Xankəndinə (Stepanakertə) daşınmış əmlakının geri qaytarılmasına, onların yenidən yaradılmasına, Şuşa rayonunun statusunun bərpa olunmasına ilk növbədə nail olur və rayon icraiyyə komitəsinə sədr seçilir. Tikinti üzrə mühəndis olan raykomun birinci katibi Arif Ağakişiyevlə(O, sonralar Peruda və Yaşıl Burun adalarında SSRİ- nin səfiri işləmişdir) birgə fəaliyyəti sayəsində Şuşa şəhərində Ümumittifaq əhəmiyyətli kurort kompleksinin yaradılması, turist marşurutlarının açılması, rayonun maddi-texniki bazasının möhkəmləndirilməsi təmin olunur. Şırlan turşsu mənbəyindən şəhərə su kəmərinin çəkilməsi, pansionatın bazasında «Şuşa sanatoriyası»nın yaradılması, 36, 40, 50, 18 mənzilli çoxsaylı çoxmərtəbəli yaşayış binalarının, 140 çarpayılıq uşaq bağçasının, 900 yerlik orta məktəbin, pedaqoji məktəbin tədris korpusunun, tələbə yataqxanasının, 120 çarpayılıq mərkəzi rayon xəstəxanasının, avtobazanın, televiziya ötrücü stansiyanın (bu stansiyadan rele ötürücü telofon vasitəsilə 1967-ci ildə ermənilərin Stepanakertdə azərbaycanlılara divan tutmaları respublikaya çatdırıldığı üçün ermənilərin azərbaycanlıları kütləvi

qırğını baş tutmamışdı) və bu kimi mühüm obyektlərin tikintisi başa çatdırılır.

İdris müəllimin Şuşanın «Ərimgəldi» adlanan təbii teatrında «Yaşıl teatr» (pantion) yaratmaq planı vardı. Burada ən görkəmli yerdə Üzeyir Hacıbəyovun heykəli, onun ətrafında isə Şuşadan çıxmış görkəmli ədəbiyyat və incəsənət xadimlərinin büstləri ucaldılmalı idi. Bu pantionun maketinin şəkli 1969-cu ildə «Ədəbiyyat və incəsənət» qəzetində də verilmişdi. 15 ildən sonra Gevorkovun bic və məkrli siyasəti ilə Üzeyir bəyin heykəli Xurşid Banu Natəvanın bağında«gizlədildi».

İdris Məhərrəmovla Azərbaycan SSR Nazirlər Sovetinin sədri Ənvər Əlixanovla Şuşanın inkişafı barəsində danışarkən Şuşa-Stepanakert və Şuşa-Topxana kanat yolunun çəkilişi məsələsinə çatdıqda onlar 1967-ci ildə Stepanakertdəki erməni terrorunu xatırlayıb, «Şuşa – Stepanakert kanat yolunun» çəkilməsi məsələsindn bir azərbaycanlı kimi yan keçməyi məqsədəuyğun saymışdılar. Elə buna görə də ermənilər «Cıdır düzü – Topxana kanat yolu»nun çəkilməsinə həmişə mane oldular…

Bütün şüurlu həyatı boyu xalqı, Vətəni üçün çalışan sadə insan İdris Məhərrəmov 1971-ci il aprelin 22-də qəflətən ürək tutmasından vəfat etmişdi. Onun yarımçıq qalan arzularını həyata keçirmək onun kimi xalqını, millətini sevən və ondan sonra rayona rəhbər vəzifələrə təyin olunanların əksəriyyətinə nəsib oldu… Bu nəsib olanlar sırasında doğma ciyərparası Ramiq həkimin də xüsusi payı vardı. Uzun illər rayonun səhiyyəsinə rəhbərlik etmişdir. Dağlıq Qarabağda və onun ətrafında baş verən hadisələr dövründə azərbaycanlıların yaşadığı kəndlərdə tibbi yardımın təşkili, ağır xəstə və yaralılara şəxsən tibbi xidmət göstərməsi, Şuşanın və Dağlıq Qarabağın çətin günlərində azərbaycanlı əhalinin uzun müddət harayına vertalyotla gedib bir cərrah kimi həyatla ölüm arasında çırpınanların həyatlarını xilas etmişdir. Qarabağ münaqişəsi müharibəyə çevrilən zaman ağ xalatını hərbi komufilyajla dəyişmiş, Müdafiə Nazirliyinin Şuşa hərbi səhra cərrahiyəsi qospitalını təşkil etmişdir. Ramiq

Məhərrəmovun göstərdiyi şücaət, keçirdiyi həyəcan, xalqına, Vətəninə övladlıq borcunu hamıdan fərqli olaraq ləyaqət və dəyanətlə yerinə yetirməsi kökəbağlılığın, əsilli, nəsilli böyük bir ailənin şərəfi, şöhrəti, hörməti, cəmiyyətdəki mövqeyi barədə mənəvi zənginliyinin əzəmətindən insanlıq üçün dəyərli olan müqəddəs hissləri təlqin edir…

Köçkün rayonun baş həkimi Ramiq Məhərrəmovla soyadımız eyni olduğundan bir-birimizi tanıyan gündən yaranan doğma münasibətimiz hər ikimizə «əmioğlu» ifadəsini qürurla deməyi xoş bir duyğuya çevirib. Anası Şərqiyyə xanımın mənə həmişə «Qaynım oğlu!»-deyə otuz ilə yaxın bir müddətdə hər görüşəndə müraciəti, ərklə dediyi sözlər qəlbimin sevincini daha da artırır. Babasının adını daşıyan, həyatda ona bənzəmək istəyən nəvə İdrislə oğlum Namiq arasındakı müqəddəs münasibətlərə ürəkdolusu qibtə edirəm. İstedadlı cərrah, Respublikanın Əməkdar həkimi Ramiq Məhərrəmov və ixtisasca müəllim olan mehriban həyat yoldaşı Ağgül xanım Vətənə, xalqa bəxş etdikləri İdris, Vüqar, Azər, Mətanət, İnci kimi kökəbağlı ziyalı övladları ilə öyünməyə haqlıdırlar…

İdris müəllimin yeganə qızı Ehtiram xanım atasının ixtisasını davam etdirir, tarix-filologiya fakültəsini bitirib, Şuşada «Vaqif poeziya evi»ni təşkil edib. Böyük qızı Qismət Tibb Universitetinin tələbəsidir. Kiçik qızə Səadət dərs əlaçısıdır.



## ŞUŞA
## ONUN İDEALI İDİ…

*Qəşəm - o dağ çayı,o dağ qartalı...*
*Pənahı torpaqdı,məzarı torpaq.*
*Tək bircə misrası qalıb yadımda*
*Sahibsiz torpaqdı,yaralı torpaq!"*
***Məmməd Araz***

Həyatda ideal sandığım, böyük şəxsiyyət, dostluğunun coğrafiyası məhdudiyyət bilməyən, sə"y və bacarını milli adət-ən"ənələrin çiçəklənməsinə sərf edən, ictimai mənafeyi hər şeydən üstün tutan, həyatının mə"nasını yorulmaq bilmədən qurub-yaratmaqda görən təkrarsız insan Qəşəm Aslanovun
ömür yolu onu tanıyan, onunla dostluq, yoldaşlıq edən və bilavasitə bir yerdə çalışanlar üçün bir örnəkdir.

O, Göyçə mahalının Kəsəmən kəndində dünyaya göz açmış, tutduğu böyük vəzifəsinə görə yox, el-oba arasındakı hörmətinə, nüfuzuna görə sevilmiş, "Qəşəm müəllim" kimi tanınmışdır. Doğulduğu mahalda qəzet redaktoru, rayon komsomol komitəsinin birinci katibi, rayon partiya komitəsinin katibi vəzifələrində çalışarkən jurnalist-publisist kimi fəaliyyətindən qalmamış, "Ədəbi Ermənistan" almanaxında şe"rləri dərc olunmuş, "Saymazovun salamı" adlı miniatürlər kitabı (1968) işıq üzü görmüşdür.

Qəşəm müəllimin ictimai xadim kimi fəaliyyətinin bir neçə ili "Azərbaycan gəncləri" qəzeti ilə bağlıdır. Onun təşəbbüsü ilə qəzetin nəzdində tə"sis edilən "Müjdə" ədəbi birliyi çoxsaylı, həm də iste"dadlı gənc şair və yazıçıların yaradıcılıq yolunun ilkin cığırlarının böyük ümmanlara qovuşmasında nəzəri-əməli hazırlıq məktəbi oldu. "Müjdə"nin ədəbi məşğələlərini respublikanın müxtəlif şəhər və rayonlarında keçirmək, yeni ədəbi qüvvələri üzə çıxırmaq, qəzetin "Ədəbiyyat səhifəsi"ndə onların yaradıcılığından

nümunələr vermək ən”ənəyə çevrildi. Gənc yazarlar ilk xeyir-duanı bu geniş qəlbli, böyük zəka sahibi, milli ziyalı, gözəl jurnalist, incə yumorlu satirik şair Qəşəm Eloğludan aldılar...

"Azərbaycan" nəşriyyatı Qəşəm Aslanovun "Məğlub ölüm" adlı kitabını 1997-ci ildə çapdan buraxıb. Burada onun povest, hekayə, miniatür və məqalələri verilib. Şuşa ilə, Qarabağla bağlı düşüncələri "Azərbaycanın zümrüd qaşı"məqaləsində geniş şərh olunub...

Qəşəm müəllim, sözün əsil mə”nasında, yaşatmaq, yaratmaq aşiqi idi. Hələ Basarkeçərdə rayon komsomol komitəsinin birinci katibi işlədiyi vaxda kəndlərin gənclərini abadlıq işlərinə cəlb etməsi, işgüzar tədbirlərin təşkilatçısı olması, kəndimizin klubunda etdiyi maraqlı çıxışları, gənclərin elmə, təhsilə istiqamətləndirilməsi baxımından tövsiyələri uşaqlıq yaddaşımda həkk olunmuşdu. Qoşabulaq camaatının Qəşəm müəllimə xüsusi sevgisinin olduğunun, ona arxalandıqlarının, çətinə düşəndə üstünə xahişə getdiklərinin canlı şahidi kimi mən məclislərdə ağsaqqalların onun ünvanına söylədikləri xoş sözləri həmişə fikrimdə dolandırdığımdan, Şuşa Rayon Partiya Komitəsinin birinci katibi işlədiyi müddətdə vətəndaşların ərizə və şikayətlərinə həssaslıqla yanaşmasına, tikintiyə, abadlığa xüsusi diqqət göstərməsinə adi hal kimi baxırdım. Şəhər sakinləri o zaman MK-ya belə işgüzar, təşkilatçı, tələbkar katib tə'yin edildiyinə görə təşəkkür teleqramları göndərirdilər. Quruculuq və tikinti işləri davam etdirildi. Vilayət rəhbərliyinin xəbəri olmadan gərəkli məsələlərin müstəqil həllinə nail olmaq kimi prinsipial mövqeyi vardı. ”Şuşa şəhərində kurort kompleksini daha da inkişaf etdirmək tədbirləri haqqında” qərarın qəbul olunması təşəbbüsünü respublika rəhbərliyi qarşısında qaldırdı...

Onunla bağlı xatirələrin bir neçəsini yada salmaq yerinə düşər:-

-Yerli radio verilişlərinin təşkilatçı müxbiri kimi mənə bülletenlərdə şəhərin tarixi, görülən işlərlə bağlı xəbərlərin verilməsinin zəruriliyi barədə tövsiyə edərkən telofon zəng çaldı. Dağlıq Qarabağın rəhbərlərindən kimsə bir neçə qonaqla Şuşaya gələcəklərini bildirirdi. ”Qonaqları layiqincə qarşılamaq üçün hazırlıq görülməsinə göstəriş verin!” Cavab olaraq dedi:--Əzizim, Şuşanın özünün o qədər sosial-iqtisadi qayğıları var ki, sadalamaqla qurtaran deyil. İmkan yaradın, işləyək... Qonağın var, çox gözəl... O "İsa bulağı", o qonaqların, o da sən, buyurun, gəlin..., öz işinizdir.

Şuşada yay mövsümündə su problemi xüsusilə narahatlıq törədirdi. Şəhərin aşağı hissəsinə günlərlə su gəlmədiyi halda, ermənilər yaşayan yuxarı məhəllədə sudan gen-bol istifadə olunur, bağ-bostan suvarılır, hətta içməli su kanalizasiyalara axıdılırdı. Məsələni araşdırmağı «Şuşa» qəzetinin əməkdaşı Əli Mahmuda tapşırmışdı. Gənc jurnalist bir neçə gündən sonra qəzetin səhifələrində «Dərə xəlvət…» adlı felyotonla çıxış elədi. Yazı xüsusilə vilayətdə ciddi əks-səda doğurdu. Vilayət partiya komitəsinin katibləri Əlini işdən götürməyi, ciddi cəzalandırmağı tələb etdilər. Dedilər ki, jurnalist erməniləri təhqir edib, onları tülkü adlandırıb. Yaxşı yadımdadı, Qəşəm müəllim Əlini çağırıb dedi ki, günahın odur ki, onları öz adları ilə tanıtmısan. Bu yazıdan bir neçə gün sonra Əlini nəinki işdən çıxardı, qəzetin məsul katibliyini də ona tapşırdı.

Bu məsələdə daha dörd nəfər – rəhmətlik Kamil Fərəcov, İsrafil Əbilov, Sevil Babayeva, Mobil Rüstəmov Əlini müdafiə etdilər.

Mədəniyyət evində deputatlığa namizədlərlə görüş keçirilirdi. Qəşəm müəllimin çıxışı hamı kimi məni də heyrətləndirdi:

-Bunu deməyi özümə borc bilirəm. Vilayətin yüksək vəzifəliləri iş adı ilə Şuşaya “ şiş kababa” gəlirlər. Kimdir bunlar? Samvelovlar, muradovlar, sarkisovlardır. Mən daxili işlər şö'bəsinin rəisi Hacı Dadaşova göstərişlər vermişəm, mənim xəbərim olmadan rayonun ərazisində yoxlama aparan, vəzifəsindən sui-istifadə edən üzdəniraq vilayət rəhbərləri barədə intizam tədbirləri görsün…

Qəşəm müəllim ermənilərin məkrli niyyətlərini hələ Basarkeçər rayonunda rəhbər vəzifələrdə çalışdığı vaxtlardan duymuş, Ermənistanın özündə belə mübarizəyə başlamışdı. O, Şuşaya birinci katibi vəzifəsinə irəli çəkilməsi Dağlıq Qarabağ Muxtar Vilayətinin erməni rəhbərlərini bərk sarsıtmış, elə ilk aylardan bu müdrik, qeyrətli Azərbaycan oğlunu ləkələyib sıradan çıxarmaq arzusu ilə qovrulub yanırdılar. Ermənilər «Şuşa kurort şəhəridir, orada heç bir fərdi tikinti aparmaq olmaz» şüarı ilə əslində Azərbaycanın bu qədim şəhərində azərbaycanlıların artmasına qadağa qoymuşdular. Təyinatla vilayətə göndərilən gənc azərbaycanlı kadrların «ehtiyac yoxdur», -deyə geri qaytarılması da eyni məqsədə xidmət edirdi. Qəşəm müəllim isə bunun əksinə olaraq, respublikanın müxtəlif guşələrindən Şuşaya gəlmiş gəncləri, qədim şəhərin yetirmələrini işlə təmin edir, onlara etimad göstərərək irəli çəkirdi. Yeri gəlmişkən qeyd edim ki, Şuşa şəhərində daimi pasport qeydiyyatına düşmək də müşkül

məsələ idi. Qeyrətli vətən oğlu bu məsələdə də məsuliyyəti öz üzərinə götürərək müvafiq idarə və müəssisələrə lazımi tapşırıq vermişdi. Onun Şuşaya gəlişi respublikanın tanınmış ziyalılarının, yazıçı və alimlərinin də buraya axınını artırmışdı.

Qəşəm Aslanov Şuşada quruculuq işlərinə yeni vüsət vermişdi. Tarixlərin yaddaşı olan hər daşı, hər saxsı parçasını qorumağı tövsiyə edir, abidələrin bərpasını ön plana çəkir, şəhərin yaşıllıqlar diyarına çevrilməsini ümumxalq işinə çevirmişdi. «Şuşa» qəzetində, yerli radio verilişlərində «Hərəyə 5 ağac əkək», «Şuşanı yaşıllıqlar diyarına çevirək», «Abidələrimiz tariximiz, yaddaşımızdır» rubrikaları altında yazıları xüsusi tələbkarlıqla izləyirdi. Tarix muzeyi qısa vaxt ərzində yeni eksponatlarla zənginləşmiş, məhəllə bulaqlarında, Natəvanın bulaq, ev və abidə kompleksində xeyli işlər görülmüşdü.

Şuşada işlədiyi illərdə zəngin tarixi abidələri olan bu şəhərdə bərpa, abadlıq, geniş tikinti-quraşdırma, yaşıllaşdırma, «Xan qızı» su kəmərinin təmiri, yeni su kəmərinin çəkilməsi işlərinə xüsusi qayğı göstərmişdir. O zamanlar Dağlıq Qarabağda yeridilən siyasətin acı nəticələr verəcəyini dolayısı ilə qələmə almış, ürəyindən keçən və narahatçılığına səbəb olan məsələləri yüksək tribunalardan bəyan etmiş, vilayət rəhbərlərinin Şuşaya ögey münasibətini, işlərin gedişinə göstərdikləri maneçiliklərini ciddi tənqid atəşinə tutmuşdu. Şerlərinin birində:

***…Fürsət vermə heç vaxt qurda!***
***Qurda güzəşt eyləyənlər***
***Zülm eyləyər ana yurda!..***

Yerində deyilsə də, ehtiyatsızlıq edildiyindən ana yurdumuza zülm olundu…

Bakı Ali Partiya Məktəbinin dinləyicisi idim. Tez-tez Qəşəm müəllim burada daimi fəaliyyət göstərən kursların dinləyiciləri qarşısında jurnalistika və partiya quruculuğu məsələlərinə dair mühazirələr oxuyurdu. Kursun rəhbəri Qüdrət Muradovla ikinci mərtəbədəki auditoriyaya daxil olanda rastlaşdıq. Hal-əhval tutandan sonra bildirdi ki, zəngdən sonra Tofiq Qasımoviçin kabinetində olacağam. Bu sözlərdən başa düşdüm ki, bacısı oğlu Sərdar Kərimovla görüşmək arzusu var. Biz sonra üçlükdə görüşəndə, yaxşı oxumağımız barədə tövsiyələr verdi, istirahətə gedəcəyini bildirdi. Bu mənim onunla son görüşüm oldu. Qayıtdığını və Respublika kooperatorlarının qurultayınnda iştirak etdiyini «Günün ekranı» xəbərlər proqramında verilən süjetdən bildim. Dumanlı noyabr günlərindən idi. Gecədən bir xeyli keçmiş

edilən vaxtsız telofon zənginə yuxudan ayıldım, Sərdarın « yatmısan, respublika klinik xəstəxanasının yanına gəl, bağrım partlayır, qəza baş verib..»

Vaxtsız faciəli ölüm Qəşəm müəllimi ömrünün 50-ci baharında bizdən ayırdı... O, Qarabağda yaşayan azərbaycanlıların qeydə vaxtında alınmasına maneçiliklərdən, onlara göstərilən laqeyd münasibətdən, azərbaycanlı kadrların incidilməsindən, tarixən albanlara məxsus olan abidələrin ermənilərin adına çıxılmasından ciddi narahatçılıq keçirirdi. Mübarizəsinə isə yuxarıdan özümüzünkülər daha çox maneçilik törədirdilər. Ümid edirdi ki, nə vaxtsa Dağlıq Qarabağda ermənilərin sayı azalacaq, bu ərazi muxtariyyət hüququnu itirəcək, Şuşa respublika tabeliyindəki şəhərlərdən olacaq. Gözləmirdi ki, ermənilər Dağlıq Qarabağı Ermənistana birləşdirmək barədə qərar çıxara bilər, digər əraziləri işğal edər, doğma mahalının əhalisini bir neçə gün ərzində qaçqına çevirərlər. O, bu deyilənləri görsə idi, ürəyi tab gətirməzdi, Üzeyirin, Bülbülün, Natəvanın qürbətdən vətənə gətirilən heykəllərinin incik görkəmindən qəhərlənər, haqq səsini qaldırardı...

*"Qarabağ" qəzeti, 9-15 aprel 1999-cu il.*



## TƏLƏBKAR BƏ TƏVAZÖKAR İNSAN

Xətrini dünyalar qədər istədiyim, adına, ünvanına qəlbimdə böyük sevgilərim olan müqəddəs insan Əhəd Əli oğlu Kərimovun tərcümeyi-halını yazmağa başlamazdan əvvəl, Azərbaycan cəmiyyətində publisist yazıları ilə tanınan Şöhrət Səlimbəylinin 1998-ci ildə işıq üzü görən «Qan çilənən torpaq» adlı kitabında erməni-müsəlman (Türk) müharibəsi zamanı Qarabağın başı müsibətlər çəkmiş kəndilərindən Umudlu barədəki yaddaşlardan qələmə aldığı tarixi həqiqətləri və M. S. Ordubadinin 1911-ci ildə nəşr etdirdiyi «Qanlı illər» kitabından gətirdiyi iqtibası ümumiləşdirilmiş şəkildə verməyi zəruri saydım: «Umudlu kəndi Tərtər çayının sağ sahilində, axarlı-baxarlı görünən dağların sinəsində yerləşir. Ətrafı sıx meşələrdir. Millətimizin gələcəyi üçün, məmləkətimizin dincliyi üçün, Kolanı tayfalarının yaddaşını təzələmək üçün əsrin əvvəlində törədilən Umudlu faciəsini xatırlamaya bilmirəm: ***« -- Ümidli camaatının köçüb getmələri və qətl olmaları. Ümidli camaatı mühafizə qoşunundan naümid olandan sonra, 1905-ci il dekabr ayının 26-da qiymətli əşyalarını arabaya yığıb qaramal və sürülərini götürüb, ailələrinin əlindən yapışıb yola çıxırlar. Ermənilər yaşayan Heyvalı kəndinin yanından keçdikdə Abram bəy Həsən Calalov ( Abram bəy Həsən Calalov 1989-cu ildə DQMV birinci katibi millətçi Poğosyanın babası idi. Red.) bunlara rast gəlib gecə vaxtı onların yol getməsini eyib edib, gecəni Heyvalıda qalıb sübhdə getmələrini təvəqqe etdi. Bədbəxt, sadədil İsmayıl kəndxuda erməninin şeytan dilinə inanıb Heyvalıda qalmağı camaata məsləhət görür və çönüb Heyvalı kəndinin yanında düşür, arabaları və yükləri də düşürürlər. Gecə soyuq olduğundan bir az ataş yığıb qızındıqları vaxt pusquda olan bir dəstə daşnaksütyun vəhşilərinin şeypur sədası eşidilir. Bu şeypur sədası eşidilsə də, İsmayıl kəndxudanın ağlına bir şey gəlmir. Zira, öz etdiyi yaxşılıqlarına xatircəm idi. Bu halda daşnaksütyunlar Ümidli camaatının dörd tərəfini mühasirə edib ataşə tuturlar. Bu halı görən əliboş camaat bir-birinə qarışıb nə edəcəklərini bil-***

***mirlər. Əvvəlcə kişiləri övrətlərindən kənar edib qoyun kimi başlarını kəsir, sonra övrətlərinin bir hissəsini saxlayıb, bir hissəsini də öldürürlər.***

***Bu qarışıqlıqda həmən insanların sallaxanasından ancaq 30 nəfər canını qurtarmışdır ki, bu sözləri nəql eyləyirlər. Ermənilər hamilə övrətlərin xəncər ilə qarnını parçalayanda məsum cocuqların qanlı başları eşiyə çıxırmış. Müsəlmanın xanım övrətləri, qızları erməni vəhşilərinin əlində qalıb o tərəf, bu tərəfə qaçmaqda idilər. Qaçanların dediyinə görə, bir neçə övrəti diri saxlamışlar»…***

Umudlu faciəsi barədə yazılanları oxuyanlar erməni millətçilərinin insanlıqdankənar hərəkətlərinə rəvac verən ictimai mühitin eybəcərliklərinə, yaramazlıqlarına qarşı etiraz səsini ucaltmaqla doğma yurda qayıdışı təmin etsələr də, tarix yenidən umudluları sınağa çəkdi. Düşmən və onun havadarları güclü olduğundan əsrin əvvəlində baş verən hadisələr əsrin sonunda təkrarlandı…

Umudlunun fəxrli , karlı adamları, igidləri, respublika miqyasında böyük nüfuzu olan ziyalıları çoxdur. Onlardan biri də otuz ilə yaxın bir müddətdə tanıdığım, ünsiyyətdə olduğum Əhəd müəllimdir.

***O, 1940-cı ildə anadan olub. Çapar kənd orta məktəbini bitirdikdən sonra üç il kolxozda çalışıb. Bakı Dövlət Universitetinin mexanika-riyaziyyat fakültəsinə qəbul olub, ikinci kursda məzunu olduğu məktəbin Azərbaycan bölməsində əsas fənləri ermənilər tədris etdiyindən məhz buraya müəllim düzəlir. Bir ildən sonra əyaniyə dəyişirilərək əvvəlcə fakültə, sonuncu kursda isə universitet komsomol təşkilatının katibi işləyib. Akademiyanın Mexanika-Riyaziyyat İnstitutuna təyinatla göndərilib, öz istəyi ilə Mərdəkandakı çətin tərbiyə olunan uşaqlar üçün açılmış xüsusi internat məktəbdə bir il tərbiyəçi, üç il yarım direktorun tərbiyə işlər üzrə müavini işləyib. Azərbaycan Pedaqoji İnstitutunun Xankəndində açılan filialında müəllim yeri üçün keçirilən müsabiqədə iştirak edib və 1970-ci ildə institutut komsomol təşkilatının katibi, 1971-ci il noyabrın 10-da DQMV Komsomol Komitəsinin ikinci katibi seçilib. İşgüzarlığı, təşkilatçılıq bacarığı, kütlələrlə işləmək səriştəsi nəzərə alınaraq, 1975-ci ilin iyununda Şuşa RXDS İK-nin sədri və həmin ilin dekabrın 13-də isə Şuşa Rayon Partiya Komitəsinin birinci katibi vəzifələrinə irəli çəkilib.***

Əhəd müəllimin Şuşada işlədiyi illəri onun həyatının quruculuqla, yaradıcılıqla bağlı ən mənalı illəri adlandırıram. O illərdə aparatın məsul işçilərindən biri də mən olmuşam. Püxtələşmiş siyasi rəhbər kimi rayonun sosial-iqtisadi həyatında bütün işlərin yüksək səviyydə təşkilinə olduqca böyük tələbkarlıqla yanaşır, gənc kadrların rəhbər vəzifələrə irəli çəkilməsinə xüsusi qayğı göstərirdi. Bünövrəsi A. Ağakişiyev tərəfindən qoyulan, Q. Aslanov tərəfindən yeni sürət götürən tikinti-quraşdırma işləri Ə, Kərimovun dövründə daha da genişləndirildi. Azərbaycan Kommunist Partiyasına rəhbərlik edən cənab Heydər Əliyevin Şuşanın Ümumittifaq kurort şəhəri kimi şöhrətlənməsi istiqamətində çoxsaylı tədbirlərin həyata keçirilməsi barədəki göstərişlərinə respublikanın rəhbər orqanlarının gündəlik köməkliyi və qayğısı səyəsində şəhər tikinti meydanına çevrilmişdi. 1976-cı ilin oktyabr və noyabr aylarında **« İçəri şəhər, Ordubad və Şuşa şəhərinin qoruq şəhər elan edilməsi haqqında» , «Şuşa şəhərində kurort kompleksini daha da inkişaf etdirmək tədbirləri haqqında»** qəbul edilən bu iki mühüm qərarın yerinə yetirilməsi genişmiqyaslı, kompleks tədbirlərin həyata keçirilməsini tələb edirdi. Odur ki, nazirlik və baş idarələrdən edilən xahiş və tələbə etiraz yox idi deyə, işlər də öz tempində gedirdi.

Yeri gəlmişkən, Şuşa pedaqoji texnikumunun 60 illik yubileyinə geniş hazırlıq görüldüyü bir vaxtda bu texnikumun ləğvi barədə DQ Vilayət Partiya və İcraiyyə Komitələri MK-ya və Respublika Ali və Orta İxtisas Təhsili Nazirliyinə məktub yazıldığı məlum olanda Əhəd müəllim tam qətiyyətliklə məsələnin qoyuluşunun yanlışlığını, Şuşanın ziyalılar şəhəri olduğunu, bu texnikumun məzunu olan onlarla alim , ictimai xadimin adını çəkməklə bu məsələnin siyasi mahiyyət daşıdığını, ideoloji diversiya olduğunu vilayət partiya komitəsinin birinci katibi B. Gevorkova izah və sübut etsə də, göndərilən məktubun geri qaytarılmayacağını söyləmişdi. Ə. Kərimov bildirmişdi ki, vilayət komsomol komitəsinin ikinci katibi işlədiyi dövrdə apardığı təhlildə vilayətin mədəni-maarif işçilərinin 90 faizinin ixtisas təhsili olmadığını, ətraf rayonlarda da bu ixtisaslara ciddi ehtiyacın mövcudluğunu, yalnız Bakıda mədəni-maarif texnikumunun varlığını nəzərə alaraq texnikumun mədəni-maarif məktəbinə çevrilməsini zəruri saysa da, vilayət rəhbərliyinin bu işə mənfi münasibətini görəndən sonra hələ o zaman 26-lar Rayon Partiya Komitəsinin birinci katibi işləyən, tələbəlik illərində

komsomol katibi olarkən yaxından tanıdığı Ali və Orta İxtisas Təhsili Naziri cənab Qurban Əliyevə birbaşa zəng edir. Naziri vəziyyətlə tanış edir və deyir ki, ***«Qurban Həsənoğlu, xahiş edirəm, mənim müraciətimi raykomun birinci katibinin nazirə müraciəti kimi deyil, sıravi kommunistin raykomun birinci katibinə müraciəti kimi qəbul edin…»*** Əhəd müəllim vilayət rəhbərliyinin başı üstündən risk edib Şuşa Rayon Partiya Komitəsinin adından nazirliyə məktub yazır, Q. Əliyev də risk edib humanistlik və vətənpərvərlik göstərərək təklifi qəbul edir, pedaqoji texnikumun mədəni maarif məktəbinə çevrilməsi barədə əmr verir. İndi də həmin məktəb Bakı şəhərinin Yasamal rayonu ərazisində fəaliyyətini davam etdirir.

İkinci dəfə Əhəd müəllim Xankəndində tikilən qatar stansiyasının Şuşa rayonunun Malıbəyli kəndinin əkinə yararlı sahələrində tikintisi aparılarkən yük stansiyasının da bu ərazidə tikintisi vilayət rəhbərliyində razılaşdırılarkən layihənin işlənməsi üçün M.Əzizbəyov adına kolxozun ümumi iclasının və rayon İK-in qərarları tələb olunurdu. Şuşada əkinə yararlı torpaq sahələrinin az olduğundan B. Gevorkova Əhəd müəllim belə bir qərarın verilməyəcəyini bildirəndə onu, rayon XDS İK sədri Fərrux Hüseynovu və kənd təsərrüfatı idarəsinin rəisi mərhum Tahir Rəhimovu vilayət partiya komitəsinə dəvət edirlər. Onlar içəri girəndə B. Gevorkov Ə. Kərimova deyir ki, ***«Sən muxtar vilayətdə muxtariyyət yaratmısan, niyə stansiyanın tikintisini ləngidirsən, torpaq ayrılmasına icazə vermirsən».***

Əhəd müəllimin ***«Dəmir yolu yalnız Şuşa üçün tikilir?»*** sualına B. Gevorkov: ***« Yox, bütün vilayət üçün tikilir»*** cavabını verəndə Əhəd müəllim «qonşu Şuşukənd torpağından Malıbəyliyə ayrılıb verilməsi barədə qərar qəbul olunsun, sahələri əvəzləşdirək» deməsi məsələnin qoyuluşunun yanlış olub–olmadığını araşdırmaq üçün komissiya yaradılması ilə nəticələnir, bundan sonra yük stansiyasını Əsgəranda tikmək qərara alınır…

Respublikada **«Qoruq şəhər»in** əsasnaməsi olmadığından Mədəniyyət Nazirliyinin vəsaiti hesabına gənc mühəndis Tofiq Süleymanov Baltikyanı ölkələrə ezamiyyətə göndərilmiş, onun oradan gətirdiyi əsasnamə milliləşdirilərək «Qoruq şəhərin» əsasnaməsi hazırlanmış, bundan sonra yeni tikintilər qədim Şuşada deyil, şəhərin yuxarı hissəsində aparılırdı. Şəhərin 2000-ci ilədək baş planı hazırlanmışdı. Bir tərəfdə tarixi abidələr bərpa edilir, digər tərəfdə isə yeni yaşayış massivi salınırdı. Şərq musiqi alətləri fabriki, şəhərdə 1176 yerlik , Daşaltı, Zarıslı kəndlərində

320 yerlik məktəb binaları, şəhərdə 280 yerlik uşaq bağçası, Rabitə evi, avtobaza, kolxozlararası tikinti idarəsi üçün bina kompleksi, cörək zavodu, asfalt zavodu, çoxsaylı yaşayış evləri, kənd təsərrüfatı texnikumu üçün tədris korpusu, iki mərtəbəli kitabxana, əmanət kassası üçün bina, hər biri 600 yerlik bir qış və iki yay kinoteatrı binası, toxuculuq sexi üçün bina, sanatoriya korpusu, kəndlərdə və Aşağı Qarabağda yerləşən yataqlarda heyvandarlıq binaları tikilib istifadəyə verilmişdi. Natəvan adına, Gənclik, hərbi vətənpərvərlik və digər parklar salınmış, «Gəncə – Qala qapısı» kompleksi, Natəvan bulağı, «Qala divarları» bərpa olunmuş, şəhərin qazlaşdırılması, yaşıllaşdırılması, işıqlandırılması, küçələrə asfalt örtüyün salınması, Hüsü Hacıyevin büstünün qoyulması, Vaqifin məqbərəsində, 9 mərtəbəli mehmanxanada son tamamlama işləri təmin edilmişdir. SSRİ DTK sədrinin birinci müavini Siviqunun köməkliyi ilə İttifaq fondundan ayrılan paslanmayan borularla sanatoriyada və şəhərdə istifadə üçün Şırlan turş suyu kəməri çəkilmişdir. Şəhərin su təchizatındakı problemlərə əsaslı qaydada son qoymaq üçün artezian quyularının qazdırılması lüzumu barədə akademik Mirəli Qaşqayla aparılan məsləhətdən guya suyun sürətlə axdığından onun dərinlikdə qabağını kəsib saxlamaq qeyri mümkün olduğundan, bu işin fayda verməyəcəyini vurğulandığına görə Nəbilər dərəsindən yeni su kəmərinin çəkilişi, su təmizləmə qurğusunun layihələri hazırlanmışdır.

Bünövrəsi Qəşəm Aslanov tərəfindən qoyulan və hər ilin may ayının sonuncu bazar günündə keçirilən «Mahnı bayramları»nın «Cıdır düzü»ndə keçirilməsi, peşə, sənət və əmək rituallarının qeyd edilməsi ənənəyə çevrilmişdir. Respublikada keçirilən Ukrayna və Özbəkistan mədəniyyət günləri iştirakçılarının, digər çoxsaylı rəsmi qonaqların qədim mədəniyyət mərkəzi Şuşada olması, burada aparılan faydalı işlər barədə respublika rəhbərliyinə çatdırılan informasiyalardan sonra möhtərəm Prezidentimiz cənab H. Ə. Əliyevin MK-nın birinci katibi işləyərkən 1979-cu ilin 12 yanvarında Şuşaya gəlişi tarixi bir hadisəyə çevrilmişdi. Onun bu gəlişi zamanı dediyi ***«Şuşa abidələr şəhəridir. Diyarın zəngin tarixi ilə bağlı olan hər şeyi qayğı ilə qorumaq, qədim tikintiləri bərpa etmək lazımdır»*** ifadəsi dillərdə əzbər olmuşdu.

İdoloji işin təşkili , tikinti-bərpa işlərinə , buraxılış obyektlərinə operativ rəhbərlik sahəsində nəzərdə tutulan canlı və maraqlı tədbirlər Əhəd müəllimin yaradıcı və qurucu bir rəhbər olduğunu

aşkarlayırdı. Onun təşəbbüsü ilə vilayətin və tabeliyində olan rayonların seçkili orqanların tərkibinə və bir çox aparıcı vəzifələrə azərbaycanlı kadrların irəli çəkilməsi barədə qaldırdığı məsələ öz müsbət həllini tapmışdı.

Ə. Kərimov Şuşanın inkişafı üçün yorulmadan çalışırdı, işçilərin də gecəsi-gündüzü yox idi. Vaqif poeziya günlərini, Üzeyir musiqi bayramlarının keçirilməsi ən böyük arzularından idi. Şuşadan olan ədəbiyyat, incəsənət xadimlərinin abidəsi qoyulmaqla «Pantionun» tikintisi məsələsini qaldırmışdı.

Rayonda sosial-iqtisadi vəzifələrin yerinə yetirilməsinə yaxından dəstək verən rəhbər kadrlardan F. Hüseynov, K. Fərəcov, M. Məmmədov, Ə. Məhərrəmov, F. Sadıqov, F. Salahov, Ş. Mədətov, Ə.Əmirov, V. Hüseynov, İ. Fətəliyev, A. Hüseynv, Q. Məmmədov, T.Rəhimov, O. Rəhimov, B. Xəlilov, K. Bayramov, Ş. Hidayev, M Əliyev, İ. Muxtarov, X Aslanov, C. Cəfərov, Y. Bağırov, M. Məmmədov, V.Kazımov, R. Məhərrəmov, M. Ağamirov, B. Məhərov, T.Əliyev, N. Həsənov, K. Sadıqov, A.Babışov, S. Babayeva, Z. Əsədova, R. Tağıyeva, L. Hacıyeva, K. Hüseynova, F. Kazımova, M. Məmmədova və başqalarının yorulmaz fəaliyyətini Əhəd müəllim o zamanlar da, indi də xoş məramla xatırlayır.

1979-80-ci illərdə Azərbaycanda kürd məsələsi qaldırılmışdı. Laçının Qarakeşiş kəndindən bir dəstə kürd Moskvada Mərkəzi Komitə üzvləri ilə görüşdən geri qayıdandan sonra onlar bölgədə yaşayan kürdləri milli ədavət toxumu səpmək üçün həmrəyliyə təhrik edirdilər. Belə bir vaxtda MK-nın birinci katibi cənab H. Əliyevin qəbuluna Əhəd müəllimin çağırılması gözlənilməz hal idi. Çünki Cənab H. Əliyevin **«Sən beynəlmiləl rayonda işləmisən, adamlarla işləməyi bacarırsan. Laçında kürd problemi yaranıb. Məsləhət bilirəm ki, səni ora birinci katib göndərək»** deməsi onu bir anlığa düşündürdü. Şuşada hələ ona ciddi ehtiyac vardı. Burada başladığı işləri axıra çatdırmağı vacib sayırdı. Lakin Laçındakı vəziyyətin ciddi olduğunu, erməni seperatçılarının təsiri ilə qaldırılan millətçi məkrli siyasətin həyata keçirilməsinin yol verilməzliyini nəzərə alaraq razı olduğunu bildirdi. Böyük bir rayona göndərilməsi, orada qaldırılan problemli məsələnin siyasisizləşdirilməsi üçün lazımi təşkilatçılıq işinin aparılması gərgin zəhmət tələb edirdi. Ə. Kərimov 1980-ci ilin 4 yanvarında artıq Laçının birinci katibi seçilmişdi. O günləri belə xatırlayır: «Problemi araşdırarkən müəyyən etdim ki, məsələnin kökündə erməni millətçilərinin separatçılıq niyyətləri

durur. Sero Xanzadyan, Silva Kaputikyan, V. Petrosyan, Mkrtçyan və s. məkrli siyasətlərini həyata keçirmək üçün bu problemdən alət kimi istifadə etmək istəyirlər. Bu barədə mən MK-ya məlumat verdim. Ermənistandan gələn bu və ya başqa dalğaların Dağlıq Qarabağa keçməməsi üçün Laçın, Kəlbəcər, Zəngilan və Qubadlı rayonlarını əhatə edən Dövlət Təhlükəsizlik Komitəsinin zona bölməsinin yaradılmasının vacibliyini bildirdim. H. Ə. Əliyev cənabları məsələnin araşdırılıb, tədbir görülməsi üçün göstəriş verdi. Əvvəlcə kürdlər yaşayan kəndləri müəyyənləşdirdim. Rayonun 120 kəndindən 9-da (Qarakeşiş, Ağbulaq, Katos, Şeylanlı, Çıraqlı, Bozlu, Qalaça, Kamallı, Zerti) kürdlər, 111 kəndində isə azəri türkləri yaşayırdı… Qarakeşiş kəndinin kürdləri ilə görüşdüm, Moskvaya gedənlərdən məqsədlərini soruşanda, «kürd ola-ola pasportlarına azərbaycanlı yazdıqlarına görə şikayət etdiklərini bildirdilər..» Çox səhv hal olduğunu dedim və dərhal pasport–masa rəisini raykoma dəvət edib, təcili bunların pasportunu dəyişdirib kürd yazması göstərişini verəndə, bu qətiyyətli hərəkət kürdlərin planlarını alt-üst etdi. Kəndin sayılan ağsaqqalları ilə aparılan söhbətlərdən məlum oldu ki, özlərini ora-bura vuranları kürd məsələsi yox, vəzifə düşündürür. Ali Sovetə keçirilən seçkilərdə üç deputatdan biri qarakeşişli kürd çoban Mirzə Cabbarov seçildi. Müəyyən vəzifələrə kürdlərdən irəli çəkildi. Kürd-azərbaycanlı məsələsi çox incəliklə həll olundu. Laçından ayrılarkən pasportlarına kürd yazdıran on dörd nəfər yanıma gəlib mənimlə mehriban, qardaşcasına görüşdülər. Səhv etdiklərini, ermənilərin fitnə-fəsadına düşdüklərini dedilər. O vaxtlar ermənilər köhnə, qədimi əşyalar almaq adı ilə Laçının kəndlərinə doluşurdular. Bu ərazidə baş verən olaylar barəsində lazımi orqanlara məlumatlar çatdırılırdı. Lakin respublika DTK-nin o vaxtkı sədri Krasilnikov bu məsələnin həllinə biganəlik göstərirdi. Görünür, məhz bu və başqa səbəblərə görə də o, vəzifəsindən uzaqlaşdırıldı. Cənab Z. M. Yusifzadə həmin vəzifəyə təyin edildikdən sonra bu məsələyə MK-nın tapşırığı ilə baxıldı və müsbət həll olundu. 1980-ci ilin sonuna yaxın ermənilərin ayağı rayon ərazisindən birdəfəlik kəsildi. Rayonun sosial-iqtisadi sahədəki problemlərinə də diqqətlə yanaşıldı, Laçından Ali Sovetə deputat seçilmiş mərhum R. Xələfovun köməkliyi ilə buranın ən ucqar kəndlərinə yol çəkildi, avtobus marşrutları açıldı. Kənd təsərrüfatı sahəsində xeyli irəliləyiş yaradıldı, heyvandarlığın inkişafının perspektiv

planı hazırlandı, hami rayon kimi Bakının Nəsimi rayonu ilə əlaqələr möhkəmləndirildi… »

Əhəd Kərimovun Laçından Ucara dəyişdirilməsi gözlənilməz idi. Özü söylədiyi kimi:

***-- 1981-ci ilin oktayabrında Bakı Ali Partiya Məktəbində kursda olarkən MK-ya dəvət edildim. Aparılan yoxlamadan Ucar RPK-nın fəaliyyətində ciddi nöqsanlar müəyyən edildiyi, məsələnin büronun müzakirəsinə çıxarıldığını və mənim birinci katib vəzifəsinə tövsiyə olunduğumu bildirdilər. MK-nın birinci katibi cənab H. Ə. Əliyev qəbulunda mənə rayonda mövcud olan və yol verilən nöqsanlardan ətraflı danışdı: « Biz Ucardan 15 min ton pambıq gözləmirik. Orada adamlarla işləmək lazımdır. Sən isə bunu bacarırsan», -dedi. Laçındakı vəziyyət barədə məlumat verib, orada qalmağımın xeyirli olduğunu dedim, lakin fikir qəti idi. Mənim məsələnin müzakirəsində iştirak etməyimin zəruriliyini bildirdi. Büroda birinci və üçüncü katibi işdən azad etdilər… Rayonda keçirilən təşkilat plenumunda rayon partiya və icraiyyə komitələrinin aparıcı rəhbərləri vəzifəsindən azad edildilər. Belə gərgin bir şəraitdə həm adamlarla işləmək, həm də rayonun kənd təsərrüfatını inkişaf etdirmək lazım idi. Mərkəzin pambıqçılığın əvəzinə narçılığın inkişaf etdirilməsi barədəki təklifinin yanlış olduğunu, baramaçılığın, camışçılığın inkişafına, cins malqaranın gətirilməsinə daha çox diqqət yetirməyin məqsədəuyğunluğunu elmi əsaslarla sübuta yetirdim. Rayonda sosial-mədəni-maarif obyektlərin tikintisi, təmiri və yenidənqurulması sürətləndirildi. Kəndlərin əksəriyyətində yeni məktəb binalarının tikintisinə başlandı və sonralar istifadəyə verildi. 1985-ci ildə rayonun tarixində ilk dəfə 14 min ton pambıq satıldı və ucarlılar respublikada birinci olaraq raport imzaladılar…***

***1985-ci ilin noyabr ayında Ucar rayon partiya təşkilatının konfransı keçirilməliydi. Konfrans ərəfəsində MK-dan bildirdilər ki, konfransdan sonra Qazax RPK-nin birinci katibi seçiləcəyim nəzərdə tutulur. Əvvəlcə MK-da məsul işlə təmin edilməyimi, dekabrın 14-dək gözləməyimi bildirdilər. Qazax rayonu Zaqafqaziyanın üç respublikasının kəsişdiyi yerdə yerləşdiyini vurğulayan MK-nın birinci katibi mərhum K. M. Bağırov qəbulunda bunu əsas götürərək: « Orada bizə ziyalı katib lazımdır». Bu ifadəni ilk dəfə mərhum Q. N. Aslanov***

*mənim barəmdə söz düşəndə MK-nın sahə katiblərindən birinə demişdi.*

*İttifaq prokurorluğu və daxili işlər nazirliyi həmin vaxtlarda Bərdə rayonunda yoxlamalar aparırdı. Vəziyyət o qədər də ürəkaçan deyildi. Moskvanın təhriki ilə raykomun birinci katibi işdən getməli idi. Dekabrın 12-də yenidən söhbətə dəvət olundum, Qazax rayonuna deyil, Bərdəyə göndəriləcəyim barədə qərarlaşdırıldığı bildiriləndə etirazımı gizlətmədim: « Öz camaatındı, gedib yola vermək lazımdı» dedilər. İki gün sonra konfrans keçirildi və birinci katib seçildim. Rayonda vəziyyət çox ağır idi. Pambıq məsələsi ilə əlaqədar yoxlamalar aparılır, kolxoz rəhbərləri həbs olunurdu. Konfrans ərəfəsində «Sosializm» kolxozunun sədri isə rüşvət alma üstündə respublika təşkilatları tərəfindən həbs olunmuşdu. Adamlar qorxu və təlaş içərisində idilər. Rayonda istintaqa respublika prokurorluğunun əməkdaşı Valter Xondikaryan rəhbərlik edirdi. Hər gün istintaqa ifadə vermək üçün kəndlərdən rayon mərkəzinə yüzlərlə adam gətirilirdi.*

*Xondikaryanın rayondan uzaqlaşdırılması və adamların öz kəndlərində dindirilməsi məsələsi respublika prokurorluğu ilə həll edildi.*

*Pambığın qəbul məntəqələrindən zavoda təhvil verilməsinə nəzarət etmək üçün SSRİ Prokurorluğundan Demidenko və Şirakov Moskva və Özbəkistandan mütəxəssislər cəlb etməklə rayona gəlmişdilər. Mən Demidenko ilə söhbət edərkən bildirdi ki, mərkəzin tapşırığı belədir. Ona respublika və Azərbaycan xalqının keçmişi, adət-ənənəsi, yetişdirdiyi tarixi şəxsiyyətləri, ədəbiyyat, incəsənət korifeyləri barədə xeyli məlumat verdim və inandırdım ki, xalqımız barədə onda yaradılan fikir yanlışdır.*

*Uzun illər kənd təsərrüfatına rəhbərlik edən, təcrübəli, tələbkar, təşkilatçı, yorulmaq nədir bilməyən RASB Sədri mərhum Əli Ələkbərovun bilavasitə gərgin və səmərəli fəaliyyəti sayəsində rayon zəhmətkeşləri əməli işləri ilə Moskvaya sübut etdilər ki, Bərdə İttifaqda 100 ton pambıq istehsal edən yeganə rayon adına layiqdir və bu titulu halallıqla qazanmışdılar. 103 min ton pambıq, 384 ton barama, 12 min ton süd, 4 min ton ət, 14 min ton taxıl istehsal edib dövlətə sataraq qəsdən yaxılan qara ləkəni rayonun üzərlərindən götürdülər…*

Bərdədə təkcə kənd təsərrüfatı məhsullarının istehsalı və tədarükünü daha da artırmaq deyil, tikinti-quraşdırma, abadlıq işlərinin genişləndirilməsi, kollegiallıq, mehribançılıq, qayğı məsuliyyət hissinin yüksəldilməsi ciddi nəzarətə götürüldü. Çoxsaylı mədəni-məişət ocaqları, məktəblər, uşaq bağçaları, poliklinika , yaşayış binaları və digər sosial təyinatlı obyektlərin tikintisinə başlandı. Hər biri 624 yerlik səkkiz kənddə orta məktəb binası tikildi, bütün kənd yollarına, şəhərin əksər küçələrinə asfalt örtük salındı.

Dağlıq Qarabağda və onun ətrafında baş verən hadisələr dövründə Bərdə qaçqınların müvəqqəti məskunlaşdığı və gərginlik daha çox hiss olunan rayonlardan biri idi. Erməni seperatçılarının məkrli siyasəti nəticəsində öz doğma yurdlarından qovulmuş 3000 nəfər ermənistan qaçqınının yerləşdirilməsi, onlara lazımi qayğı göstərilməsi, Dağlıq Qarabağın mühasirədə qalan azərbaycanlı kəndlərinin əhalisinə maddi və mənəvi yardım etmək, ərzaq, maye qaz və yanacaq göndərmək Əhəd müəllimin gündəlik fəaliyyətinə, işinə çevrilmişdi. O, bütün varlığı ilə çalışırdı ki, Qarabağda 1905-07-ci il hadisələri təkrarlanmasın. Qarabağdan və Şuşadan olan ziyalıların iki dəfə Moskvaya göndərilməsi üçün vəsait təşkil etdirmiş, onların istiqamətləndirilməsinə yardımçı olmuşdu.

Ə. Kərimov dəfələrlə qəsəbə, şəhər, rayon, vilayət və respublika Sovetlərinə deputat seçilmiş, 1988-90-cı illərdə Azərbaycan Ali Soveti sədrinin birinci müavini olmuş, həmin dövrdə Ali Sovetin gərgin və amansız keçən iclaslarına sədrlik etmişdi. Əhəd müəllimin bu fəaliyyəti DQ hadisələrinin sürətlənməsinə maneçilik törədəcəyini proqnozlaşdıranlar onun vəzifədən uzaqlaşdırılmasına nail olmağa çalışırdılar. Onun atdığı addımlar diqqətdən yayınmırdı. Tez-tez MK-dan «tapşırıqlar» alırdı. Nəhayət, 1990-cı ilin yanvarında Qarabağdan uzaqlaşdırılır, fevral ayında MK-da inspektor vəzifəsinə təyin olunur. 1991-ci ilin martında isə Azərbaycan Həmkarlar İttifaqı Şurası təşkilat şöbəsinin müdiri-müşavir göndərilir. Həmin vaxtlarda Əhəd müəllim Naxçıvanda Ali Məclisin sədri Heydər Əliyevlə görüşür, burada səngiməyən gərginliyin aradan qaldırılmasında sağlam qüvvələrlə birgə iş apararaq, sabitlik yaradılır. Respublikada vəziyyətin normallaşdırılması sahəsində ardıcıl iş aparan, zəngin idarəçilik təcrübəsi olan, adamların bütün təbəqələri ilə təmasda olmağı bacaran, Dağlıq Qarabağın bütün ərazisinə və əhalisinə

yaxından bələd olan ictimai-siyasi xadim Əhəd Kərimov 1994-cü ilin iyununda həmkarlardan da getməli oldu.

Çox təəssüf ki, 1988-ci ildə Qarabağ hadisələri ermənilər tərəfindən qaldırılanda yaradılan xüsusi idarəetmə və təşkilat komitələrinin tərkibinə respublika rəhbərləri milli məsələni Əhəd müəllimin daha yaxşı bildiyini belə nəzərə almadılar. Erməni xarakterindən, erməni psixologiyasından xəbəri olmayanlara, məsələnin çözülməsində siyasi cəhətdən uzağı görə bilməyənlərə missionerlik tapşırıldı.

Əhəd Əli Kərimov xalqını ürəkdən sevən insan, nadir şəxsiyyətlərdəndir. Son dərəcə yüksək mənəvi dəyərləri yaşadan, adamları haralı olmasına görə yox, qabiliyyətinə, işinə, sadəliyinə, əməli fəaliyyətinə, cəmiyyətdəki müsbət roluna, Vətənə, xalqa sədaqətinə görə qiymətləndirən bir müdrik rəhbərdir. O, bütöv Azərbaycanı təmsil edən ictimai-siyasi xadimdir, Heydər Əliyev məktəbinin ən layiqli yetirmələrindəndir. Böyük bir nəslin fəxri,, ağsaqqalı, yol göstərənidir. Onun zəngin təcrübəsindən istifadə etmək indiki şəraitdə daha çox gərəklidir.

Xalqımızın nümunəvi ailələrindən olan Kərimovların Kərim, Ənvər, Əkbər, Maqsud, Azər, Hikmət kimi ziyalı oğulları doğma Azərbaycanın müstəqilliyi uğrundakı şanlı mübarizənin ən layiqli iştirakçılarıdır. Bu ailənin üzvləri Azərbaycan oğullarının yumruq kimi birləşərək, silaha sarınıb, erməni işğalında olan Zəngəzuru, Vedibasarı, Qarabağı, Göyçəni azad edəcəyi günün çox yaxında olduğuna, həmin gün Azərbaycanın həqiqi Azadlıq günü kimi bayram edəcəyinə varlıqları qədər əmindirlər…

# VƏZİFƏSİNDƏN ERMƏNİLƏR UZAQLAŞDIRTDILAR



Dağlıq Qarabağda fəaliyyət göstərən rəhbər kadrlardan biri də Niyaz müəllim idi. O, 1941-ci ildə Füzuli rayonunun Üçbulaq kəndində anadan olub. Orta təhsilini doğma kəndində, ali təhsilini Gəncədə alıb. İxtisasca baytar həkimdir. Təyinatla Şuşaya göndərilib. Əmək fəaliyyətinə Malıbəyli kəndindən başlasa da, təşkilatçılığı nəzərə alınaraq komsomal 1-1978-ci illərdə Şuşa rayon komsomol komitəsində şöbə müdiri, Şuşa rayon partiya komitəsində, vilayət partiya komitəsində təlimatçı, 1978-1980-ci illərdə Ağdərə Rayon Partiya Komitəsinin ikinci katibi, 1980- 1988-ci illərdə Şuşa Rayon Partiya Komitəsinin birinci katibi vəzifələrində işləyib. 1985-ci ildə Bakı Ali Partiya Məktəbini fərqlənmə diplomu ilə bitirib. Bütün vəzifələrdə prinsipial, tələbkar , heç kimə güzəştə getməyən, obyektiv bir rəhbər işçi kimi özünü tanıdıb.

Şuşada başlanılan quruculuq işlərini yüksək tələbkarlıqla davam etdirib, əhalinin mənzilə olan ehtiyacını ödəmək məqsədilə çoxsaylı yaşayış evlərinin tikilməsini, Kirs dağından saniyədə 400 litr su verən yeni su kəmərinin iməcilik yolu ilə çəkilməsini, yeni ATS-in quraşdırılmasını, Ryazan Kondensatorlar Zavodunun Şuşa filialının yaradılmasını, BRZ İB-nin Şuşa filialının genişləndirilməsini və sair işlərin görülməsini çox ləyaqətlə davam etdirib.

Şuşada birinci katib işlədiyi dövrdə Azərbaycan KP MK-nın birinci katibi cənab H. Əliyevin xüsusi tapşırığı ilə Dağlıq Qarabağda, o cümlədən Şuşa rayonunda azərbaycanlıların sürətlə artmasını əsas vəzifə kimi götürmüş və bu barədə vaxtaşırı

Mərkəzi Komitə qarşısında hesabatlar vermişdir. Bu zaman çoxsaylı tarixi abidələrin bərpası və istifadəyə verilməsi də onun diqqət mərkəzində olmuşdur.

O dövrdə cənab H. Əliyev 2 dəfə : 1982-ci ilin yanvarında və 1983-cü ilin yayında Şuşaya gəlmiş, özü ilə bərabər respublikanın 300-dən çox tanınmış şəxsiyyətləri ilə birgə tikinti və bərpası başa çatdırılmış çoxsaylı abidələrin açılışını etmişdir. M.P. Vaqifin əzəmətli məqbərəsinin açılışı isə respublika miqyaslı çox böyük bir tədbirə çevrilmişdir. H. Əliyev cənablarının Şuşaya hər gəlişində əhalinin artımı, sağlamlığı, milli münasibətlər və bu kimi sosial-iqtisadi göstəriciləri dərindən təhlil etmiş və aparılan işlərdən razı qaldığını bildirmişdir. Bu dövrdə çoxsaylı yaşayış evləri, yeni sanatoriya korpusları, xidmət obyektləri inşa olunmuş, xüsusilə qeyd etmək lazımdır ki, qədim abidələrin bərpasından sonra onlarda 6 muzey, poeziya evi, yaşıl aptek, şəkil qalareyası, müalicə hamamı və bu kimi yeni mədəni-məişət obyektləri təşkil olunmuşdur.

N. Ə. Hacıyev DQ Vilayət Partiya Komitəsi bürosunun tərkibində olduğu üçün 1986-87-ci illərdə erməni seperatçılarına qarşı ilk müqavimət göstərənlərdən biri kimi tanınmışdur. Bu illərdə mitinqlər olmasa da, ermənilər tərəfindən Sov. İKP MK-ya ayrı-ayrı məktublar göndərilirdi. Onlar baxılmaq üçün yenidən MK-ya və vilayət partiya komitəsinə qaytarılırdı. MK –da bu seperatçılar barəsində kəskin ölçü götürməyə rəhbərlik, şəxsən K. M. Bağırov icazə vermirdi ki, biz Qorbaçov «demokratiyasını» boğa bilmərik. Şuşa rayonundan nəinki belə məktublar yazılmırdı, hətta dəfələrlə Şuşadakı ermənilərin seperatçı ermənilərə ekstremizmidən əl çəkməyə dair müraciətləri qəzetlərdə dərc olunurdu.

Cəzasız qalan cinayətkarların fərdi yazıları kollektiv məktublara çevrilməyə başladı, bu işə rəhbərlik edən «Krunk» təşkilatı açıq fəaliyyətə keçərək 1988-ci ilin 13 fevralında ilk kütləvi mitinq təşkil etdi. Mitinqlər sonrakı 5 gün ərzində getdikcə daha da genişlənməyə başladı. Fevralın 18-də MK –nın

ikinci katibi V. N. Konavalov Xankəndinə (Stepanakertə) gəldi. Onun keçirdiyi məxfi iclasda sıxış edən N. Hacıyev bildirdi ki, «Krunk»un əsl rəhbərlərindən bir çoxu büro üzvü kimi burada əyləşiblər, ona rəhbərlik edənlərin sayı isə on bir nəfərdir».

Niyaz müəllimin bu çıxışını Azərbaycan DTK-nin rəhbərləri də təsdiq etdilər. Konavalov tezliklə onları həbs etdirmək üçün həmin siyahını aldı. Ertəsi gün mitinqlər dayandırıldı, VPK-nın erməni üzvləri kollektiv surətdə vəziyyəti düzəltmək üçün Konavalovdan vaxt istədilər. Sanki hər şey qurtarmışdı. Lakin tezliklə Moskvadan və Bakıdan göstəriş gəldi ki, «demokratiya» şəraitində heç kəs həbs olunmasın. Bundan sonra mitinqçilər yenidən meydana axışdılar… 22 fevral 1988-ci il tarixdə Sov. İKP MK Siyasi Bürosunun üzvlərindən Razumovskiy və Demiçev Azərbaycan KP MK –nın büro üzvləri ilə birlikdə Xankəndinə gəldilər, ertəsi gün VPK birinci katibi B. Kevorkovun yerinə ermənilərin təklifi ilə H.. Poğosyanı seçdilər. Büroda çıxış edən N. Hacıyev Poğosyanı mitinqlərin təşkilatçısı, dövlətin bir milyonluq pulunu mənimsəməsi və sair faktları ilə ifşa etsə də, Razumovski ona «sənin yalnız bir səsin var» deyə səs çoxluğu ilə Poqosyanı birinci katib seçmişdi... Bunlar təsadüfi deyildi. Ermənilər arasında Poqosyan «Qarabağ inqilabının Lenini» adlanırdı, bu «Lenin» isə birbaşa Moskvadan idarə olunurdu.

Poqosyanla Niyaz Hacıyev arasında ciddi ixtilaf yaranmışdı. Hətta bir dəfə onlar əlbəyaxa olarkən vilayətin ikinci katibi V.Boqoslovski mane olmuşdur. VPK bürolarına N. Hacıyevi dəvət etməsələr də, o öz təşəbbüsü ilə iclaslara gedirdi. Çünki təkcə səs çoxluğu deyil, qəbul edilən qərarlarda azərbaycanlıların fikrini də Moskva əsas saydığından ermənilərin keçirdiyi bütün mitinq, plenum və sessiyalarda Niyaz müəllim həm özünün, həm də digər şuşalı fəalların çıxışlarının kəskin olmasına xüsusi diqqət yetirirdi. Şuşa əhalisinə və onun bir çox fəallarına arxalanaraq məqsədyönlü iş apara bilirdi. Topxana meşəsində ağacları kəsib tikinti aparıldığı zaman dərhal Şuşada kilsənin qarşısını kəsən

çoxmərtəbəli binanın özülü qoyuldu. Amerika prezidentinin SSRİ-yə gəlməsi münasibətilə özlərini məzlum hala salıb Ermənistana kimi piyada getmək istəyən yüz minlərlə erməninin yolunun iri daşlarla kəsilməsini, onların qorxudulub geri qaytarılmasını, Stepanakertdə işləyən 40 nəfər azərbaycanlı işdən çıxarılarkən Şuşada yaşayan 2 mindən çox ermənin Stepanakertə qovulmasını və işdən azad edilməsini fəalların qüvvəsi ilə həyata keçirirdi. Ermənilərin hər hansı bir hərəkəti cavabsız qalmırdı… Ermənistandan gələn 6 mindən çox azərbaycanlı qaçqının Stepanakertin yaxınlığında məskunlaşdırılması üçün həyətyanı sahə ayrılmış və dərhal da evlərin tikintisinə başlanılmışdır. Bu tədbirin əsas məqsədi isə erməniləri Dağlıq Qarabağdan çıxarmaq idi. Bu hərəkətə görə Niyaz müəllimin məsələsi müzakirəyə çıxarılarkən Moskvanın nümayəndəsi A.İ. Volski ilə aralarında möhkəm mübahisə baş vermişdir. O, Volskiyə demişdir ki, « Siz Azərbaycana tabe olmursunuz, mən də Sizə tabe olmuram…» .

N. Hacıyevin dostluq etdiyi DQMV Fövqəladə Vəziyyət Rayonunun Hərbi komendantı general V. N. Safonov və Şuşa DİŞ-in rəisi mərhum Ə. Q. Tağıyevlə birgə (onların hər ikisinin aradan götürülməsi üçün ermənilər tərəfindən külli miqdarında vəsait də ayrlmışdı) Şuşa rayonunun ərazisindən keçən yollarda Ermənistan vətəndaşlarını yoxlayan postlar yaratmış, bu vasitə ilə də rəhbərlik etdiyi müddətdə Ermənistandan silah gətirilməsinə imkan verməmişdi. O, Vaqif Hüseynovun təklifi ilə 1988-ci ilin iyununda vəziyyətdən çıxış yolu kimi bir neçə deputatın imzasını toplayaraq, ilk dəfə rəsmi olaraq DQMV-nin ləğv edilməsi məsələsini Azərbaycan SSR Ali Soveti qarşısında qaldırmış və buna görə də Stepanakertdə keçirilən növbəti iclasda olduğu zaman xidməti maşınını əzmiş, sürücüsünü isə möhkəm döymüşdülər...

. Niyaz müəllim DQ-ın rəhbərlərinin iştirakı ilə Mərkəzi Komitədə keçirilən iclasda respublikada yenicə fəaliyyətə başlayan Ə. Vəzirovun problemlərin həlli baxımından etdiyi

söhbətin çox maraqlı epizodlarını Şuşaya qayıdanda rayon fəallarına məlumat üçün bildirəndə zaldakıların keçirdiyi təşvişi sağ qalanlar indi də yaxşı xatırlayırlar.

***«Ə. Vəzirov: - Vilayətin və onun rayonlarının birinci katiblərinə müraciətlə bildirdi ki, Sizin nə tələbləriniz varsa, hamısını yerinə yetirəcəyəm, bircə şeydən başqa: tərkibdən çıxmaq məsələsi olmasın! Pul istəyirsiniz, nə istəyirsiniz… , gedib yerlərdə də izahat işi aparırsınız, mitinqləri dayandırırsınız. Sərbəst təklifinizi deyin».***

***Çıxışlar zamanı Stepanakertin katibi Zaven Movsesyan Şuşa milisinin şlaqbaum qoyduğunu, Dağlıq Qarabağ ermənilərinin Yerevana gediş-gəlişinə və Ermənistanla müştərək müəssisələr yaratmaq istəklərinə imkan verilmədiyini, ciddi yoxlamalar aparıldığını çox narazılıqla bildirdi. Əsgəranın katibi Qriqoryan ağır işlərini görmək üçün Yapon traktorlarının ayrılmasını xahiş etdi. Vəzirov o saat «Baş üstə » deyib, tez dəstəyi qaldırıb Qosplana zəng vurdu və dedi ki, «Sabahdan Ermənistanla müştərək müəssisələr yaradılmasına heç bir maneçilik olmasın!» Daxili işlər nazirinə zəng vurub dedi ki, «Sən orda Ələmdardı, bilmirəm kimdir, ona tapşır ki, ordan şlaqbaumu götürsün. Əgər orda bir erməni yoxlansa, ondan sonra vay halınıza». Zəng vurdu Qaz Sənayesi nazirinə, tapşırıq verdi ki, «sabahdan 4 ədəd əvəzsiz olaraq iri traktor verərsiniz Əsgəran rayonuna. Lazım gələrsə pulunu mən respublika büdcəsindən ödəyəcəyəm».***

***Hadrutun katibi vilayət mərkəzinə gedəndə guya Füzulidə, Ağdamda azərbaycanlıların erməniləri daşa basdıqlarını bəhanə edərək, meşənin içərisindəki piyada dağ yolunu genişləndirib kəsə Hadrut - Stepanakert yolu açılmasına icazə verilməsini xahiş etdi. Ə.Vəzirov o saat təbiəti mühafizə komitəsinə, meşə təsərrüfatı idarəsinə tapşırdı ki, « … heç bir müqavimət olmasın, sabahdan meşəni doğrayacaqlar, ordan yol çəkəcəklər. .. ora köməklik edin».***

Bu hiyləgər tələblərin ödənilməsi üçün verdiyi göstərişlər N. Hacıyevi narahat etdiyindən o, Ə. Vəzirova bildirir ki, « ***Yoldaş Vəzirov, əgər Siz dağlıq Qarabağda baş verən hadisələrə son qoymaq istəyirsinizsə, bunların dediklərinin hamısını kələk hesab edin, yalan hesab edin, böhtan hesab edin».***

Bu sözlərdən sonra vilayətin katibi Poğosyanla Niyaz müəllim arasında ciddi mübahisə başlayır, Vəzirov hər ikisini kabinetdən çıxarır və təkrar Niyaz müəllimi söhbətə dəvət edir: ***« Ə, sluşi, sən kimsən? MK katibi mənəm, sən burda iş aparırsan?.. Ə, sənə nə var». Niyaz müəllim deyir ki, «a kişi, bunlar sənə kələk gəlirlər. Bunlar texnikanı da alacaqlar, meşəni də qıracaqlar, hər cinayəti də törədəcəklər, mitinqlər də davam edəcək. Necə yəni sənə nə var? Bu hadisələrin içində deyiləm? Qarabağlı deyiləmmi, bu ölkənin vətəndaşı deyiləmmi? İtirilənlər mənimki deyilmi?.."***

Ə. Vəzirovun ermənlərə etdiyi güzəştlər başımıza çox baha oturdu. Nəticədə traktorlar da ayrıldı, meşə də qırıldı, yol da çəkildi, İrəvandan külli miqdarda silah, hərbi sürsat da gətirildi, həmin traktorlardan tank kimi bizə qarşı istifadə də edildi…. Bir-birinin ardınca uğursuzluqlar baş verdi.

Erməni pisixologiyasına dərindən bələd olduğundan DQ hadisələri başlayanda vilayətdə gedən prosesləri istənilən səviyyədə ayırd edə bildiyinə, daşnaqlar tərəfindən haqsız , qeyri-qanuni tələblərin irəli sürülməsinə etiraz səsini qaldırdığına, vilayət rəhbərliyinə tabe olmadığına və qaçqınların məskunlaşdırılmasını təmin etdiyinə görə Volskinin və Poğosyanın xahişləri ilə, Ə. Vəzirovun təşəbbüsü ilə gözlənilmədən N. Hacıyevin vəzifəsi «böyüdülərək» Respublika Nazirlər Kabinetinə mütəxəssis təyin edildi. Bu işə qarşı şuşalıların etirazı və müqaviməti heç bir nəticə vermədi.

Niyaz müəllim Bakıda da öz siyasi fəaliyyətini davam etdirdi, mitinqlərdə, respublika toplantılarında səriştəsiz rəhbərləri, xüsusən də indiki Şəhriyar adına klubda Ə.Vəzirovu birbaşa ifşa etmişdi. Azadlıq Meydanında 22 noyabr 1988-ci ildə keçirilən

mitinqin iştirakçılarının tələbi ilə N. Hacıyevə çıxış verilmiş, burada o, DQMV-nın ləğvini və erməni ekstremistlərinin həbs olunmasını tələb etmişdi. Həmişə də çıxışları maraqla qarşılanmışdı.

Qanlı 20 Yanvar hadisələrinə etiraz əlaməti olaraq ilk dəfə Sov. İKP sıralarından çıxdığına görə Bakı ictimaiyyəti onu bu cinayəti araşdıran Xalq Təhqiqatı Qrupuna rəhbər seçmişdi. N. Hacıyev Qorboçovu və Sovet hərbçilərini ifşa edən **«Bakı qırğını»** kitabçasını yazaraq elə həmin il Belorusiyada dərc etdirmiş və yayılmasını təşkil etmişdi. 2001-ci ildə isə onun fəlsəfi inkişaf prinsipindən doğan **«Uzun ömrün sirri və təşkili»** kitabı Azərbaycan Milli Ensiklopediyası tərəfindən çapdan buraxılmışdı.

N. Hacıyev hələ gənclik illərindən bir xobbi kimi daima fəlsəfənin inkişaf problemlərini araşdırmaqla məşğul olmuş, əldə etdiyi yenilikləri 2 dəfə Moskvadakı **Sistem Təhqiqatlar İnstitutunda** müzakirəyə təqdim etmişdi. STİ-nin rəhbərliyi müzakirələrin nəticələrindən razı qalaraq, onu Moskvaya birgə işləməyə dəvət etmişdi.

Niyaz müəllimin təşəbbüsü ilə 1991-ci ildə Respublika Proqnozçular İttifaqı yaradılmış, fəlsəfi inkişafın prinsipləri əsasında çıxarılan proqnozlar vaxtaşırı mətbuatda dərc olunmuşdu. 1991-ci ilin sonunda N. Hacıyev Naxçıvana gedərkən cənab H. Əliyevlə həmişəki kimi təkbətək görüşmüş və ona Əbülfəz Elçibəyin hakimiyyətə gələcəyi proqnozunu vermişdi.

Niyaz Hacıyev hazırda Nazirlər Kabinetində bölmə müdiri vəzifəsində çalışır. İki oğul, bir qız atasıdır. Sərbəst vaxtlarını **«Sistem və inkişaf»** adlı fəlsəfi bir kitab yazmağa həsr edir. Bir proqnozçu kimi nəinki doğma Qarabağ torpaqlarının azad olunacağına əmindir, hətta Azərbaycanın gələcəkdə bu regionda ən qüdrətli bir dövlət olacağını da söyləyir.



## CAMAATIN ÜRƏYİNCƏ İŞLƏSƏ DƏ…

Biz tez-tez Əliş əmi ilə söhbətləşərdik. Hər dəfə onun rəhbər işçilərlə arasında baş verən bir yeni əhvalatı barədə maraqlı açıqlamasını dinləyərdik. O, Əlövsətin dayısı idi. Əlövsət Məhərrəmovun RİK sədri seçildiyi az vaxtda yaxşı işlər görməsi barədə şəhər əhalisinin ümumi fikrinin əksinə olaraq bildirdi ki, Şahsuvarov da ciddi cəhdlə işə başlamışdı, heç bir il tamam olmamış Mingəçevirə dəyişirildi, ermənilər yaxşı işləyən, millətini sevən azərbaycanlı kadrlara imkan vermirlər. Neçə-neçə arxalı, yuxarılarda dayağı olan bacarıqlı, təşkilatçı katiblərin, RİK sədrlərinin çox sakitliklə başqa işə dəyişdirilməsinə nail olaraq perspektivini pozublar. Əlövsətin avtobaza işçiləri üçün tikilən 24 mənzilli binanın növbə əsasında təmənnasız paylanmasına orderlər yazdırıb hamının iştirakı ilə verərkən «kimə nə veribsinizsə, gedin, geri alın, aldanmayın» ifadəsini işlətməsini Gevorkova və vilayətin digər aparıcı rəhbərlərinə çatdırıblar. Eşitdiyimə görə «xətrinə» yaman dəyib.

***Əlövsət 1941-ci ilin iyul ayının 14-də Xəlfəli kəndində anadan olub. Anadan olduğunun yeddinci günündə atası Böyük Vətən müharibəsinə səfərbər edilib. Anası Göyçək xalanın dediyinə görə, həyat yoldaşının ilk məktubları Kerç şəhərindən, son məktubu Taqanroqdan gəlib, elə burada da ağır döyüşlər zamanı itgin düşüb… Özü də, yeganə övladı da Əliş əminin yolunu gözləyə-gözləyə qalıb. İki qəlbdə bir həsrəti ana-bala qoşa yaşadıblar. Əlövsət Üzeyir Hacıbəyov adına Şuşa şəhər 1 saylı orta məktəbi bitirib. Əvvəlcə Bakı***

***şəhərindəki Politexnik Texnikumunu, sonra da Azərbaycan İnşaat Mühəndisləri İnstitutunun «Sənaye və mülkü tikinti» fakültəsini bitirib. Əmək fəaliyyətinə 1963-cü ildə Şuşa RİK-in «Tikinti və memarlıq» şöbəsində böyük mühəndis kimi başlayıb. 1965-1972-ci illərdə təmir-tikinti, 92 № -li tikinti idarələrində, yol istehsalat sahəsində inşaat ustası, mühəndis, iş icraçısı, 1972-1979-cu illərdə Kolxozlararası tikinti idarəsinin rəisi, 1979-1980-ci illərdə Şuşa Rayon XDS İK-in sədri, 1981-1989-cu illərdə Şuşa Kurortlar Birliyində baş həkimin texniki işlər üzrə müavini, 1989-2001-ci illərdə Azərsənaye Rabitə Zavodunun Şuşa filialının direktoru, həmin zavodun İcarəçilər Şurasının sədr müavini, KAS KOM Şirkətinin sədr müavini vəzifələrində işləmişdir. Gözəl ailə başçısı, nüfuzlu bir ziyalı kimi Qarabağ camatı arasında xüsusi hörmətə malikdir. İki övladı , beş nəvəsi var. Həyat yolşdaşı Tahirə xanım uzun illərdir ki, səhiyyə sahəsində çalışır, insanların sağlamlığını qoruyur.***

Ə. Məhərrəmov öz qabiliyyəti və bacarığı sayəsində bu vəzifələrin öhdəsindən layiqincə gəlib. O, kolxozlararası tikinti idarəsinə rəis vəzifəsinə irəli çəkiləndə (1972) , özünün dediyi kimi, Qəşəm müəllim ona öz gücünə təhsil alıb formalaşan, əməyi ilə başqalarına örünək olan perspektivli bir gənc mühəndis kimi etimad gösərildiyini büroda bəyan edib və böyük gələcəyi olduğuna əminliyini bildirib. Az vaxtda rayonun təsərrüfatlarında aparılan tikinti işləriniin sürətləndirilməsinə nail olduğunu Əhəd müəllim də diqqətindən yayındırmayıb, onun RİK sədrliyinə irəli çəkilməsinə zəmanət verib… Lakin onun əməli fəaliyyəti gözügötürməzlərin narahatçılığına səbəb olub. Xüsusən də ermənilər onun vəzifədən kənarlaşdırılmasına hər vasitə ilə cəhd göstərib. Azryanların, xaçaturyanların , nəhayət Gevorkovun qurması ilə gözümçıxdıya salınıb.

«Şuşa şəhərində kurort kompleksini daha da inkişaf etdirmək tədbirləri haqqında» Azərbaycan KP MK və Nazirlər Sovetinin qəbul etdiyi birgə qərarda nəzərdə tutulan tikinti obyektlərinin

layihə-smeta sənədlərinin hazırlanıb plana salınması sahəsində ardıcıl iş aparılırdı. Ermənilər Şuşadakı quruculuq işlərinə hər vasitə ilə mane olmağa çalışırdılar. Qaraşarov küçəsində mövcud olmuş «Şirin su» hamamının çoxmərtəbəli yaşayış evi tikilərkən dağıdılaraq üstünün örtürülməsindən uzun müddət keçsə də, onun bərpasına başlanılanda vilayət XDS İK –nın rəhbərliyi çox cəhd göstərdi ki, bu iş təxirə salınsın, amma səylər fayda vermədi. Ə. Məhərrəmov inadkarlıqla vilayət rəhbərlərinin bir sıra məsələlərin həllində qeyri-obyektiv mövqeyinə qarşı öz etirazlarını bildirir, işlərin saymazyana görülməsinə daha çox üstünlük verirdi. Qərarda Şuşa – Xankəndi və Cıdır düzü – Topxana kanat yolunun , «Turş su» meneral zavodunun tikintisi nəzərdə tutulmuşdu. Hər iki obyektin layihə-smeta sənədləri Tbilisi şəhərində işlənməli idi. Bunun üçün lazım olan sənədlərin əksəriyyətini vilayət və respublika təşkilatları verməliydi. O, çox çətinliklə bu işləri qaydasına qoymaq üçün dəfələrlə Tbilisidə ezamiyyətdə olmuş, sənədləri hazırladıb Respublika Dövlət Plan Komitəsinə təqdim etmiş, orada da 1981-ci ilin tikinti planına salınıb Gürcüstanın tikinti təşkilatları tərəfindən inşa ediləcəyi barədə razılaşılmışdı. **Ə. Məhərrəmov:**

-- ***İşlərin təşkilini təmin edib yenicə Şuşaya qayıtmışdım. Məni vilayət partiya komitəsinin katibi B. Kevorkovun qəbuluna çağırdılar. Qəbul zamanı kimdən icazə alıb getdiyimi və nə işlər gördüyümü soruşdu. Hər sualın təfsilatı ilə çavabını verdim. O məndən nə üçün kanat yolun birinci etapı olan Şuşa – Xankəndi xəttini yox, ikinci etapı olan Cıdır düzü – Topxana xəttinin layihə-smeta sənədlərini hazırladıb plana saldırdığımı soruşdu, ciddi iradlar ilə mənə onun icazəsi olmadan rayondan kənara çıxmağımı qəti qadağan etdi. Axırı nə oldu, bundan iki ay sonra yenidən VPK-yə çağırıb yersiz bəhanələrlə tutduğum vəzifədən azad etdi.***

Ə. Məhərrəmov Qarabağ hadisələrinin ilk vaxtlarında fəal mübarizəyə qoşulmaqla şəhərin müdafiəsində yaxından iştirak edirdi. Qanlı 20 Yanvar faciəsi baş verəndə Şuşa

zəhmətkeşlərinin mitinqində bu aksiya əleyhinə etiraz səsini ucaltmaqla tribuna önündə partiya biletini yandırdı. Özü də düz etdi…Onu bu hərəkətinə görə qınayanlar da, alqışlayanlar da oldu…

Əlövsət Məhərrəmov vətənini, xalqını, onun adət-ənənələrini sevən, milli duyğularla yaşayan bir şəxsiyyətdir. O, Şuşasının, onu əhatəsində qoruyub saxlayan uca dağlarının - Kirsinin, Sarıbabasının, Qırxqızının başına papaq qoyan, əli silah tutan ərənlərimizin erməni işğalından azad edəcəyinə, düşmənlərimizdən heyfimizi alacağımıza, qayıdıb, Şuşanın qoynunda yenə qayğısız, xoş günlər keçirməyimizə varlığı ilə inanır. O gün uzaqda deyil…

# XALQIN ÜMİD YERİ…



Dağlıq Qarabağ hadisələrinin kəskin vəziyyət aldığı bir vaxtda erməni millətçilərinin xalqımızın başına gətirdiyi fəlakətlərin günü-gündən sayının artdığına məhəl qoymayan İttifaqın ermənipərəst rəhbərləri 1991-ci ilin 20 noyabrında DQMV-nin Martuni rayonunundakı Qarakənd ərazisində dəhşətli faciənin baş verməsinə, hərbi vertolyotun partladılmasına, münaqişənin dinc yolla aradan qaldırılmasına dair Jeleznovodsk sazişlərinin həyata keçirilməsinə kömək üçün gəlmiş, hərbi qulluqçu, müşahidəçi, jurnalist və Xalq deputatlarının, uçuş hey'əti üzvlərinin həlakına müvəffəq olmuşdur… Vertolyotun «partlaması» nəticəsində Azərbaycanın görkəmli dövlət və ictimai xadimlərinə - İsmət Qayıbov, Tofiq İsmayılov, Zülfü Hacıyev, Məhəmməd Əsədov, Vaqif Cəfərov, Vəli Məmmədov kimi fədakar vətən övladlarına ömrlərinin çiçəkləndiyi bir vaxtda qəddarcasına qəsd edildi. Günlərini ən qaynar nöqtələrdə keçirən bu ərənlərin müəmmalı ölümü bütün Azərbaycanı sarsıtdı… O vaxtdan on il keçsə də xalqımız yenə də həmin günlərin kədərini qəlbində yaşadır.

Zülfü müəllimin fəaliyyətinin bir hissəsi Naxçıvanla bağlı olmuşdur. Onun faciəli ölümü naxçıvanlıları bərk kədərləndirmişdir. Möhtərəm Prezidentimiz cənab Heydər Əliyevin imzası ilə hələ o zaman onun ailəsinə ünvanlanmış teleqramın«Gənclik» nəşriyyatında 1993-cü ildə çapdan buraxılan ***«Səni məndən soruşsalar»*** kitabına daxil edilmiş mətnində aşağıdakı sözlər yazılmışdı:

***--«Naxçıvan Muxtar Respublikasının Ali Məclisi və bütün naxçıvanlılar Zülfü bəyin faciəli surətdə həlak olmasından kədərlənir, mərhumun əzizlərinə dərin hüznlə başsağlığı verir. Naxçıvanlılar Zülfü bəyin əziz xatirəsini həmişə ürəklərində saxlayacaqlar. HEYDƏR ƏLİYEV. Naxçıan şəhəri, 21 noyabr 1991» Basarkeçərin Böyük Məzrə kəndində kolxozçu ailəsində anadan olub. 1952-ci ildə buradakı orta məktəbi qızıl medalla, 1957-ci ildə Zülfü Saleh oğlu Hacıyev 1935-ci il martın 21-də Azərbaycan Politexnik İnstitutunun inşaat fakültəsini fərqlənmə diplomu ilə bitirib. Tə'yinatla Donetski vilayətinin Krasnoarmeysk şəhərinə göndərilib, sıravi mühəndislikdən idarə rəisi vəzifəsinə yüksəlib. Bir müddətdən sonra Vətənə qayıdıb, Sumqayıt şəhərində əmək fəaliyyətini davam etdirib, 1962-1965-ci illərdə əvvəlcə iş icraçısı, mühəndis, sonradan isə Respublika Sənaye Tikinti Nazirliyinin Sumqayıtdakı 7 nömrəli Tikinti Trestinin 73 və 76 saylı tikinti idarələrində rəis, daha sonra ( indi öz adını daşıyır) Qırmızı Əmək Bayrağı Ordenli 1 saylı Tikinti Trestinin rəisi vəzifəsinə irəli çəkilib. Onun şəhərdə apardığı inşaat-quraşdırma işləri rəhbərliyin diqqətindən yayınmayıb. Seçkili orqanların tərkibinə daxil edilib: dalbadal plenum üzvü, ali və yerli Sovetlərə deputat seçilib. Respublikanın ictimai-siyasi həyatında yaxından iştirak etdiyi, son dərəcə təşkilatçı, təşəbbüskar, zəhmətsevər və tələbkar rəhbər işçi olduğu, ictimaiyyət arasında böyük hörmət və nüfuz sahibi, respublikanın «Əməkdar inşaatçısı» kimi tanındığı, Qırmızı Əmək Bayrağı, «Xalqlar Dostluğu», «Şərəf nişanı» ordenlərinə layiq görüldüyü nəzərə alınaraq, 1976-cı ildə Sumqayıt Şəhər Partiya Komitəsinin birinci katibi və XDS İK –in sədri, Naxçıvan MSSR Nazirlər Sovetinin sədri, Azərbaycan Respublikası Nazirlər Soveti sədrinin müavini kimi yüksək vəzifələrə irəli çəkilib. Azərbaycan SSR və Naxçıvan MR Ali sovetlərinin deputatı seçilib. Nazirlər Kabinetinin sədr müavini olmaqla yanaşı, Dağlıq Qarabağ üzrə yaradılan Təşkilat Komitəsinin üzvü, daha sonra isə***

***həmin komitənin sədri vəzifəsini şərəf və ləyaqətlə yerinə yetirib, xalqımızın müqəddəs Qarabağ torpağı uğrunda apardığı mübarizənin fəal iştirakçılarından biri kimi şəhidlik zirvəsinə yüksəlib…***

Zülfü müəllim Dağlıq Qarabağ hadisələri başlayan ilk vaxtlarda Sumqayıtda ermənilərin törətdiyi fitnə-fəsadların xalqımızın dincliyini necə pozduğunu, ermənilərin xislətinə yaxından bələd olduğundan bu işdə necə fəaliyyət göstərməyi bir çox rəhbərlərdən daha yaxşı bilirdi. Ona görə də tez-tez Şuşada, Xankəndində olur, vilayətdə çalışmış rəhbər işçilərlə məsləhətləşmələr aparar, lazım olan zəruri tədbirlər görərdi. Mikayıl Gözəlovu, Fərrux Hüseynovu yaxından tanıdığından onların məlumatları əsasında lazımi təşkilatçılıq işi aparardı. Şuşanın sosial-iqtisadi problemlərinin həllinə birinci növbədə diqqət yetirərdi. Aparılan tikinti işlərində tikinti təşkilatlarının ahəngdar fəaliyyətini təmin edilməsində köməkliyini əsirgəməzdi…

Z. Hacıyev çalışdığı vəzifələrdə yalnız xalqına sədaqətlə xidmət etmək, əsl övladlıq nümunəsi göstərmək idealını hər şeydən üstün tutub. Hazırda Xanlarda yaşayan Nağı Veyisovun söylədiyi bir epizodu qeyd etmək istəyirəm: «Oğlum, bir dəfə Sumqayıtda güclü mitinq idi. Hamı Qarabağa döyüşə getmək üçün rəhbərlikdən nəqliyyat təşkil edilməsin tələb edirdi. Zülfü müəllim söz verdi ki, sabaha hazırlaşın, sübh tezdən hamımız Şuşaya gedəcəyik. Avtobuslar meydanda dayananda mitinq iştirakçılarından cəmi 58 nəfər vədə yerinə gəlmişşdi. Onlar iki avtobusa əyləşib Ceyranbatana çatanda «köməyə » gedənlər avtobusu saxlatdırır və düşüb aradan çıxırlar. Avtobuslarda yalnız Zülfü müəllim və bir neçə adamla sürücülər qalır…»

Qarabağın ağır anlarında Z. Hacıyev cəsarətlə, qorxu bilmədən düşmən üstünə gedib, onlarla dialoqa girməsi, ikitərəfli danışıqlara rəhbərlik etməsi barədə ayrı-ayrı adamların söylədiyi çoxsaylı xatirələri dinləmişəm. Onun təəssübkeş, millətini sevən, damarlarından qeyrət qanı axan bir şəxsiyyət olduğu pafosla

vurğulanır. Lakin taleyin hökmü onu xalqından əbədi ayırdı, xeyirxah əməlləri yarımçıq qaldı. İndi Z. Hacıyevin və məzarı «Qürbət vətəndə» uyuyan ömür-gün yoldaşı Səyyarə xanımın yarımçıq qalmış arzularını ciyərparaları – Ruslan, Raman, Şölə, Mehparə, Lalə həyata keçirir, valideynlərinin yolunu davam etdirirlər. Onların ictimaiyyət arasında qazandığı hörmət və nüfuz kökəbağlılıqlarına bir nümunədir. Analarını öz əlləri ilə müqəddəs torpağa tapşırdıqları bir təsəlli olsa da, ata taleyindən çox nigarandılar, gözləri bu gün də yoldadır, haçansa atalarının qayıdacağına inanırlar.

Göyçəlilər mə'nəvi dayaqları və ümid çıraqları Zülfünü qəflətən itirəndə arxasızlıqdan bərk sarsıdılar… Onun yoxluğuna dost-tanışlar da inanmır. Vətən yolunda, haqq işi uğrunda şəhid olanların ruhu sağdır, o ruhlar doğma torpaqları üzərində gəzir, sevincimizə də, kədərimizə də şərikdir… Zülfü müəllimin həyat-fəaliyyəti gələcək nəsillər üçün bir nümunədir. Onun əziz xatirəsi qəlbimizdə əbədi yaşayacaqdır. Əli Mahmudun o zaman yazdığı» şerində Zülfü müəllimə xalqın ehtiramını bildirmişdi: **«Şəhidsən gözümdə göylərdən uca, Satqınlar yanında üzü qaradır.»**



## ONUNLA FƏXR EDİRDİK…

Şuşada Cəfər əmi haqqında kimdən soruşsaydılar, onun el-oba arasında sayılan, nüfuzlu ağsaqqallardan olduğunu tərəddüd etmədən söyləyərdilər. O, insanlara qarşı çox mehriban, qayğıkeş, həssas münasibətli idi. Onun xoş xasiyyəti, mənəvi keyfiyyətləri ailə üzvlərinin hər birinə sirayət etmişdi. Həyat yoldaşı Qumru ana çox hörmətli, hər kəsin yerini bilən, qarşısındakı adamı şirin dillə dilləndirən, qayğı göstərən, utancaq, qız-gəlindən də həyalı ağbirçəklərimizdən idi. Üzündəki nuranilik, xasiyyətindəki həlimlik ciyərparaları - Vaqif və Akifin hərəkətlərində addımbaşı hiss olunardı… Vaqifin dərdi onların qəddini əydi, sevimli gəlini Lalənin bu dərdə-qəmə dözməyərək köçgünlüyün ilk çağlarında işıqlı dünyayla vidalaşmasına heç cür tab gətirə bilmədilər, doğma Şuşaya qayıdıb istəkli Vaqiflərinin məzarı yanında əbədiyyətə qovuşmaq arzularına çatmaq onlara nəsib olmadı. Abşeron torpağının isti qoynunda haqqın dərgahına qovuşdular. Ailənin pərəni pozuldu…

***Vaqif Cəfər oğlu Cəfərov 18 aprel 1949-cu il tarixdə Şuşada anadan olub. Orta məktəbi 1966-cı ildə uğurla bitirib. Elə həmin il M. Əzizbəyov adına Neft və Kimya İnstitutunun energetika fakültəsinə qəbul olub , buranı 1972-ci ildə müvəffəqiyyətlə başa vuraraq, kənd təsərrüfatının və şəhər sənaye müəssisələrinin elektrik təchizatı üzrə mühəndis ixtisası alıb. Əmək fəaliyyətinə 1967-ci ildə Bakı şəhər İcraiyyə Komitəsi yanında «Baklift» idarəsində fəhlə kimi başlamış, 1968-1972-ci illərdə Azərbaycan SSR Mədəniyyət Nazirliyi***

***istehsalat və təchizat idarəsində elektrik işləmiş, 1972-73-cü illərdə Ukraynada hərbi xidmətdə olmuşdur.***

***1974-cü ildə «Şuşa» qəzetinin şöbə müdiri, 1974-76-cı illərdə Mardakert( indi Ağdərədir) rayonunda komsomol komitəsinin ikinci katibi, 1976-80-ci illərdə Şuşa Rayon Partiya Komitəsi təşkilat-partiya işi şöbəsində təlimatçı və ictimai əsaslarla rayon komitəsi yanında partiya komissiyasının sədri işləmişdir. 1980-82-ci illərdə Bakı Ali Partiya Məktəbinin əyani şöbəsində dinləyici olmuşdur. 1982-86-cı illərdə Dağlıq Qarabağ Vilayət Partiya Komitəsinin təbliğat-təşviqat və təşkilat-partiya işi şöbələrində lektor, təlimatçı, şöbə müdirinin müavini, 1986-89-cu illərdə isə ticarət-maliyyə və inzibati orqanlar şöbəsinin müdiri, 1989-91-ci illərdə Şuşa Rayon Partiya Komitəsinin birinci katibi və Respublika Sənaye Tikintisi Nazirinin müavini işləmişdir. Çalışdığı bütün vəzifələrdə əsl vətəndaş, geniş ictimaiyyətçi-təşkilatçı kimi özünü tanıtmış, etimad göstərilərək rayon , şəhər, qəsəbə XD sovetlərinə deputat, Əsgəran, Mardakert və Şuşa rayon, DQ Vilayət partiya komitələrinə üzv , üzvlüyə namizəd seçilmişdir. SSRİ Xalq deputatı olmuşdur.***

Vaqif Qarabağ probleminin aradan qaldırılmasına ən çox əmək sərf edən rəhbər işçilərdən biriydi. Gecəsi-gündüzü yoxuydu. Ermənisan adlandırılan Qərbi Azərbaycandan qaçqın düşmüş soydaşlarının Malıbəyli, Quşçular, Nəbilər kəndlərində yerləşdirilməsi, vilayətin azərbaycanlı əhalisinin qayğıları bir deputat kimi onun üzərinə düşmüşdü. Üstəlik də hadisələrlə əlaqədar Şuşaya gələn missiyonerlərin keçirdiyi tədbirlərə rəhbərlik, qaçqınlar üçün bilavasitə özünün təşəbbüs-təkidi ilə yaşayış evlərinin tikintisinin gedişinə nəzarət, yeni idarə və müəssisələrin yaradılması, vaxtaşırı SSRİ Ali Sovetin sessiyalarında iştirak etmək vaxt, risk, cəsarət, qorxmazlıq, səbr, dözüm və dəyanət tələb edirdi. Parlament iclaslarında olanda bu işləri Mikayıl Gözəlovla Nadir Sadıqova həvalə edərdi. Hər dəfə Moskvadan qayıdanda oradakı vəziyyət barədə verilən sualların cavabında ermənilərin güclü müdafiə olunduqlarını, hələ çətinliklərimizin sonralar yaranacağını vurğulayırdı. Çoxları onun bu fikirlərinə adi söz kimi baxır, əhəmiyyətsiz, elə-belə gülünc bir hal sayırdılar. Amma zaman deyilənlərə, güman edilənlərə ciddi rəvac verəndə əlavə izahata ehtiyac duyulmadı…

Vaqif müəllim tələbkar, yüksək vəzifəli rəhbər işçi olmasına baxmayaraq, çox mehriban, həssas qonşu idi. Məhləmizdəki uşaqlar onu, o da uşaqları sonsuz bir məhəbbətlə sevərdilər. İndi

o uşaqların əksəriyyəti ailə sahibi olsalar da, hər ilin aprel və noyabr aylarında onun doğum və ölüm gününü yad etməyi özlərinə mənəvi borc bilirlər. Vaqif müəllimin xatirəsini uca tutan, əbədiləşdirən, onun barəsində xoş sözlər söyləyən, övladları ilə daim əlaqə saxlayanlara da böyük gözlə baxırlar. Qarabağın ağır günlərindən televiziyada gedən söhbətlər zamanı Vaqif müəllimin adı çəkilməyəndə hiddətlərini gizlədə bilmirlər…

1991-ci il noyabr ayının 20-də DQMV-nin Martuni rayonunun Qarakənd kəndi yaxınlığında dəhşətli faciə baş verdiyini, hərbi vertolyotun partladıldığını, respublikanın görkəmli dövlət və siyasi xadimlərinin, hüquq mühafizə orqanlarının rəhbərlərinin, SSRİ Xalq deputatlarının, SSRİ Daxili İşlər Nazirliyinin və Müdafiə Nazirliyinin nümayəndələrinin, Dağlıq Qarabağda münaqişənin dinc yolla aradan qaldırılmasına dair Jeleznovodsk sazişlərinin həyata keçirilməsinə kömək üçün gəlmiş RSFSR və Qazaxıstan müşahidəçilərinin, jurnalistlərin, mülki peşə sahiblərinin və hərbi qulluqçuların həlak olması xəbərini «Günün ekranı»ndan eşidənlərin sabahkı günə inamı qırıldı. Qan tökülməsini dayandırmaq yollarının axtarışını birgə səylərlə davam etdirməyə gedən bu insanlrın ömürlərinin çiçəkləndiyi bir vaxtda müəmmalı faciəyə düçar olmaları böyüklü-kiçikli hamımızı sarsıtdı. Yaxından tanıdığımız, yoldaşlıq, dostluq etdiyimiz , ünsiyyətdə olduğumuz, görkəmli şəxsiyyətlərdən Dövlət katibi Tofiq İsmayılov, Baş Nazirin müavini Zülfü Hacıyev, Baş prokuror İsmət Qayıbov, Dövlət müşaviri Məhəmməd Əsədov, SSRİ Xalq deputatları Vaqif Cəfərov, Vəli Məmmədov, prezident aparatının şöbə müdiri Osman Mirzəyev , jurnalist Alı Mustafayev və başqalarının həyatlarına qəsd edilməsi, İmperiyanın və onun cinayətkar erməni əlaltılarının amansız xəyanətinin qurbanı olması vətənini, torpağını, xalqını, el-obasını qızğın bir məhəbbətlə sevənlərin ürəyini göyüm-göyüm göynətdi. Onlar Vətən uğrunda şəhid oldular. Şəhidlər isə ölmür, ölümsüzlüyə, əbədiyyətə qovuşurlar, əməllərinin müqəddəsliyində yaşayırlar.

Sevimli həyat yoldaşı Lalənin, gül üzlü balalarının - Nicatın, Nərminin, Günayın, ata-anasının, yeganə qardaşı Akifin, yaxın qonşularının, istəkli dostlarının,köməyinə arxalananların gözlərini əbədi olaraq yollarda qoymaqla, Vaqif müəllim qəlbində yaşatdığı müqəddəs amallar, istək və arzuları uğrunda əlbəyaxa savaşa qalxsa da, Vətən məhəbbəti onu əbədiyyətə qovuşdurdu. Vaqif Cəfərovun tərcümeyi-halına - təəssübkeşliyinə, humanistliyinə,

səmimiliyinə, xeyirxahlığına dərindən bələd olanlar onun şəxsində ən yaxın adamını, əziz bir insanı, hamıya eyni səviyyədə diqqət göstərməyi özünə mənəvi borc sayan bir rəhbər işçinin, bir dostun itirildiyini çəkinmədən söyləyərlər. Onun tabutu önündə göz yaşlarını boğub saxlayan dostu Mikayılın «qanını yerdə qalmağa qoymayacağam…» deyəndə heç kəsin ağlına da gəlməzdi ki, daşnak ermənilərin məkri ilə iyrimi gündən sonra onu da aradan götürəcəklər… Tanrıdan hər ikisinə rəhmət diləyirik.

Vaqif doğma Şuşada uyuyur, ruhu bu torpağın üzərində gəzən düşmən ayaqlarının səsinin, nəfəsinin nə vaxt kəsiləcəyindən, Ağdam-Laçın yolu ilə yaylaqlara yaylamağa gedən el-elat yolunun haçan açılacağından, Cıdır düzündə zəfər bayraqlarının qaldırılacağı günün gecikməsindən narahatdır. Ancaq bicə ondan rahatdır ki, bu gec də olsa, xalqımızın qeyrətli oğulları ərazi bütövlüyümüzün bərpası yolunda canlarından keçməyə və bu istiqamətdə aparılan işlərə dəstək verməyə hazırdır…

## HAMINI ÖZÜNƏ DOST BİLİRDİ



Mikayıl Qoca oğlu Gözəlov 1948-ci il aprel ayının 5-də Ağdam rayonunun Mərzili kəndində anadan olub. Onun dünyaya gəlişi atası Qoca kişinin sevincini sonsuz artırıb, sevimli balasına atasının adını qoyub.

Uşaqlıqdan inadkar və çalışqan olan kiçik Mikayıl doğulub boya çatdığı kənddə 7 illik, qonşu Novruzlu kəndində orta məktəbi bitirib. Ürəyinin istəyi ilə Ç. İldırım adına Azərbaycan Politexnik İnstitutunun inşaat fakültəsinə daxil olub, 1969-cu ildə təhsilini müvəffəqiyyətlə başa vuraraq təyinatla Şuşa şəhərindəki 92 nömrəli tikinti idarəsinə göndərilib. Əmək fəaliyyətinə tikinti ustası kimi başlasa da, inşaatın bütün incəliklərinə praktik cəhətdən bələdliliyindən az müddətdən sonra iş icraçısı, baş iş icraçısı, baş mühəndis, 1976-cı ildə isə çalışdığı idarənin rəisi vəzifəsinə irəli çəkilib. İşlədiyi müddətdə Şuşada, Ağdamda, Laçında, Qubadlıda çoxsaylı yaşayış binalarının, sosial obyektlərin ucaldılmasında, küçələrin, yolların salınmasına, şərab zavodlarının, fabriklərin inşa edilməsində, su kəmərlərinin çəkilməsində, Şuşa və onun kəndlərinin gözəlləşdirilməsində, abadlaşdırılmasında əlindən gələni əsirgəməyib. İşgüzarlığı və təşkilatçılığı nəzərə alınaraq 1982-ci ildə Respublika Sənaye Tikintisi Nazirliyinin Xankəndində yerləşən 9 saylı DQMV Tikinti Trestinə rəis müavini təyin edilib. O, bu vəzifədə təkcə vilayətin azərbaycanlılar yaşayan qəsəbə və kəndlərində deyil, Qubadlıda, Laçında, Füzulidə, Ağdamda bir çox tikinti obyektlərinin ucaldılmasına nail olub. Ümumiyyətlə, ixtisasına uyğun hansı

vəzifədə çalışıbsa, elinə, obasına, xalqına namusla, qeyrətlə, əsil kişilər kimi qulluq göstərib.

Mikayıl Gözəlov Şuşa Rayon XDS İcraiyyə Komitəsinin sədri və rayon icra hakimiyyətinin başçısı işləyəndə də həmişə qeyrətlə çalışıb. Zəhmətkeşin, fəhlənin qayğısına qalıb, ehtiyacı olanlara əl tutub, xeyirxahlıq göstərib, evsiz-eşiksiz əmək adamlarının sosial-məişət problemlərini həll edib, yeni iş yerlərinin açılmasını təmin edib, şəhərin müdafiəsi üçün batalyonlar yaradıb, quldur yuvasına çevrilən Yeğsahoğ, Böyük Qaladərəsi, Qaladərəsi, On verst kəndlərinin yağı düşməndən təmizlənməsi və Laçın – Şuşa yolunun təhlükəsizliyinin təmini üçün məqsədyönlü fəaliyyət göstərib…

O, ölümündən qorxan insan deyildi. Harada bir fövqəladə hadisə baş versə, Mikayıl mütləq oraya özünü birinci çatdırar, lazımi tədbirlər görər, vəziyyətdən çıxış yolları arayardı. Ancaq 1991-ci ilin 11 dekabrında iş başında namərd gülləsinə tuş gələndə nə bu xeyir-dua, nə də elədiyi yaxşılıqlar , nə göstərdiyi bu xidmətlər onun dadına, harayına çatmadı… Qatil gülləsindən ürəyi dayandığı bu ağır faciəli anda Mikayıl başının üstünü duman-çiskin almış Şuşanı, alışıb-yanan Şuşanı, ev-eşiyi, tarixi abidələri darmadağın edilən Şuşanı, buraya pənah gətirən qaçqınların taleyini və bir də böyüdüb ərsəyə çatdıra bilmədiyi məsum körpələriini- Sonasını, Səbinəsini, Səidəsini, Müşfiqini düşünürdü…

Qarabağ torpağı uğrunda yüzlərlə ərənlərimiz, Koroğlu, Cavanşir, Nəbi , Həzi, Gəray qeyrətli oğullarımız qurban gedib. Onların əksəriyyəti erməni yaraqlıları tərəfindən qanına qəltan edilib. Soydaşlarımızın soyqırımı bizi yandırıb yaxır. Bəs Mikayılın özümüzünkülərin əli ilə qətlə yetirilməsinə nə ad verəsən?!.

Jurnalist dostum Əli Mahmud «Bərəkət» qəzetinin 13 iyun 1992-ci il tarixli sayında «Bir qəzada iki əl» adlı müsahibəsində deyir: «*Prezident ona (Mikayıl Gözəlova) tapşırmışdı ki, barışıq yolu tutun. O da ilk cəhddən sonra başa düşdü ki, bu yol*

*saxtadır. Ermənilər barışmaq fikrində deyil. Bizi aldadıb hücuma keçirlər. Ona görə də belə qəna ətə gəldi ki, prezident deməsin, lap kim deyir-desin, fərqi yoxdur. Şuşaya açılan atəşə on qat cavab verməliyik. Bu da respublika rəhbərliyini qane etmədi. Onun ölümü müəmmalarla dolu sırf dövlət səviyyəli qəsd idi. Bu qəsd ya prezidentin, ya da Polyaniçkonun əli ilə edilmişdi».*

Şuşa hamı kimi onun da and yeri, güvənc yeri idi. İndi onun ruhu sakinləri qaçqın olan Şuşasının, işğalda olan Qarabağ torpaqlarının başı üstə dolanır. O ruhun cazibəsi inşallah bizləri doğma Şuşaya qovuşduracaqdır !..

## SİNƏSİNİ SİPƏR EDƏN MÜSTƏNTİQ



Dağlıq Qarabağ hadisələrinin lap əvvəlindən çətinliklərə sinə gərən, heç nədən qorxmayan hüquqşünaslardan biri də Siyasət Alıyev idi. «Qarabağ» qəzetinin 23 iyul 1999-cu il sayında onun «Bıçaq yaraları sağalsa da fiziki işgəncənin ağrıları unudulsa da, qarabağ yarasının göynərtisi mənə rahatlıq vermir» başlıqlı müsahibəsində Ç. Tofiqoğlu və Əli Mahmudu maraqlandıran suallara yığcam, həm də obyektiv cavablar verilmişdir.

Həmin müsahibədə 1988-ciilin fevral ayının sonlarında Qarabağın ilk azərbaycanlı şəhidləri - Əli və Bəxtiyarın torpaq uğrunda canlarını qurban verməsi, belə bir vaxtda ermənilərin növbəti qanlı cinayətlərə həvəsləndirilməsi, azərbaycanlıların bir növ tənbeh edilməklə, əminamanlıq yaratmağa istiqamətləndirilməsi respublika rəhbərlərini hələ çox az düşündürürdü. Vilayət mərkəzində mitinqlər səngimək bilmirdi. MK katibi K.Bağırovun qətiyyətsizliyi, hadisələrin dinamikasını görə bilməməsi gələcəkdə başımıza gətirilən müsibətlərə sanki münbit zəmin yaradırdı.

Ağdamdan say-seçmə oğullarımızın Əsgərana yürüşü erməniləri ciddi vahiməyə salsa da, axının qarşısını Xoraman Abbasovanın araya atdığı yaylıq almış, qarşıdurmada heç bir hadisəyə yol verilməmişdir. Lakin ermənilər bu fürsətdən istifadə edərək Əsgəranda yaşayan azərbaycanlıları işgəncələrə məruz qoymuş, evlərini talan etmiş, özlərini isə qovmuşlar. Siyasət Alıyev isə 1983-cü ildən əmək fəaliyyətinə prokuror köməkçisi kimi başladığı Əsgəran rayon prokurorluğuna - iş yerinə gedib-gəlməkdə, Əsgərandakı mənzilində yaşamaqda davam edirdi.

Maneələrə, yersiz hücumlara, 1988-ci ilin noyabr hadisələrindən sonra iş otağının və mənzilinin qapısına öldürüləcəyi barədə vurulan vərəqələrə baxmayaraq, burada qalmağı özünün mənəvi və vətəndaşlıq borcu sayır, qanunçuluğun keşiyində ayıq-sayıq durur, günahsız tutulan azərbaycanlıların haqqını, hüququnu müdafiə edirdi.

1988-ci ilin setyabr ayının 18-də əlinə ağac, daş, balta götürmüş erməni quldurlarından ibarət böyük bir dəstə Siyasətin mənzilinə hücuma keçir, evin qapı-pəncərələrini, əşyalarını qırıb-dağıdırlar. Siyasətin etirazına baxmayaraq, xoşbəxtlikdən həmin gün səhər tezdən qayını gələrək, bacısını uşaqları ilə birlikdə Gəncəyə aparmışdı…

O, hücum edənlərin əksəriyyətinin qapıbir qonşusu, çətin anlarda əl tutduğu, kömək etdiyi naxələflər olduğunu bilir və onların qarşısını təmkin və soyuqqanlılıqla alır… Gecənin bir vaxtında əlində vacib sənədlər yığılmış çamadan, aldığı zərbələrdən halsız halda evdən çıxır, üzümlüklərin arası ilə səhərə yaxın Ağdamın Qarağaca qəbristanlığındakı posta çatır. Səhər tezdən erməni prokuror onu görəndə təəccüblənir və özünü saxlaya bilməyib: «Səni axşam sağ buraxıblar?» ,-deyir. Siyasət cavabında ona deyir ki, görünür nədəsə səhv etmisiniz, amma hökmən cavabını alacaqsınız…

S. İ. Alıyev bu hadisədən sonra yenə də işləməkdə, qapı və pəncərələri qırılmış mənzilində yaşamaqda davam edirdi. Təhqirlər, söyüşlər, atılan daşlar torpaq, qeyrət naminə hər cür çətinliyə dözdü. Şənbə və bazar günlərində piyada Ağdama gedib özü üçün bir həftəlik azuqə ilə Əsgərana qayıtmaqda davam edirdi. Bu münvalla 1989-cu ilin sonunadən fəaliyyətini dayandırmadı. Həmin ilin sonlarında onu hadisələrin mərkəzinə, barıt çəlləyini xatırladan Xankəndə - vilayət prokurorluğunun baş müstəntiqi vəzifəsinə göndərirlər. Ağır iş günləri başlayır, qaynar nöqtələrə ezam olunur, günlər, aylar bir-birini əvəz edir, ilə dönür… 1991-ci ilin sonlarında axşam saat 15-16 radələrində S. Alıyev istintaq qrupunu Ağdama aparan avtobusun yanına gəlir

ki, sürücüyə və əsgərlərə bir az tez gedəcəklərini bildirsin. Elə bu anda erməni quldurları onu əhatəyə alır, özlərindən qabağa qadınları buraxır, arxadan beşbarmaqla onun başına, sifətinə zərbələr endirir, sonra da bıçaqlarını işə salırlar. S. Alıyev silah işlətmək istəsə də, O saat vilayət prokurorunun müavini Mübariz Bayramovun, müstəntiq Şahmalı Məmmədovun taleyini düşünür və tez fikrindən daşınır.

Onun qarın nahiyəsindən vurulan bıçaq yarasından axan qanın dayanmadığını görən erməni quldurları artıq müstəntiqin öldüyünü yəqinləşdirib, geri çəkilərək aradan çıxırlar. O, bütün qüvvəsini toplayıb ayağa durur, erməni vəhşilərinin yenidən üstünə gəldiyini görəndə silahı çıxarmalı olur. Əclaflar dayandığı üçün çətinliklə də olsa, prokurorluğa qayıdır. Onu bu vəziyyətdə görən SSRİ prokurorluğunun buradakı işçiləri həkim çağırtırırlar. O vaxtlar erməni həkimlərin azərbaycanlıların körpə uşağına belə tibbi yardım göstərmədiyini, Hippokrat andlarının əleyhinə getdiklərini bildiyindən, erməni canilərinin ondakı istintaq işləri ələ keçməsin deyə, tələsik təhvil verərək təcili Şuşaya aparılmasını xahiş edir. Onu toran qovuşanda Şuşa rayan xəstəxanasına çatdırırlar. Baş həkim Ramiq Məhərrəmov, cərrah Nazim Allahverdiyev, Bakıdan Respublika Klinik Xəstəxanasından cəbhə bölgəsinə ezam edilmiş cərrah Telman Rzayev əməliyyata başlayaraq gənc müstəntiqin həyatını xilas edirlər.

Onu da xatırladım, S. Alıyevin bıçaqlaması xəbəri bütün Şuşa əhalisini ayağa qaldırmışdı. Xəstəxananın həyəti mitin meydanını xatırladırdı. Üç gün burada müalicə olunduqdan sonra rəhmətlik İsmət Qayıbovun göndərdiyi vertolyotla Cıdır düzündən bu sətirlərin müəllifinin, Şuşa rayon prokurorunun müavini Mansur Mirzəyevin müşayəti ilə Bakıya - Akademik M. Topçubaşov adına Elmi Tədqiqat Klinik Təbabət İnstitutuna yola salındı.

S. Alıyev müalicə olundu. Sədərək rayonuna prokuror təyin edildi. Özünün dediyi kimi, SSRİ Prokurorluğu İstintaq İdarəsinin rəisi Aleksey İliç Nikolayev cinayət işlərinin açılmasına

mane olmaq, erməniləri himayə etmək məqsədilə bir neçə dəfə ona vilayətdənkənar rayonlara prokuror təyin etdirəcəyini bildirsə də, S. Alıyev qəti etiraz etmişdir…

Siyasət Alıyev Xanlar və Samux rayonlarında prokuror köməkçisi, Gəncə şəhərinin Nizami rayonunda prokuror müavini, Gədəbəy, Qusar və Xaçmaz rayonlarında prokuror vəzifələrində işləyib. Hazırdı Azərbaycan respublikasının hərbi prokurorunun birinci müavini olmaqla hərbi prokurorun vəzifəsini icra edir



## NİZAMİ KEYKAVUS OĞLU BƏHMƏNOV

Nizami Keykavus oğlu Bəhmənov məşhur tarixi şəxsiyyətlərdən olan Bəhmən Mirzənin nəsil şəcərəsindən Mirzə Keyqubadın nəvəsidir. O, 1948-ci ildə Şuşa şəhərində ziyalı ailəsində anadan olub. Uşaqlıq və məktəb illəri burada keçib. Ç.İldırım adına Az. Pİ-nin «Sənaye –mülki tikintisi» fakültəsini bitirib. Təyinatını doğma şəhərə alıb. İş icraçısı kimi əmək fəaliyyətinə başlayıb. Təmir-tikinti idarəsinin rəisi, Respublika Sənaye Tikinti Nazirliyi 9 №-li Tikinti Tresti 92 saylı tikinti idarəsinin bir müddət baş mühəndisi və sonralar rəisi işləyib. DQMV-də və onun ətrafında baş verən hadisələrin kəskinləşdiyi bir vaxtda Dağlıq Qarabağ Layihə Sənaye Tikinti Birliyinin rəisi vəzifəsində çalışıb. Xocalı faciəsinin respublikada yaratdığı ağır sarsıntıları yaşadığımız, şəhərdə mülki əhalinin az olduğu, daha doğrusu prezident tərəfindən Rəhim Qazıyevin Şuşanın hərbi komendantı təyin edildiyi və Şuşa rayonunun bütün strukturlarının, o cümlədən, sabiq icra başçısı Mənsur Məmmədovun haqlı tələblərinə yuxarı dairələrdə biganəlik, saymamazlıq göstərilərək, onun dinc əhali ilə işləmək imkanlarının məhdudlaşdırıldığı, respublika rəhbərliyi tərəfindən Şuşa əhalisinin kütləvi şəkildə aşağı rayonlara köçürülməsi üçün min ədəd yük maşını göndərildiyi, eyni zamanda bu prosesin iki tərəfli davam etdirildiyi bir vaxtda, özünün tam razılığı olmadığı halda, təhriklə 1992-ci ilin aprelində o, Şuşa Rayon İcra Hakimiyyətinin Başçısı təyin olunub.

N. Bəhmənov təyinat aldığı vaxtlar Şuşa ən ağır günlərini yaşayırdı, şəhər hər tərəfdən mühasirədə idi, Ağdam – Şuşa,

Laçın – Şuşa yolları bağlanmışdı. İlk vaxtların çətinlikləri, görülən operativ tədbirlər haqqında N. Bəhmənov dəfələrlə respublika televiziyasında, mətbuatda geniş açıqlamaları ilə məsələnən əsl mahiyyətinin nədən ibarət olduğuna aydınlıq gətirmişdi. Şuşanın ermənilər tərəfindən alınması ilə bağlı keçirilən məhkəmə iclaslarında real vəziyyətin hərbçilər tərəfindən qiymətləndirilməsinə səriştəsizlik göstərildiyini faktlarla diqqətə çatdırmışdı. Bu baxımdan hadisələrə maraq göstərənlər "Xalq qəzetinin" 8 may 1997-ci il tarixli sayında Şuşanın süqutunun beşinci ildönümü münasibətilə Zərifə Bəşirqızının Nizami Bəhmənovla müsahibəsini diqqətlə oxusalar, onlar üçün hər şey daha çox aydın olar.

Həmin müsahibədə ağızlarda gəzən, həqiqətə uyğun olmayan, obyektivlikdən kənar söz-söhbətlərin əsl mahiyyəti açıqlanır, «Şuşanın xəyanətin qurbanı olduğu» vurğulanır.

Müxbirin: *«Nizami müəllim, sizin fikrinizcə, Şuşa başıpozuqluq nəticəsində işğal olundu, yoxsa onun taleyi qumara qoyulmuş rayonlarımız sırasında idi? Bir də Xocalı haray qoparanda Şuşa niyə susmuşdu?* » suallarına Nizami Bəhmənovun aşağıdakı cavabları daha çox maraq doğurur: --«Yaxşı dediniz. Dağlıq Qarabağın taleyi məhz 1988-ci ildən qumara qoyulmuşdu. Bir-birinin ardınca K. Bağırov, Ə. Vəzirov, A. Volski hakimiyyətinin yaranması, azərbaycanlılardan silahların yığılması, ermənilərin silahlanması, Volskinin A. Mütəllibov tərəfindən deputat seçilməsi buna sübut idi. 1990-cı ilin Yanvar qırğınından sonra A.Mütəllibovun hakimiyyətə gəlişi hadisələri sürətləndirdi. Mütəllibovun məqsədi MDB-yə daxil olub Azərbaycanda yerləşən rus ordularına status vermək idi. O fikirləşmirdi ki, Yanvar qırğınından sonra əhali «rus amili»ni qəbul edə bilməz. Sizin yaxşı bildiyiniz uğursuz «Daşaltı əməliyyatı» da bir siyasət idi. Bununla xalqa sübut etmək istəyirdilər ki, Azərbaycan Rusiyasız yaşaya bilməz. Sonra Rəhimin komendant göndərilməsi, onun yaralanması ilə bağlı sui-qəsd. Özünü qəhrəman göstərmək üçün 8 nəfər avtomat

gülləsinin qurbanı oldu. Özünə isə dəyən tapança gülləsi idi. Bir-birinin dalıyca 55 yaşayış məntəqəsi getdi. Şuşadan Xocalıya kömək olmadı, düzdür. Necə olaydı axı! Bizim nəyə gücümüz çatırdı? Şuşada biz heç nə bilmirdik. Səlahiyyətimiz yox idi. Hər şeyi Rəhim idarə edirdi. Həm də məlumat gəlirdi ki, Xocalıda sakitlikdir. Stepanakertə Şuşadan çox atılıb, o hesabla gərək şəhər yerlə-yeksan olaydı. İndi öyrənirəm ki, orada 2-3 ev dağılıb. Sən demə rusun bizə verdiyi mərmilərin də dağıdıcı xassəsi yox imiş. Əgər Stepanakertə 3 mindən çox «Qrad» mərmisi atılıbsa, gərək o şəhərin ancaq adı qalaydı… Xocalı faciəsi Ayaz Mütəllibovu vəzifədən uzaqlaşdırdı. Onun yenidən həmin stola qayıtması naminə daha dəhşətli bir hadisə lazım idi. Şuşa belə qurban seçildi…»

On ildir ki, şuşalılar Şuşasızdır. Onun icra strukturları, idarə və təşkilatlarının bir qrupu Bakıda fəaliyyətini davam etdirir. Nizami Bəhmənov başçısı olduğu icra hakimiyyətinin aparatı ilə birgə onların işinə istiqamət verməklə, öz doğma yuvasından didərgin düşmüş və respublikanın 65 rayonunda sığınan şəhər sakinlərinin sosial-məişət qayğıları ilə yaxından məşğul olur. Eyni zamanda Dağlıq Qarabağın azərbaycanlı icmasının rəhbəri, səlahiyyətli nümayəndəsi kimi beynəlxalq formlarda, samitlərdə , görüşlərdə iştirak edir. Ğarabağın başına gətirilən müsibətlərdə səbəbkar olan, son dərəcə laqeydlik göstərən rəhbər işçilərin kimliyindən asılı olmayaraq, onların törətdiyi və etdiyi hərəkətləri çıxışlarında, kütləvi informasiya vasitələrindəki müsahibələrində təfərrüatı ilə xalqa çatdırmaqla, proseslərə aydınlıq gətirməyi özünün şəxsi həyatından üstün tutur. Görülən işlərə şantaj və böhtanları ilə qara yaxmaq istəyən müxalif qüvvələrin hücumlarından qorxub-çəkinmir. Daim gərginlikdədir. Gələcəyə inamla baxır. Hamını nikbin və döyüşə hazır olmağa ruhlandırır. Şuşaya dönmək ümidi ilə yaşayır və bu istiqamətdə aparılan işlərin yaxından iştirakçısıdır.

Nizami Bəhmənov yüksək ixtisaslı tikinti mühəndisi, təşkilatçı və tələbkar bir rəhbər işçidir. Səmimi, mehriban, adamlarla

ünsiyyətdə olmağı sevən bir insandır. Gözəl ailə başçısıdır. Tariximizin zəngin səhifələrində ziyalılığı ilə şöhrətlənən, görkəmli şəxsiyyət Bəhmən Mirzə nəslinin layiqli varislərindəndir.

## HADİSƏLƏRİN CANLI ŞAHİDİ



Vaqif Hüseyn oğlu Hüseynov 1944-cü ilin 28 fevralında Şuşa şəhərində anadan olub. Uşaqlıq illəri də burada keçib. 1951-1961-ci illərdə şəhər 1 saylı orta məktəbdə təhsilini müvəffəqiyyətlə başa vurub. Eyni zamanda, şəhər musiqi məktəbinin tar sinfini də bitirib, xudmani tar çalmağı ilə yaşıdları arasında fərqlənib. Azərbaycan Politexnik İnstitutunun memarlıq şöbəsini 1967-ci ildə, Bakı Sosial İdarəetmə və Politologiyn İnstitutunu fərqlənmə diplmu ilə 1992-ci ilə bitirib.

Əmək fəaliyyətinə 1967-ci ildə Qasım İsmayılov (indiki Goranboy ) rayonunun baş memarı kimi başlayıb, 1970-ci ildə Sovet ordusu sıralarında qulluq edib, ehtiyatda olan kapitandır.

Hərbi qulluğu başa vurduqdan sonra Ağdam şəhərindəki tikinti idarəsində iş icraçısı, sonralar Şuşa şəhərində memar, kommunal təsərrüfat şöbəsinin müdiri, Şəhər Xalq Deputatları Soveti İcraiyyə Komitəsinin sədri, rayon partiya komitəsində şöbə müdirinin müavini, siyasi maarif kabinetinin müdiri vəzifələrində çalışıb, yenidən şəhər XDS İK-nin sədri seçilib. Hazırda Şuşa RİH Başçısının Şuşa şəhəri üzrə nümayəndəsi vəzifəsində çalışır. Vaqif müəllim 7 bacının yeganə qardaşı, 3 oğul, 1 qız atasıdır. Övladlarının hamısı ali təhsil almışdır.

V.H.Hüseynovun bir ziyalı, istedadlı memar, bacarıqlı mühəndis, təşkilatçı və siyasi cəhətdən yetgin rəhbər işçi olduğu ona böyük hörmət və nüfuz qazandırmışdır. Şuşanın tikilib qurulmasında, abadlaşdırılmasında və nümunəvi kurort şəhərinə çevrilməsində bacarığını əsirgəməmişdir. Dağlıq Qarabağda baş verən hadisələrin ən gərgin çağlarında onun bir an belə rahatlığı olmamış, gözünün qarşısında baş verənlərə biganə qalmamış,

kimliyindən asılı olmayaraq, ədalətsiz, şovinist, qeyri-obyektiv hərəkətlərə yol verənlərə qarşı həmişə etirazını bildirmiş və haqq səsini ucaltmışdır.

Bunlar öz yerində. Çapa hazırlanan «Sözün yaddaşı əbədidir» toplusunda bir şuşalı olaraq hörmətli Vaqif müəllimin milli bəlamız olan Qarabağ hadisələrinə münasibətini bildirməsinə olduqca ciddi zərurət olduğunu, fikir və düşüncələrini ümumiləşdirməsini xahiş edəndə o, yenicə Strasburq şəhərindən qayıtmışdı. Təklifimi çox istiqanlıqla qarşıladı və dedi ki, məmnuniyyətlə, əksinə olsa , ən azı başa düşülmərəm.Vaqif müəllim keçmiş hadisələrin xronologiyasını verdikdən sonra dedi:

***-Qarabağ məsələsinə, onun başlanma səbələri və həlli yollarına hər kəsin öz münasibəti, fikri var. Bu fikirlərə hörmətlə yanaşıram. Mənim fikrimcə bu məsələdə biz mənfur ermənilərdən çox özümüzü qınamalıyıq. Çünki ermənilər dədə-baba düşmənimizdir. Onlar tarix boyu bizə zülm etmək, torpaqlarımızı qəsb edərək, dövlətçiliyimizi sarsıtmaq məqsədində olublar. Lakin biganəliyimiz, hadisələri düzgün qiymətləndirməməyimiz, bir qrup avantüristin siyasi və şəxsi ambisiyasına uymağımız bizi görünməz bəlalara düçar etdi. Burada hadisələr başlanan ərəfədə respublikaya rəhbərlik edənlərin milli qeyrətsizliyini, qorxaqlığını, siyasi səriştəsizliyini, keçmişin ibrət dərslərindən bəhrələnə bilməyərək öz kreslolarını qorumaq instiktindən qurtula bilmədiklərini də əlavə etsək, vəziyyətin ağırlıq dərəcəsi aydın olar.***

***Qarabağ probleminin çözülməsi ilə əlaqədar yol verilən ciddi nöqsanların sayı-hesabı yoxdur. Təkcə bir faktı qeyd etmək bəsdir ki, bu respublikada erməni təcavüzünün tüğyan etdiyi 1988 - 1993-cü illərdə möhtərəm Prezidentimiz Heydər Əliyevə qədər 6 dövlət başçısı dəyişmişdir. Bunlar- K. Bağırov, Ə. Vəzirov, A. Mütəllibov, Y. Məmmədov, İ. Qəmbərov və mərhum Əbülfəz Əliyev idi. 5 ildə 6 rəhbər dəyişən respublikada xalqın hansı birliyindən danışmaq olardı ki,***

***ermәniyә qarşı mübarizә aparasan . Bәyәm qudurmuş ermәnini yerinә oturtmaq üçün Sovet İttifaqı mütlәq dağılmalı idi? Dağıldı da. Bәs niyә hәll olmadı mәsәlә? « Xalq hәrәkatı»nın liderlәri hakimiyyәtә gәldilәr. Bәs niyә hәll olmadı mәsәlә?***

***Sualın cavabı aydındır. Azәrbaycanın hadisәlәr başlanandan sonrakı sovet rәhbәrliyi yaranmış tәhlükәnin mahiyyәtini vә miqyasını dәrk etmәdi, xalqı sәfәrbәr etmәk, sәrt tәdbirlәrә әl atmaq әvәzinә, addım–addım geri çәkildi, son mәqamda xalqı taleyin ümidinә qoyub qaçdılar, ölkәdә hakimiyyәtsizlik, anarxiya yarandı. Ermәnilәr dә bunu istәyirdi. Öz işlәrini rahatca gördülәr. Әvvәlcә Qarabağımızın dağlıq hissәsini, sonralar da qalan hissәsini әlә keçirәrәk bizi mәğlub etdilәr. Bir sözlә, Azәrbaycanın әrazi bütövlüyü onun müstәqilliyinә qurban verildi. Torpaqlarımızın işğalı bir yana, ölkәnin parçalanaraq tamam dağılması tәhlükәsi yarandı. Nә yaxşı ki, Heydәr Әliyev varmış, son mәqamda xalqın tәlәbi ilә Bakıya dәvәt edildi…***

***Qarabağ mәsәlәsinә münasibәtimin qısa mәzmunu belәdir. Qısa deyirәm ona görә ki, sinәm doludur. Әlbәttә, bu mәsәlәdә iri dövlәtlәrin geosiyasi maraqları, dünya içtimai fikrinin ermәnilәrin xeyrinә olması vә bilmәdiyimiz digәr faktorların da xüsusi rolu oldu. Lakin, bütün hallarda ermәninin bizә qalib gәlmәsi bağışlanılası deyil vә bu günahı heç nә ilә yumaq olmaz.***

**-Burada ortaya tәbii sual çıxır. Bәs biz nә edirdik? İşğaldan qabaq vә sonrakı fәaliyyәtimiz nәdәn ibarәt olub?**

-Özüm haqda danışa bilәrәm. 1988-ci ildә ermәni separatizmi başlanan zamanlar mәn rayon partiya komitәsinin tәşkilat şöbәsindә işlәyirdim. Birinci katibimiz Niyaz Hacıyev idi. O zamanlar onunla münasibәtimiz çox isti olmasa da, qeyd etmәliyәm ki, Niyaz müәllim Qarabağ hadisәlәrinin başlanmasından ta katiblikdәn azad olunanadәk ermәnilәrә qarşı sәrt mübarizә aparmış, elә bu sәrtliyinin nәticәsi olaraq o,

Ə.Vəzirov tərəfindən vəzifədən kənarlaşdırılmışdı. Bu yerdə olmuş bir əhvalatı xatılatmaq yerinə düşərdi.

Ə. Vəzirov respublikaya yenicə birinci katib təyin olunmuşdu. Buna qədər şuşalıların erməni təcavüzünə olan kəskin etirazları o vaxtkı respublika və SSRİ rəhbərliyinə müxtəlif üsullarla bildirilmişdi. Qeyri təvazökarlıq olsa da, deməliyəm ki, bu yazı-pozuların müəllifi əsasən mən idim. Azərbaycan SSR Ali Sovetinin 1988-ci ilin iyununda XI çağırış VII sessiyasının keçirilməsi ərəfəsində girdim Niyaz müəllimin yanına. Dedim, Niyaz müəllim, beynimə bir fikir gəlib. Soruşdu ki, nə fikirdi bu? Dedim ki, sessiyaya gedəcəksiniz. Gəlin, bir iş edin. Bu sessiyada Azərbaycanın Dağlıq Qarabağ Vilayətinin bir inzibati ərazi qurumu kimi ləğv olunması məsələsini qaldırın. O vaxtkı Azərbaycan Konstitusiyasının səhv etmirəmsə, 78-ci və ya 79-cu maddəsi, həm də M. Qorboçovun aşkarlıq, pülüralizm şüarı buna hüquqi əsas verirdi. Və əgər sessiya belə bir qərar qəbul edərdisə, ermənilərin Qarabağ hərəkatına birdəfəlik xitam verilərdi. Çünki, əgər Dağlıq Qarabağ Vilayəti yoxdursa, erməni bizdən nə istəyəcəkdi?

Bu təklif Niyaz müəllimin beyninə batdı. Dedi, Vaqif müəllim, hazırla, görək nə çıxır.

Mən sessiyanın gündəliyinə çıxarılacaq layihəni hazırladım. Motiv bu idi ki, Ermənistan respublikası Azərbaycanın ərazi bütövlüyünü pozmaq, Dağlıq Qarabağı özünə birləşdirmək üçün vilayətdə separatçılıq hərəkatına başçılıq edir. Görülən tədbirlər heç bir nəticə vermir, bu hərəkatın gələcəkdə törədəcəyi bəlalardan qurtulmaq üçün Azərbaycanın Dağlıq Qarabağ Muxtar Vilayəti bir inzibati ərazi qurumu kimi ləğv edilir. Ermənistana birləşmək həsrətində olan ermənilər köçsün «ana» Ermənistana, Azərbaycanı tanıyan, onun qanunlarına hörmətlə yanaşıb, dinc həyat sürmək istəyən ermənilər isə qalır Azərbaycanda, əvvəlki firavan həyatlarını yaşayırlar. Və əgər Vilayət statusu yaxşı şeydirsə Ermənistanda və Gürcüstanda kompakt şəkildə yaşayan

azərbaycanlılara da belə status verilməlidir. Verilmirsə, bu tarixi ədalətsizlikdir və aradan qaldırılmalıdır.

O vaxtlar vilayət ermənilərinin əksəriyyəti qorxu, təlaş içində idi. Onların arasında bu separatizmi pisləyənlər də vardı. Respublika rəhbərliyindən nəsə sərt tədbir görüləcəyindən qorxaraq köçmək üçün hətta konteynerlər də sifariş etmişdilər. Bir sözlə, tikan üstə idilər.

Necə oldusa, Vəzirov bu məsələdən xəbər tutdu. Sonradan öyrəndik ki, məsələdən əvvəlcə Qorbaçov xəbər tutub, zəng edib, Vəzirova təpinib ki, belə işə, yəni vilayətin ləğvinə qəti olaraq yol vermək olmaz.

Vəzirov sessiyaya üç gün qalmış Niyaz Hacıyevi Bakıya çağırdı. Niyaz müəllim də 5-6 deputatın qol çəkdiyi bu layihə ilə Bakıya getdi. Sevinirdim ki, bu qərar sessiyada qəbul ediləcək və vilayətdə geniş əks-səda verəcək. Bundan sonra separatçılar da zərərsizləşdiriləcək, respublikamız bədnam Dağlıq Qarabağ məsələsindən birdəfəlik qurtulacaqdı.

Lakin belə olmadı. Vəzirovla Niyaz müəllimin arasında çox ciddi qalmaqal olub. Büro üzvləri məsələyə qarışıblar və təbii ki, layihənin gündəliyə çıxarılmasının qarşısı alınıb. Elə bundan sonra da Niyaz müəllimin məsələsi həll olundu, o, başqa işə dəyişirildi. Qeyd edim ki, bu məsələni o vaxt Şuşada üç nəfər bilirdik: Niyaz müəllim, mən və bir də Vaqif Əmrahov- o vaxtkı Ali Sovetin Şuşadan olan deputatı, 92№-li tikinti idarəsinin suvaqçı-rəngsazı.

Beləliklə, Dağlıq Qarabağ məsələsinin sülh yolu ilə həllinin ən rahat variantının qarşısı o vaxt Ə.Vəzirov tərəfindən sərtliklə alındı.

Ermənistandan qovulan soydaşlarımızın Şuşadan köçürülməsinin qarşısını almaq üçün apardığımız işlər də Vəzirovun müqavimətinə rast gəldi. O vaxtkı obkomun birinci katibi Henrix Poqosyana «dostyana» verdiyi sözə əməl edərək o, azərbaycanlı qaçqınları Dağlıq Qarabağda yerləşdirmək əvəzinə, onları aran rayonlarına dağıtdı. Halbuki, onlar Dağıq Qarabağda qalmalı, burada yaşamaqla erməniləri sıxışdırmalı, həm də

vilayətin milli demoqrafik tərkibinin azərbaycanlıların xeyrinə dəyişməsinə yardımçı olmalıydılar.

***<u>Siz əvvəldən axıradək hadisələrin içində olubsunuz, daha nə deyə bilərsiniz?</u>***

-Şuşadakı real vəziyyətin dövlət orqanlarına dürüst çatdırılmasında mənim də xidmətlərim az olmayıb. Müxtəlif ünvanlara göndərilən məlumat, teleqram, müraciətləri özüm hazırlayır, mövcud vəziyyət dəyişməzsə, Şuşanın əldən gedəcəyini dəfələrlə o zamankı respublika rəhbərliyinə çatdırır, imdad və kömək istəyirdim. Lakin faydası olmurdu. 1992-ci ilin mart ayındakı Ali Sovetin sessiyasının Rəyasət Heyətinə Şuşa İcra Hakimiyyəti adından göndərdiyim teleqrama Rəhim Qazıyev «şuşalılar hay-küy salırlar. Şuşa getsə başıma güllə çaxaram.» demişdi. Beləcə, yiyəsizlik ucbatından, respublika rəhbərliyinin Şuşanı saxlamaq istəyi olmadığından, Şuşa da getdi, ətraf rayonlar da.

Şuşanın işğalından sonra da məsələnin sülh yolu ilə həlli istiqamətində gedən proseslərdə iştirak etmişəm. Azərbaycandakı ABŞ, Rusiya, Fransa, Almaniya, Qazaxıstan, Türkiyə səfirliklərində olub, münaqişənin və erməniliyin mahiyyəti barədə səfirlərə ətraflı məlumatlar vermişəm. 1994-cü ilin iyun ayının 29-da Avropa Şurasında şuranın üzvü olmayan dövlətlərlə iş üzrə komitənin iclasında erməniləri ifşa edən faktlarla sərt çıxışım olub. Azərbaycanın Avropa Şurasına qəbulu ərəfəsində Milli Məclisin spikeri M. Ələsgərovun başçılıq etdiyi nümayəndə heyətinin tərkibində 1999-cu ilin may ayında Avropa Şurasının iclasında iştirak etmişəm. 2001-ci ilin noyabrında Berlin şəhərində Fridrix Ebert fondunun Qafqazda münaqişələrə dair təşkil etdiyi konfransın işində iştirakçı kimi sərt çıxışım olmuşdur. Və nəhayət, 2002-ci ilin iyun ayında Azərbaycanın Avropa Şurasındakı nümayəndə heyətinin rəhbəri cənab İlham Əliyevin təşəbbüsü ilə nümayəndə heyətinin tərkibində yenidən Avropa Şurasında olmuş, şuranın rəhbər qurumları, komitə və komissiya sədrləri ilə görüşlərdə iştirak etmiş, Ermənistanın Azərbaycana

qarşı təcavüzünün səbəb və nəticələri haqqında onlara obyektiv məlumatlar vermiş, mətbuat konfransında bəyanatla çıxış etmişəm.

***Mən çıxışınızın tam mətninə televiziyada qulaq asmışam, Qarabağın həsrətini çəkənlərin ürəyindən keçənləri yığcam , özü də kəskin iradlarla söylədiniz. Oradakı çıxışınızla çox adam müəyyən səbəblər görə tanış deyil, o fikirləriniz oxucular üçün də maraqlı olardı.***

-- İlk növbədə, Dağlıq Qarabağla əlaqədar Azərbaycan – Ermənistan münaqişəsinin Cənubi Qafqazda sabitliyin pozulmasını, Azərbaycanın Dağlıq Qarabağında Ermənistanın törətdiyi etnik-seperatçılıq hərəkatın regionda terrorizmə təkan verdiyini və bu problemin bütün dünyanın probleminə çevrildiyini, təcavüz nəticəsində DQ-dan başqa onunla həmsərhəd olan yeddi rayonun da işğal edildiyini, işğal altındakı ərazilərdəki yaşayış məntəqələrinin xarabazara çevrildiyini, tarix və mədəniyyət abidələrinin dağıdılaraq erməniləşdirildiyini, ərazi iddialarına əsaslanan bu müharibənin münaqişəyə qədər möhkəm dostluq əlaqələri olan hər iki xalqa məşəqqət və faciələr gətirdiyini bildirdim. On dörd ildir ki, davam edən bu münaqişənin sülh yolu ilə aradan qaldırılması üçün dünya ictimaiyyətinin göstərdiyi səylərin hələlik heç bir nəticə vermədiyini, BMT Təhlükəsizlik Şurasının torpaqlarımızın Ermənistan tərəfindən işğalı faktını müzakirə etməsinə baxmayaraq, Ermənistanı işğalçı adlandırmamasını və bu məsələ ilə əlaqədar qəbul edilən qətnamələrin havadan asılı qaldığını diqqətə çatdırdım. Həmçinin Ermənistana təsir göstərməkdə çətinlik çəkən BMT kimi nüfuzlu bir təşkilatın məsələnin həllini ATƏT-in üstünə atmasını, ATƏT-in isə Minsk qrupu kimi bürokrat mahiyyətli qurum yaradaraq ona həvalə etməsini və bu günədək həmin qurumun heç bir müsbət nəticəyə nail olmadığını, formal fəaliyyət göstərdiyini, bu qurumda təmsil olunan Fransa və Rusiya dövlətlərindən olan həmsədirlərin ermənilərin maraqlarına üstünlük verdiklərini vurğuladı...

***<u>Çıxış yolunu bəs nədə görürsünüz?</u>***

-- Çıxış yolunu 2001-ci ilin sentyabr ayında ANS televiziyasının «Nəzər nöqtəsi» verilişində söylədiyim fikirlərdə görürəm. Bu gün də həmin fikirdəyəm. Şuşa həsrəti, Şuşa nisgili bizi qırdı…

***<u>Vaqif müəllim, Sizin fikirlərinizə əlavə olaraq, yeri gəlmişkən. 2002-ci il sentyabrın 10-da Avropa Şurası Parlament Assambleyasının Monitorinq Komitəsinin Parisdə keçirilən iclasının Azərbaycan üçün nəticələrinin uğurlu olduğunu bildirmək istəyirəm:</u>***

***Məsələ ilə əlaqədar «Exo» qəzetinin 11 sentyabr və «Azərbaycan» qəzetinin 12 sentyabr tarixli saylarındakı informasiyada qeyd edilir ki, AŞ PA –nın Azərbaycan üzrə Monitorinq qrupunun məruzəsi dinlənilib. Bu tədbirdə ölkəmizi Milli Məclisin Beynəlxalq münasibətlər və parlamentlərarası əlaqələr komissiyasının sədri Səməd Seyidov və deputat Naira Şaxtaxtinskaya təmsil ediblər. Komitənin toplantısında Azərbaycan üzrə Moritorinq qrupunun həmsədrləri Andreas Qross və Martines Kassanın məruzələri dinlənilib. Onlar «ənənələrini» pozaraq bu dəfə obyektiv fikirlər söyləyiblər: ümumilikdə 24 avqust referendumu, ölkədə etnik azlıqların vəziyyəti, «siyasi məhbus» məsələsi, Dağlıq Qarabağın Ermənistan tərəfindən işğal olunması problemlərini diqqətə çatdırıblar. Moritorinq Komitəsinin üç saat davam edən toplantısında müzakirələr Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi ətrafında davam edib. Avropa Şurasında Ermənistanın Azərbaycan ərazisini işğal etməsi bir neçə dəfə vurğulanıb və Dağlıq Qarabağın Azərbaycan ərazisi olduğu, işğala məruz qaldığı göstərilib, avqustun11-də DQ separatçıları tərəfindən keçirilən «prezident seçkiləri»nə Avropa Şurasının baş katibi Valter Şvimmer səviyyəsində sərt reaksiya verilib. Əlbəttə, burada ilk növbədə, Azərbaycan nümayəndə heyətinin rəhbəri, Milli***

***Məclisin deputatı cənab İlham Əliyevin fəaliyyətini xüsusilə qeyd etmək lazımdır.***

***2003-cü ilin 27 yanvarında İlham Əliyevin bu mötəbər Şuranın qış sessiyasında sədr muavini və buro üzvü seçilməsi xalqımız tərəfindən böyük rəğbətlə qarşılanmışdır.***

## QƏLƏMİNİ SÜNGÜ EDƏN ƏLİ MAHMUD



Əli Mahmud (Mahmudov Əli Əbülfət oğlu) 1948-ci ildə Laçın rayonunun Fərraş kəndində anadan olub. Şuşa şəhər 1 saylı orta məktəbi bitirib. ADU-nun filologiya fakültəsində oxuyub. N. Tusi adına Azərbaycan Dövlət Pedaqoji Universitetini fərqlənmə diplomu ilə bitirib. Əmək fəaliyyətinə «Şuşa» rayon qəzetində ədəbi işçi kimi başlayıb. Sonralar həmin qəzetin məsul katibi, redaktor müavini işləyib. 1990-cı ilin iyul ayından «Qarabağ» qəzetində baş redaktorun müavinidir. Azərbaycan Jurnalistlər Birliyinin üzvüdür. Şair-publisist kimi Qarabağ mövzusunda yazdığı «Qarabağda talan var» kitabına, müxtəlif mətbuat səhifələrində çap etdirdiyi yazılara görə «Dan ulduzu», «Məmməd Əsədov» adına mükafatların laureatı, neçə-neçə kitabların redaktorudur.

Qarabağ hadisələri – Ermənistanın Azərbaycana torpaq iddiası, işğalçılıq müharibəsi başlanan gündən qələmini süngüyə çevirmiş, rus imperiyasının xalqımıza qarşı ədalətsiz siyasətini, ermənilərin faşist xislətini ifşa etmiş, düşmənlərin təqiblərinə məruz qalmışdır. Dağlıq Qarabağ Muxtar Vilayətində qanunsuz yaradılmış Xüsusi İdarəetmə Komitəsini, onun sədri, sırf ermənipərəst, xalqımızın qatı düşməni Arkadi Volskini ilk dəfə ifşa etmiş, onun törətdiyi əməlləri, Dağlıq Qarabağın Ermənistana verilməsi istiqamətində yeritdiyi xəyanətkar siyasəti «Azadlıq» radiosuna verdiyi müsahibələrdə dünyaya yaymışdır.

Hələ 1988-89-cu illərdə o, A. Volskini Moskva ilə Dağlıq Qarabağ erməniləri, Daşnakutyunun bir qolu olan «Krunk» təşkilatı arasında gizli siyasi körpü adlandırmışdır. Müxtəlif

iclaslarda, mitinqlərdə Volskinin Qarabağ rayonlarından SSRİ Ali Sovetinə deputat seçilməsinə qarşı çıxmış, onu siyasi fitnəkar, Azərbaycan xalqının düşməni elan etmişdir.

Təsadüfi deyil ki, Volskinin ardınca Dağlıq Qarabağa göndərilmiş Azərbaycan KP MK-nən ikinci katibi V. Polyaniçkonun da iç üzünü ilk dəfə Əli Mahmud açmışdır. Heç yadımdan çıxmaz . V. Polyaniçko DQMV üzrə Təşkilat Komitəsinin sədri kimi ilk iclasını Şuşa Rayon Partiya Komitəsinin plenum zalında keçiridi. Özünü Azərbaycanın mütləq hakimi kimi aparan «Batya» ləqəbli general elə ilk iclasda Qarabağ problemini həll etmək üçün gəlmədiyini hiss etdirdi. Çıxışında vilayətin kənd təsərrüfatında ciddi geriliklər yarandığını, qışlamanın pis keçdiyini, ət, süd planlarının ödənilməməsini söylədi. Həmin iclasda Əli Mahmud ayağa duraraq onun sözünü yarımçıq kəsdi:

--Belə çıxır ki, Siz və Sizin Təşkilat Komitəniz Arkadi Volskidən və onun Xüsusi İdarəetmə Komitəsindən heç nə ilə fərqlənməyəcəksiniz. Vilayətdə erməni ekstremistləri Azərbaycan Dövlətinin Konstitusiyasını pozur, terror aktları törədir, itaətsizlik göstərir, azərbaycanlılar yaşayan kənd və qəsəbələri blokadada saxlayır, günahsız insanları qətlə yetirirlər. Siz isə eynən Volski kimi danışırsınız. Yadınızda saxlayın ki, burada , Qarabağda rus canişinlərinin ikili siyasət yeritməsinə daha imkan verilməyəcək…

Əli Mahmudun çıxışını həmin məclisin iştirakçısı Leyla Yunusova tərcümə edirdi. Lakin tərcümə zamanı bəzi sərt ifadələri yumşaldırdı. Bunu hiss edən Əli Mahmud tərcüməçi xanıma əhəmiyyət vermədən rus dilində danışdı. Zala sükut çökmüşdü. Polyaniçkonun qəzəbdən dodaqları titrəyirdi. Yumruqlarını düyünləyib stola çırpdı:

***--Mən sənin üçün sadəcə Polyaniçko deyiləm. Azərbaycan KP MK-nın ikinci katibi kimi Sənə həddini tanıdacağam…***

Xatırladım ki, V. Polyaniçkonun Dağlıq Qarabağda yeritdiyi ermənipərəst siyasət 1991-ci ildə Əli Mahmudun redaktor

müavini işlədiyi «Qarabağ» qəzetinin 21 noyabr tarixli sayında bütünlüklə ifşa olundu. Qəzetin yaradıcı kollektivi bəyanət verərək Təşkilat Komitəsinin orqanı olmaqdan imtina etdi, belə bir qrumu tanımayacağını bildirdi.

Yaxın vaxtların söhbətidir. Jurnalist dostumla başımıza gələn faciələrdən danışdıq. Sonra ona «Şuşada nəyin qaldı?» sualını verdim. Əli Mahmud cavabında bunları söylədi:

- Ziyəddin müəllim, bu üç sözlük suala Şuşa işğal olunandan bəri cavab verməkdən nə bezmişəm, nə də yorulmuşam. Ona görə ki, bu suala hər dəfə cavb verəndə xəyalən Şuşanı qarış-qarış gəzir, özümü onun müdrik, ağayana, baməzə adamlarının əhatəsində hiss edi, toy-büsatlı, qonaq-qaralı günlərini yenidən yaşayıram.

Şuşa Allahın Azərbaycan xalqına bəxş etdiyi əvəzsiz nemət, ucalıq, məğlubedilməzlik simvolu idi. Qəribə inanclar, qəribə andlar vardı. Günəşə, aya, ulduza, isti saca, axar suya, sökülən dan yerinə, atın yal-muradına, işığa and içənlərin sözünə şübhə yeri qalmazdı. «Səni şahmar ilan vursun» qarğışının mənasını sonralar anlamışdım, öyrənmişdim ki, o ilan zəhərsizdir.

Böyük sənət fədailərindən tutmuş sadə şəhər sakinlərinə qədər hamının ləqəbi, ayaması vardı. Keçəçi Məhəmməd, Xarrat Qulu, Xan Əmi, Bülbül, Malıbıyli Həmid, Xanlıq Muxtar, Dəmirçi Kamal, Demi Kazım, Dağ İsmayıl və sair. 1973-cü ildə «Şuşa» rayon qəzetində ilk böyük yazım Xan Şuşinski ilə «Axşam üstü qoy uzaqdan havalansın Xanın səsi» adlı müsahibəmdə Şuşada daha çox sənət korifeylərinin yetişməsi sirrini soruşmuşdum. Cavabını indi də unuda bilmirəm. «Kirsin təmiz havası Daşaltı dərəsi boyunca, Qırxqızın, Sarıbabanın loğman havası isə Xəlfəli dərəsi aşağı, Aran Qarabağa doğru yayılır. Əsgərandan üzü yuxarı əsən küləklər həmin dağların bu möcüzə məlhəmini qarışdırıb Şuşaya qaytarır. Bax, məlahətli səsin, təkrarolunmaz zəngulələrin, şirinliyin, tamın, duzun sirri bundadır».

Dağlar şəhərində abidələrin dəqiq sayını bu günə kimi öyrənmək heç kəsə nəsib olmayıb. Təəssüf ki, onların vur-tut 250

ədədi Dövlət tərəfindən qorunurdu. Bu siyahıya Allahın, xeyirxah insanların müqəddəsliyini qoruyub saxlamış Aşağı və Yuxarı Gövhər Ağa məscidləri, bünövrəsi qurğuşunla bərkidilmiş, Hacıqulunun malikanəsi, ismətli bir Azərbaycan anasının – Xan qızı Natəvanın tikdirdiyi imarətlər, Şərqin və Qərbin dəyərli abidələrindən sayılan məhəllə bulaqları, «Gəncə» və «İrəvan» qapıları, heç vaxt düşmənin üzünə açılmayan qalalar, xan sarayları və neçə-neçə başqaları daxildi.

Az qala bütün qədim evlər muzeyləşmiş, ziyarət ocaqlarına çevrilmişdi. Q. Zakirin, Üzeyirin, Natəvanın, Bülbülün. Xanın, Mir Möhsün Nəvvabın, Qurban Primovun, Rəşidin, Niyazinin, Sadıqcanın, Süleyman Ələsgərovun, daha neçə-neçə ünlü sənət dahilərinin doğulduqları evlər, M. P. Vaqifin dərs dediyi məscid-mədrəsə şuşalıların göz bəbəyinə ortaq olmuşdu. Bülbülün ev muzeyi yaradılanda həyətdəki tut ağacı bərpa işlərinə mane olduğundan kəsilmək təhlükəsi yaranmışdı. Əsasına dirəklənə-dirəklənə gəlmiş nurani qoca, «namərdlik etməyin, əl saxlayın, Bülbül uşaqlığını bu ağacın qol-budağında keçirib»,- deyə ağacı abidə elan etdi. O ağac da Şuşanın son günlərinə qədər yaşadı…

Dünya şöhrətli xalçaçı Lətif Kərimovun şəxsi təşəbbüsü ilə yaradılmış xalça muzeyində nənələrimizin, qız-gəlinlərimizin əllərinin sığalı hopmuş, ilmələrin, naxışların dili ilə tariximiz yazılmış, milli ornamentlərimiz həkk edilmiş xalılarımız, xalçalarımız saxlanılırdı. 1982-ci ildə Şuşada, M. P. Vaqifin möhtəşəm məqbərəsinin açılışına gəlmiş möhtərəm H.Ə. Əliyevin iştirakı və bu sətirlərin müəllifinin təşəbbüsü ilə Mamayı məscidində poeziya evi qapılarını şer sevənlərin üzünə açmışdı…

Şuşa Allahın möcüzəsi idi. Qışın oğlan çağında, qarın qalınlığı qurşağa çatanda köynəklə gəzmək mümkün idi. İlin 365 günündən, bəlkə də 300- ü günəşli keçirdi. Sinoptiklərin məlumatını dinləməyə də ehtiyac qalmırdı. Günün qızmar çağında Bağrıqan dağının üstündə bircə əlçim bulud görünsəydi axşam üstü möhkəm yağış yağacağını uşaqdan böyüyə hamı bilirdi. Topxana tərəfdən əsən küləyin yaz-yay aylarında dlu, payız-qış

aylarında qar-boran gətirəcəyinə heç kimdə şübhə qalmamışdı. Qırxqız tərəfdən əsən meh uzun müddət günəşli günlərdən xəbər verirdi. Kəkliklərin qaqqıltısını eşitmək istəyənlər «Dövlətbəy»ə düşür, «Xarı bülbül» gülünü görmək könlünə düşənlər «Ağzıyastı kaha»ya, «Üçmıx»a üz tuturdu Cıdır düzü yerli sakinlər, Azərbaycanın müxtəlif yerlərindən gəlmiş qonaqlar üçün seyrangah olsa da, ruslar üçün, özlərinin dediyi kimi, «vtrizvitel» rolunu oynayırdı.

Ünlü sənətçilərin hər birinin Şuşaya öz münasibəti var idi. Xan əmi «Güllü bağ»da oturub yaşıdları ilə söhbətləşməyə, Lətif Kərimov güllərin, çiçəklərin rənglərini seçməyə, necə açılıb-solmasını görməyə, Niyazi Daşaltı çayının zümzüməsini dinləməyə, xalq artisti Mehdi Məmmədov «Cıdır düzü»nün sıldırım qayalarını, səmasında qıy vuran qartallarını seyr etməyə, İlyas Əfəndiyev tarixi abidələri, Topxana meşəsini gözlərinə, yaddaşına köçürməyə üstünlük verərdi.

Aramızda yaş fərqinin çox olmasına baxmayaraq, Şuşada qaldığı müddətdə Lətif müəllimlə tez-tez görüşərdik. Azərbaycan, xüsusilə Qarabağ, Quba xalçalarının dünya muzeylərinin nadir incilərindən sayıldığını söyləyər, ermənilərin bu xalçaları adlarına çıxmaq cəhdlərini, onları Londonda, Parisdə necə ifşa etdiyini iftixar hissi ilə danışardı. Xalqımıza məxsus bir çeşnini onların ünvanına çıxacağı təqdirdə İrəvanın mərkəzində böyük villa, çoxlu mal-pul sahibi olacağı vəd olunmuşdu. Böyük vətəndaş, dəyərli sənətçi, bütün varlığı ilə xalqına, millətinə bağlı Lətif Kərimov isə hər dəfə əbədi və əzəli düşmənlərimizi məyus etmiş, arzularını gözlərində qoymuşdu. Lətif Kərimov uzun, ağ saçları, qartal baxışı, şux qaməti, səliqəli geyim-kecimi ilə hamının diqqətini çəkərdi. Amma dəbdəbəli qonaqlıqları xoşlamaz, çox adamla ünsiyyətdə olmazdı. Bir dəfə mənə dedi ki, sənin o «Xalı düşübyadıma» şerini oxuyandan sonra elə bilirəm ki, ikimiz də eyni peşənin sahibiyik.Yaxşı demisən, ha:

*Xalı düşüb yadıma, anam toxuyan xalı.*
*Çəmən kimi bəzəkli, ətir qoxuyan xalı.*

*Gülüm, öz əllərinlə mənə bir xalı toxu,*
*Əriclərin üstündə Göyçə mahalı toxu,*
*Qazax mahalı toxu. Çeşnisini deyərəm,*
*Qılınc, qalxan, tar, qaval.*
*«Cəngi», «Yallı» oyunu, bir də qayada qartal...*

***- Oğul, bizim xalıların ipi güllərin, çiçəklərin rəngilə boyanıb. Çeşniləri tariximizin ipə-sapa düzülmüş sətirləridi. Mən dünyanın çox ölkələrini gəzmiş, əsrarəngiz təbiət mənzərələrini görmüşəm. Şuşanın təbiəti, gülü, çiçəyi təkrarsızdı, rəngləri daha şux və parlaqdı. Yadına sal, başqa yerlərdə güllər başlarını aşağı əyir. Şuşada isə hamısı günəşə, göyə doğru boylanır. Rənglərini Günəşin gözündən aldıqları üçün də çürümürlər.***

***-Altmışıncı illərin sonlarına qədər şuşanı küçələrində gecələr elektrik lampalarına ehtiyac duyulmurdu. Ağ mərmər döşənmiş yollar, səkilər yağışdan sonra zil qaranlıqda belə işıq saçırdı. Bu işıq isə həmişə ermənilərin gözünü qamaşdırmışdı. Odur ki, yarasa xisləti ilə ona qənim kəsilmişdilər. Neçə-neçə fatehlərin , Ağa Məhəmməd Şah Qacarın da bir daşına qıyıb əl qaldırmadığı Şuşa ermənilərin göz dağına çevrilmişdi. Ötən əsrin əvvəllərində dağların zümrüd tacını yandırmaqla ürəkləri soyumamış, onu donuz hərisliyi ilə söküb dağıtmağa başlamışdılar.***

***Yaxşı yadımdadı, 60-cı illərdə gecələr aya, ulduzlara meydan oxuyan həmin o ağ mərmər daşları hamının gözləri qarşısında söküb Xankəndinə apardılar və Stepanakert Dövlət Dram Teatrının binasını tikdilər. Bazarbaşı – Meydan arası daş sütunlu tağbənd dükanlar da sökülərək ermənilərin yaşadıqları kəndlərə, qəsəbələrə daşındı. Nəhayət,1960-cı ildən sonra Heydər Əliyev zəhmi onların iplərini çəkdi…***



***Şuşa bulaqlarıyla, daşlarıyla, qalaları, bürcləri, çiçəkləri, otları, adamları ilə abidələr şəhəri idi. Faşist xislətli ermənilər işğalçı rus ordusunun köməyi ilə 1992-ci ilin 8 mayında Şuşanı işğal edəndə ilk güllələrini dinc insanlarla yanaşı, dilsiz abidələrə də tuşladılar. İndi bütün bəşəriyyət onların güllələdiyi abidələri – Üzeyirin, Bülbülün, Natəvanın heykəllərini görməli, erməni varlığının bəşər sivilizasiyasına hansı bəlaları gətirdiyini yəqinləşdirməlidir.***

## ARZUSU ŞUŞANI AZAD GÖRMƏK İDİ…

O, tarixən məğlubedilməz, mərdlik, mətanət və dəyanət şəhəri olan, dünyaya karifeylər verən Şuşanın sakinlərinin taleyinə köçkünlük, didərginlik yazılacağını ağlına da belə gətirmirdi. Söhbət Qarabağ hadisələrinin başlandığı ilk günlərdən xalqının müdafiəsinə qalxmış, lakin erməni millətçilərinin yeritdiyi bədnam siyasətinə biganə yanaşan,
proseslərdən lazımi nəticələr çıxarmayan respublika rəhbərlərinə vilayətdə gedən ictimai-siyasi proseslər barədə bir ağsaqqal kimi qəbullarında olarkən məlumatlar verməyi özünə borc bilən gözəl insan, istedadlı mütəxəssis, el ağsaqqalı Məhərrəm Ağaşirin oğlu Quliyevdən gedir…

***M. A. Quliyev 1924-cü ilin isti yay aylarında Şuşanın Zarıslı kəndində anadan olub. Atasını erkən itirdiyindən həyatı əzab-əziyyətlərdə keçib. Orta məktəbi bitirəndən sonra M. H. Vəzirov adına Şuşa Kənd Təsərrüfatı Texnikumunda təhsil alıb, tələbə həmkarlar təşkilatına rəhbərlik edib. Ağdam***

***Müəllimlər İnstitutunda, daha sonralar Moskva Kooperativ İnstitutunun Vakı filialında təhsilini davam etdirib. Uzun illər rayonun rəhbər partiya, sovet və təsərrüfat orqanlarında çalışıb. Öz doğma kəndində kolxoz sədri,uzun müddət Şuşa rayon istehlak cəmiyyətində və kurort ticarətində rəhbə və digər vəzifələrdə çalışıb. Özünün səmimiliyi və işgüzarlığı ilə ictimaiyyətin dərin hörmətini qazanmışdı. Qarabağda və eləcə də respublikada tanınıb. Əməyi «Böyük Vətən müharibəsi illərində rəşadətli əməyə görə» medalına, bir çox başqa medallara, fəxri fərmanlara layiq görülüb. Ömrünün sonunadək Şuşa Rayon İH-də baş iqtisadçı işləyib, rayon ağsaqqallar şurasına rəhbərlik edib.***

Alovlu vətənpərvər Şuşanın mühasirədə olduğu 1988-1992-ci illərdə şəhərin cavanları, rəhbərləri, döyüşçüləri ilə bərabər gecə-gündüz Şuşanın müdafiəsi, əhalinin təhlükəsizliyinin təmin edilməsi uğrunda mübarizədə fəal iştirak etmişdir. Atalar yaxşı deyib, ot kök üstə bitər. Hələ 1905-06-cı illərdə Şuşanın Zarıslı kəndində baş vermiş kəndli hərəkatına başçılıq etmiş və ermənilərə qənim kəsilmiş yeddi qardaş olan Babalarını daşnaqların şikayəti ilə rus generalı (bu barədə topluda geniş yazılıb ) Sibirə sürgün etmişdir. Babası qaçaq Nəcəfqulu Şuşa-Laçın bölgəsində o zamanlar lap məşhur olmuş., özü də yüz ildən artıq ömür sürmüşdür. Son vaxtlaradək Tərtərdə yaşamış, dövrünün ən yaxşı sənəti sayılan «boyaqçı» Lətif kişi kimi tanınan əmisi də inqilabdan qabaq erməni və rus qoşunları ilə atışmada bir ayağını və gözünü itirmişdi.

Məhərrəm Quliyev də babalarınınənənəsini davam etdirərək haqq-ədalət uğrunda mübarizə aparırdı. O, hadisələrin ağır vaxtlarında bir neçə dəfə Bakıda Ə. Vəzirovun və digər rəhbər işçilərin yanında olarkən vilayətin azərbaycanlılar yaşayan kənd və qəsəbələrində, o cümlədən də Şuşa şəhərində əli yalın, silahsız əhaliyə mərkəzdən güclüköməklik edilməsini və müdafiə olmasa ciddi vəziyyət yaranacağını, yolların hər tərəfdən bağlanacağını xüsusi vurğulamışdı. Xankəndindən ermənilərin bir günün ərzində

on altı mindən çox azərbaycanlını çıxarıb evsiz-eşiksiz qoyduğu günlərdə rayon ictimaiyyəti ilə birgə keçirilən yığıncaqlarda İttifaqın və respublikanın səlahiyyətli nümayəndələrinin qarşısında problemin həlli üçün səriştəli, səmərəli məsləhət-tövsiyələrlə çıxışlar edir, vəziyyətdən çıxmağın ən məqbul variantlarını faktlar əsasında şərh etməkdə hamıdan çox fəallıq gostərirdi. Hətta bizim başsız, uzağı görməyən, siyasəti və diplomatiyanı dərk etməkdə heç bir səriştəsi, məntiqi təfəkkürü olmayan rəhbərlərimizin ermənilərin vasitəsi ilə Moskvadan göstərilən təzyiqlərə kor-koranə əməl etmələri ucbatından Dağlıq Qarabağın ərazisində yerləşən azərbaycanlılırın sıxışdırılaraq doğma dədə-baba yurdlarından uzaqlaşdırılmasının qarşısının nə üçün alınmadığı barədə Şuşa mədəniyyət evində keçirilən müşavirələrdə İttifaqdan və respublikadan gələn rəhbərlərə ciddi iradlarını bildirirdi. Heç yadımdan çıxmır. Bir dəfə , daha doğrusu, 1990-cı ilin yanvar ayının ilk ongünlüyündə MK katibi V. P. Polyaniçko nazirlərin, baş idarələrin rəhbərlərinin , Dağlıq Qarabağın azərbaycanlılar yaşayan şəhər, qəsəbə və kəndərinin nümayəndələrinin iştirakı ilə müşavirə keçirirdi. Respublikanın Aqrar Sənaye Komitəsinə rəhbərlik edən M. Abdullayevin verdiyi məlumatlara, yaxasını bu işlərdən kənarlaşdırmaq üçün keçmiş rəhbərliyin ünvanına söylədiyi üstüörtülü fikirlərə qəti etirazını bildirərək dedi:

*-Əvvəla, nə «onlara», «bunlara» deyirsiniz, konkret olaraq «ermənilər» və «azərbaycanlılar» demək lazımdır, nədən ehtiyat edirsiniz... Deyirsiniz ki, sizdən əvvəlkilər yaxşı işləməyib. Bu çox yanlış, yerində deyilməyən fikirdir. Respublika 70-80-ci illər ərzində başdan-başa öz simasını dəyişmiş, xalq təsərrüfatının bütün sahələri üzrə uğurlarına görə qabaqcıllar sırasına çıxmışdı. Erməni-müsəlman məsələsi də yox idi, baş qaldırıb çınqırını çəkən də. Həqiqəti danışmaq, kimliyindən asılı olmayaraq, adama böyüklük və hörmət gətirər. Siz MK bürosunun tərkibində olan vəzifəli şəxssiniz, deyirsiniz ki,*

*siyasətlə məşğul olmursunuz... Belə danışmağa heç birimizin haqqımız yoxdur..*

Məhərrəm Quliyev ürəyindən keçənləri deyib qurtarmamış yığıncağa sədirlik edən V. Polyaniçkodan Xocalı Şəhər İcra Hakimiyyətinin başçısı (indi Milli Məclisin üxvüdür) Elman Məmmədov və onun ardınca mən söz alıb tutarlı faktlarla onun fikirlərinə tərəfdar çıxdıq. Çıxışlarımız zalda əyləşənlərin ürəyincə olduğundan alqışlarla qarşılandı. Vaxtilə Respublika Nazirlər Sovetində rəhbər vəzifələrdə işləyən, Sovxozlar Birliyinin Sədri İ. R. Əbilov tədbirin sonunda foyedə hər üçümüzün əlimizi sıxdı, əhsən dedi….

M. Quliyev heç kəsdən qorxub-çəkinməyən bir insan idi. Sözü adamın gözünün içinə deyən, nöqsanlarla barışan deyildi. A. Volskinin rəhbərliyi ilə fəaliyyət göstərən Dağlıq Qarabağı Xüsusi İdarəetmə Komitəsinin bir çox üzvləri ilə Şuşa əhalisinin görüşləri zamanı onların Volski də başda olmaqla yarıtmaz işlədiklərini, ermənilərin mövqeyində dayandıqlarını faktlarla onların nəzərəinə çatdırmasını, onları ədalətli olmağa çağırmasını bu görüşün iştirakçısı olanlar indi də yaxşı xatırlayırlar.

Məhərrəm kişi Moskvadan və Bakıdan gələn məsul nümayəndələrilə keçirilən görüşlərdə mütamadi iştirak etmiş, onların xalqın mənafeyinin əksinə apardıqları məsələlərə dərhal öz etirazını bildirmiş və təkliflər irəli sürmüşdü.

Onun bir ağsaqqal kimi qeyrətli şuşalılarla bərabər Şəkiyə məşhur Əhmədiyyə Cəbrayılovun qəhrəmancasına həlak olmuş oğlu, Milli Qəhrəman Mikayıl cəbrayılovun cənazəsinin vertalyotla aparılmasında, dəfn mərasimindəki vətənpərvər çıxışını, Qanlı 20 Yanvar soyqırımının 7-ci günündə Bakıya 30 nəfər nümayəndə heyətilə səfər etməsi, 1991-ci ilin 19 noyabrında daşnak yuvası Qarakəndə ermənilər tərəfindən vurulmuş vertalyotda həlak olanin tanınmış oğullarımızın cənazələrinin hadisə yerindən çıxarılmasında yaxından iştirakını, 1992-ci ilin 28 yanvarında Şuşa səmasında yenə ermənilər tərəfindən vurulmuş vertalyotda faciəli surətdə həlak olan 47 nəfər soydaşımızın yas

mərasimlərinin təşkilindəki iştirakı və bir çox bu kimi xalqın ağır günlərində göstərdiyi fəaliyyətlərini qədir bilən şuşalılar indi də yaxşı xatırlayırlar.

Qəlbdən çox kövrək bu insan xeyir-şərin yaraşığı idi. Məcburi köçkünlük dövründə də insanların qayğısına qalır, əlsiz-ayaqsızlara köməklik edir, əhalinin xeyir və şərində yaxından iştirak etməyi özünə mənəvi borc sayırdı. Bu barədə çox yazmaq olar. Məhərrəm Quliyev doğma şəhərin işğalından sonra Bakıda məskunlaşmışdı. Ailələrində bir-birinin ardınca baş verən hadisələr, istəkli həyat yoldaşı Qızbəs xanımın, onun ardınca oğlu Zeynalın həyat yoldaşının vaxtsız vəfatı, atasının adını daşıyan, Qarabağ müharibəsində ermənilərə qarşı vuruşmuş, hüquqşünaslığı fərqlənmə diplomu ilə bitirərək işə yenicə təyinat alan və yenicə ailə quran əziz qardaşı oğlu Ağaşirinin və onun həyat yoldaşı Aynurun faciəli vaxtsız ölümləri onu yaman sarsıtdı. Yeganə amalı Şuşanı azad görmək idi. Amansız ölüm onun arzusunu yarımçıq qoydu. Ürəyində Şuşa böyüklükdə bir həsrəti yaşada-yaşada 2001-ci ilin yazında qəflətən dünyasını dəyişdi. Onu müvəqqəti yaşadığı ərazinin yaxınlığındakı qəbristanlıqda böyük hörmət və ehtiramla təşkil edilən dəfn mərasimində iştirak edənlər haqqında xoş sözlər söyləməklə nəsillərə nümunə bir insanı ana torpağa tapşırdılar.

M. Quliyev həmişə böyük əminliklə vurğulayırdı ki, möhtərəm Prezidentimiz zati-aliləri cənab Heydər Əliyevin rəhbərliyi ilə qeyrətli Vətən oğullarının, qüdrətli Azərbaycan ordusunun gücü sayəsində Qarabağa – doğma yurd-yuvamıza qayıdacağıq və o gün uzaqda deyil..

## YURD HƏSRƏTİ İLƏ DÖYÜNƏ N ÜRƏK



*Qaçay Yediyar oğlu Məmmədov m*üqəddəs şəhərimiz Şuşanın və eləcə də Qarabağın sayılıb hörmət edilən, tanınmış şəxsiyyətlərindən, el ağsaqqallarından biridir. O, *qədim yaşayış məskənlərindən sayılan, vaxtı ilə qala olmuş, igidləri ilə məşhurlaşan, füsünkar gözəlliyə malik Zarıslı kəndində 1924-cü ilin baharında dünyaya göz açmışdır.* **O**nun *uşaqlıq və məktəb illəri* otuzuncu *illərin məşəqqətlərindən, Böyük Vətən*

*üharibəsinin yaratdığı çətinliklərdən keçmişdir.* Orta *məktəbi bitirdikdən* sonra *əvvəlcə o, 1941-1943-cü illərdə Şuşa kənd təsərrüfatı* texnikumunu *fərqlənmə* diplomu *ilə bitirərək*, *əmək fəaliyyətinə başlamış, ikillik Ağdam Müəllimlər İnstitutunda təhsilini* davam *etdirmiş, 1947-ci ildə Vilayət PK tərəfindən Gəncə şəhərindəki rəhbər* kadrlar *hazırlayan* ikiillik *məktəbə göndərilsmiş və oranı(1949) fərqlənmə* diplomu *ilə bitirərək,* rayona *qayıtmış, bir müddət təsərrüfat orqanlarında çalışmış və* daha sonra *maliyyə fakültəsində təhsilini* davam etdirmişdir.

*Bir neçə* ixtisasa *yiyələnən*, ensiklopedik *biliyə* malik olan *Qaçay Məmmədov əsasən 1950-ci illərdən başlayaraq Şuşada müxtəlif rəhbər vəzifələrdə işləmişdir.* Gənc kadr kimi irəli *çəkilmiş, doğma kəndində vaxtı ilə atası* Yediyar *kişinin də 30-*cu *illərdə* az *bir müddətdə* kolxoz *sədri işlədiyi Zarıslıda* kolxoz *sədri vəzifəsinə seçilmiş və* burada uzun *müddət işləmiş, kənd təsərrüfatının, xüsusən* cins *maldarlıq fermasının yaradılmasına, eləcə də atçılığın inkişafına xüsusi diqqət yetirmiş,* kolxozda *məhsuldarlığın yüksəldilməsi, əməkgününün artırılması, heyvandarlıq binalarının* tikintisi *sahəsində məqsədyönlü işlər*

*görmüşdür. Rəhbərlik etdiyi tsərrüfatda yetişdirilən və təlimləndirilən Qarabağ cinsli atlardan kino çəkilişlərində istifadə olunmuş, Əsgəran qalasında çəkilən «Koroğlu» filmində həmin atlardan da istifadə edilmişdir. O, kənd təsərrüfatında qazandığı nailiyyətlərə görə(1958) Ümumittifaq Kənd təsərrüfatı sərgisinin iştirakçısı olmuş, 1960-cı ildən rayonların birləşdirilməsi ilə əlaqədar başqa işə dəyişirilmiş və Şuşa maliyyə idarəsində əmək fəaliyyətini davam etdirmiş, əvvəlcə rayon maliyyə şöbəsində dövlət vergiləri üzrə rəis, sonra isə uzun illər Şuşa rayon maliyyə şöbəsinin müdiri, müxtəlif vaxtlarda rayon XNK -də fəaliyyət göstərmiş və şəhər Sovetinin sədri(ştatdankənar) vəzifələrində çalışmışdır. Rayonda maliyyə intizamının möhkəmləndirilməsinə, büdcə vəsaitindən təyinatı üzrə istifadə edilməsinə və onun şəffaflığına nail olmuş, bir çox maliyyə təlimatlarının təkmilləşdirilməsində yaxından iştirak etmiş, vilayətin və respublikanın ən yaxşı maliyyəçilərindən biri kimi tanınmışdır. Şuşanın xeyir-şərində gərəkli bir insan kimi tanınan, rayonun ictimai-siyasi həyatında fəal iştirak edən Qaçay Məmmədov xalqın dərin hörmət və məhəbbətini qazanmış, dəfələrlə yerli XD Sovetlərinə deputat seçilmişdir. O, həyatının mənasını həmişə doğma xalqına, Vətəninə xidmətdə görür. Onun bütün fəaliyyətləri nəzərə alınaraq əməyi yüksək qiymətləndirilmiş, Böyük Vətən müharibəsi dövründə «Rəşadətli əməyə görə» və bir sıra medallara, SSRİ və Azərbaycan Respublikası Maliyyə Nazirliklərinin, «Əlaçı maliyyə işçisi» döş nişanına, dəfələrlə həmin orqanların, həmçinin Ümumittifaq Həmkarlar İttifaqları Şurasının və onun Respublika Komitəsinin Fəxri Fərmanlarna layiq görülmüşdür.*

*O, həmişə haqqın, ədalətin tərəfdarı, əlsiz-ayaqsızların arxası, köməyi olmağı ilə başqalarından fərqlənərək gənc nəslə örnək olmuşdur. Onun yetişdirdiyi mühasib-iqtisadçılar, maliyyəçilər indi də idarə və müəssisələrdə çalışırlar.*

Qaçay müəllimi tanıdığım ilk gündən onu özümə ən yaxın, doğma bilmişəm. Müəyyən məsələlərdə onun köməkliyinə

arxalanmışam. Ən xoş günlərimin də, kədərli anlarımın da şəriki olub. Ömrümün mənalı 17 ilinin ən əziz, ən mötəbər dostu, yoldaşı, sirdaşı olan bu böyük insandan həyat dərsi götürmüşəm. Adətən hər gün fasilə vaxtı bir tikə də olsun bir-birimizdən ayrı çörək kəsməmişik. Ailəvi dostluğumuz əsil kişi dostluğu olub. Yaş fərqinə baxmayaraq, çoxsaylı dostlarımızla, (bir çoxu dünyasını dəyişmişdir), köçgünlük həyatını yaşayan, el arasında sayılıb seçilən, hörmətli, millətə gərəkli insanlarla xoş və mənalı günlər keçirmişik…

On ildən artıqdır ki, şuşalılar doğma yurd-yuvalarının isti qoynuna həsrətdirlər. Hərə bir tərəfdə didərgin həyatını yaşayır. Əziz dostum Qaçay kişinin xəstələndiyini bilib ona baş çəkməyə getdim. Onun ailəsi Bakının Nərimanov rayonu ərazisində məskunlaşıb. Şuşanın işğalından keçən bu müddət ərzində bir gün də olsun rahatlıq tapmayıb. Həmişə dədə-baba yurduna geri dönmək həsrətini içində yaşadır. Müvəqqəti ünvan seçdiyi mənzilin görkəmli yerində böyük öndər Mustafa Kamal Atatürkün portretini, Azərbaycanın və Türkiyənin dövlət bayraqlarını yanaşı asıblar. Bir tərəfdə isə Şuşanın tarixini və mədəniyyətini əks etdirən müxtəlif şəkillər və «Gövhər ağa » məscidinin şəkli divarı bəzəyir. O, Şuşanın güllü-çiçəkli yamaclarının ətrini sanki bu şəkillərdən alır. Qayıdış gününün yaxınlaşdığına inanır. Dünyada baş verən siyasi proseslər, ermənilərin get-gedə nüfuzlarını itirməsi barədə mətbuatdan, televiziyadan ümumiləşdirdiyi fikirlərini bizlə bölüşərək niskilli bir səslə söhbətini davam etdirir:

*Ömrümün 67 ilini Şuşada yaşamışam. Görkəmli ədəbiyyatşünas alim Yaşar Qarayevin dediyi kimi, «Uzun-uzun illər, qərinələr boyu Şuşa maddi nemətlərdən daha çox milli-mənəvi nemətlər «istehsalı» ilə məşğul olub: ozan və saz, poeziya və musiqi, sənət və sənətkar, Nəvvab və Natəvan, Vaqif və Üzeyir «istehsal» edib Şuşa!..» Şuşa Mir Mövsüm Nəvvabın, Ü Hacıbəylinin, Əhməd Ağaoğlunun, S. S. Axundovun, Ə. Haqverdiyevin, F. Əmirovun, Xan əminin, Bülbülün, Y.Vəzirin,*

*Mehmandarovların, S. Ələsgərovun, saymaqla qurtarmaq bilməyən görkəmli ictimai-siyasi xadimlərin vətənidir. Şəhərin 17 məhəlləsi, hər məhəllənin məscidi, hamamı və bulağı, ən əsası millətini, Vətənini canından əziz tutan qeyrətli kişiləri olub. Bu şəhərin insanları dar gündə bir-birinə arxa, dayaq olaraq düşmənləri dəf ediblər. Mən bir dünyagörmüş ağsaqqal kimi, Şuşa mənəviyyatının nə qədər yüksək olduğunu təkcə bir tarixi faktla göstərmək istərdim: şəhərin hər məhəlləsinin ağsaqqallarının müəyyən etdiyi ən kasıb, əlsiz-ayaqsız insanların evlərinə imkanlılar tərəfindən həftə-bazarlığı, yeyəcək-içəcək göndərilirmiş, lakin həmin bazarlığı aparan şəxsə tapşırırlarmış ki, kim tərəfindən göndərildiyini deməsin. Həmin şəxs apardığı məhsulları darvazanın içəri tərəfinə qoyaraq qayıdarmış. Bunu ona görə edərmişlər ki, sabah həmin imkansız adam bazarlıq göndərən şəxslə rastlaşanda xəcalətlənməsin, mənliyinə toxunmasın… Bax, budur Şuşa mənəviyyatı!*

*Nahaq yerə deməyiblər ki, köçən yurdun qədrini düşən yurdda bilərlər. Didərginlik həyatı Şuşanın doğrudan doğruya cənnət olduğunu bir daha təsdiqlədi. Şuşa xeyir-şəri, adət-ənənəsi, milliliyi ilə fərqlənərdi.*

*Lakin başqa bir məsələni vurğulamaq istərdim. Şəhərimizə sonralar gəlib yaşayan ermənilərin adət-ənənələrimizə, musiqimizə, Qarabağ ləhcəsində «türkün məsəli» ilə, atalar sözlərimizlə danışmaqla dilimizə maraq göstərmələri, yaltaqlıqları və başqa iyrənc hərəkətləri adi hal aldığından bəzi insanlarımızı çaşdırmış və bu da ermənilərin məkrli siyasətini duyamğa, dişlərinin valtında olan əfi ilan zəhərini görməyə imkan verməmişdir. Ümummilli bir ideologiyanın olmaması əsil hədəfin – düşmənin barmaqla göstərilməməsi, keçmiş erməni-müsəlman davalarının unudulması, ermənilərə geniş fəaliyyət meydanı verdi və nəticədə xalqımız erməni «zəhərinin» qurbanı oldu, dədə-baba torpaqlarımız əldən getdi. Lakin qəlbində bir millətçilik, türkçülük olan, erməni qırğınlarını unutmayan*

insanlar da az deyildi. Az qala bir əsir yaşamış mərhum atamın türk adı gələndə nədənsə qəhərlənməsinin, dəfələrlə iştirakçısı və şahidi olduğu erməni-müsəlman davasından mütəmadi olaraq yaxın adamların, hətta nəvələrinin də qarşısında yanıqlı söhbətlər açması, ermənlərə etibar etməyin, onlar bizim düşmənimizdir,- deyərək apardığı təbliğat, dünyanın, o cümlədən Rusiyanın tanınmış şəxsiyyətlərindən olan V. L Veliçkonun, A. S. Puşkinin, Nekrasovun, Leskovun, alman səyyahı Alfred Kertin, fransız səyyahı Qraf de Şolun və başqalarının öz əsərlərində erməni xislətindən, erməni psixologiyasından başqa xalqların milli mənafelərinə qarşı yönəldilən xəyanətkarlığı, fitnəkarlığı, məkr və bicliyi barəsində oxuduqlarımız bizim qəlbimizdə həmişə erməniyə qarşı daxili bir kin, nifrət hissi formalaşdırmışdı…

Qaçay Məmmədov sözünə davam edərək: Ulu babamızın da ermənilərlə münasibəti gərgin olmuşdur. Bizi türk millətçisi kimi tanıyıblar. Bu ideyanın daşıyıcısı olduğumuzdan nəslimizin başına olmazın müsibətlər açıblar. Əmim Umudvar Soltan bəyin ordusunda yüzbaşı olmuş, erməni qoşunlarının darmadağın edilməsində böyük şücaətlər göstərmişdir. İndi övladlarımdan biri əmim Umudvarın adını daşıyır. Babamın el arasında Sarı Hacı adı ilə məşhur olan əmisi oğlu da ermənilərə qarşı döyüşlərdə böyük qəhrəmanlıq göstərmiş və döyüşlərin birində həlak olmuşdur. Yaşlı insanlar və onların övladları Umudvarı və Sarı Hacını indi də xatırlayırlar. Əslində, ermənilərə qarşı mübarizə aparmağımızla və türklüyümüzlə fəxr etmişik. 1905-1906-cı illərdə ermənilərin çuğulluğu ilə Tiflisə şikayət yazmaları və əslində həmin illərdə Qarabağda baş verən ilk kəndli hərəkatına Zarıslıda başçılıq etdiklərinə, Qala Dərəsi kəndini yandıraraq ermənilərin bir çoxunu qılıncdan keçirdiklərinə və «Onverst» adlanan yerdə rus poçtunu gülləboran etdiklərinə görə yeddi qardaş olan babalarımız da bir çox şuşalılarla bərabər general Qoloşapovun əmri ilə Sibirə sürgün edilmiş və işgəncələrə məruz qalmışlar . Onlardan dördü

*qürbətdə canını tapşırsa da, üçü- Nəcəfqulu, Məhəmməd, Alməmməd min bir əziyyətlə geri dönmüş, mübarizələrini yenə də davam etdirmişdir. Çar qoşunları ilə döyüşdükləri və yaralandıqları barəsində Sovet dövründə təsdiq olunmuş sənədlərdən biri indi də qalmaqdadır. Həmin babaların nəvələrindən və mənimlə də əmi nəvələri olan, tanınmış el ağsaqqallarından biri, müxtəlif vəzifələrdə çalışmış mərhum Məhərrəm Ağaşirin oğlu Quliyev və Ağdamda Qara Muxtar adı ilə məşhur olan mərhum Məmədov Muxtar Heydər oğludur. Onların da, mənim də övladlarım Qarabağda erməni savaşında döyüşərək dədə-baba yoluna və ənənəsinə sadiq qalmışlar. Son illərin hadisələri gözləri qarşısında baş verdiyindən sanki tarix təkrar olunurmuş kimi babalarımızın taleyini yaşadıqlarından bütün acılı-ağrılı anlar yaddaşlarında möhkəm iz salıb. Ailə üzvlərimizdən iki nəfər Qarabağ müharibəsində şəhid olub. Nazimin, Əşrəfin taleyini yaşayanları unutmaq olarmı?!.*

*Uşaqların anası Diliş xanımı onların dərdi, Şuşanın həsrəti çarəsiz xəstəliyə salıb.*

*Qaçay kişi mənimlə, indi didərginlik həyatını yaşayan yaxın dostlarımız – İsa Muxtarov, Heydər Səmədov, Səttar Məhərrəmov, Xasay Əliyev, Nəriman Hacıyev, Əkbər Göyüşov, Fəxrəddin Məhərrəmov, qeyd edə bilmədiyim bir çox insanlar, hörmətli şuşalılarımız, yaxın qonşular haqda xoş sözlər danışaraq, uzun müddət duz-çörək kəsib sirdaş olduğu, dünyasını dəyişmiş ən yaxın dostlarından Məhərrəm Quliyev, İdris Məhərrəmov, Süleyman Ağakişiyev, müəllim Tofiq Əliyev, həkim Rzayev, Mikayıl Əsədov, Surxay Cahangirov, Ağa Kazımov, Hacı Əliyev, Seyid Cəfər, Mehdi Ağamirov, İsmayıl İsmayılov, prof. Nazim Axundov, Zahid Qurbanov, Xalid Aslanov, Mövsüm kişi, Xosrov kişi, Əhməd müəllim, Şahid Rəsulov, Sergey Arşinov və neçə-neçə adlı-sanlı kişiləri xatırlayaraq allahdan onlara rəhmət diləyirəm,- dedi.*

*O, özünü ələ alaraq sözünə davam etdi.* XX əsrdə dəfələrlə ermənilərin başımıza gətirdiyi müsibətlər, «Böyük Ermənistan»

yaratmaq üçün torpaqlarımızı işğal etmələri, yeritdikləri seperatçılıq siyasətləri indi dünyanın aparıcı dövlətləri tərəfindən pislənilir. Azərbaycan xalqının haqq işinə dəstək verməyə başlanılıb. Xalqımızın humanist adət-ənənələrə, geniş qəlbə malik olduğunu A. Düma, L. Tolstoy, M.Lermantov, B. Marilinski, Hans Əhməd Şimidt kimi görkəmli alim və yazıçıların öz əsərlərində təfərrüatı ilə tərənnüm etdiyini nəzərə alan dünyanın tərəqqipərvər adamları erməni siyasətinin əsl mahiyyətinin nədən ibarət olduğunu yüksək formlarda bəyan etməkdən çəkinmirlər. Əsirlər boyu babalarımızın bizim üçün qoruyub saxladığı, lakin indi seperatçı ermənilər tərəfindən işğal olunan Qarabağımızda, Zəngəzurumuzda , Dərələyəzimizdə, Göyçəmizdə tarixi abidələrimiz məhv edilib, yeraltı və yerüstü sərvətlərimiz talana-hərraca məruz qalıb. Hələ erməni millətçiləri bütün bunlardan utanmaq əvəzinə DQ məsələsinin həllində status və güzəştlər tələb edirlər. Onda biz də Qərbi Azərbaycanın azəri türklərinin min illər boyu yaşamış olduğu Göyçə mahalına, Zəngəzura, Vedibasara status verib soydaşlarımızın öz doğma yurdlarına qaytarılmasını və təhlükəsizliklərinin təmin olunmasını tələb etməliyik,- deyir Qaçay kişi. İttifaqın rəhbərlərinə vurduğu teleqrammaların surətini, ağsaqqallar adından olduqca kəskin ifadələrlə dolu məktublar, müraciətlər göndərdiyi, MK-dan, Moskva və Bakıdan Şuşaya ezam edilən hökumət nümayəndələrinə emosionallıqla ermənilərin günahkar olmaları, zaman-zaman onların qədim türk torpaqlarında erməni dövləti yaratmaqları barəsində həqiqəti sübuta yetirmək istəyi ilə etdiyi çıxışlar və digər sənədlər qovluğunu bir daha vərəqləyir. Bu vərəqlərin hər birində düşmənə qarşı sonsuz nifrət duyulur.

Torpaqlarımızı azad etmək üçün, Allah qismət edərsə, döyüşə hamıdan əvvəl övladlarımla birgə özüm gedəcəyəm,- deyir.

Ən böyük arzum müqəddəs Şuşamıza qovuşmaqdır. Biz nəyin bahasına olursa-olsun torpaqlarımızı düşmənlərimizdən

təmizləməliyik. Bunu bizdən babalarımızın, Pənah xanın, Üzeyir Bəyin, Nəvvabın və şəhidlərimizin ruhu tələb edir.

Tanrı millətimizi qorusun.



Yaşadığı cəmiyyətin xarekterindən asılı olmayaraq, insan həmişə öz ağlının və zəkasının gücü ilə möcüzələr yaratmış, zaman və məkan daxilində, ilk növbədə, təbiət üzərində öz sərbəstlik dairəsini tədricən, addım-addım genişləndirmiş, ictimai mühitin bütün çətinliklərinə sinə gərməklə, fəal həyat mövqeyini formalaşdırmağa nail olmuşdur.

Bizi əhatə edən aləmdə, ətraf mühitdə gördüyümüz, valeh və heyran olduğumuz nə varsa, hamısı insan ağlının, insan zəkasının

məhsuludur. İnsan zəkasının hüdudu yoxdur. Zəka nurunun şəfəqləri ilə insan öz daxili aləminə nəzər salır, özünə nəzarət edir, özünü düzgün qiymətləndirir. Ona görə də insan özünün əxlaqi məsuliyyətinin genişləndiyini və dərinləşdiyini həyatı tələbata çevrilməsi ilə böyüklüyünü sübut edir. Belə olduqda insanlar həyatlarını xoşbəxtliyə qovuşdura bilirlər. Xoşbəxtlik, ilk növbədə, həyat sevgisindən, yaşamaq eşqindən, ömürdən məmnunluqdan, özünə inanmaqdan, özünü güclü və qadir hiss etməkdən, daim mükəmməlləşməyə və daha xoş gələcəyə ümid bəsləməkdən ibarətdir. Həyatından, fəaliyyətindən, taleyin bəxş etdiyi uğurlardan məmnun olmaq, bir şəxsiyyət kimi geniş ictimaiyyətin hörmət və razılığını qazanmaq hər bir insana nəsib olan ən böyük bəxtiyarlıqdır. Bəxtiyrlıqla bağlı bu ifadələr bütövlükdə respublikanın hüdudlarından çox-çox uzaqlarda tanınan, Azərbaycanın beynəlxalq siyasətinin təbliğində, eyni zamanda, ictimai-siyasi və mədəni həyatında son dərəcə əvəzsiz rolu olan, milli ziyalı, əməkdar elm xadimi, Azərbaycan Respublikasının Prezidenti yanında DİA-nın rektoru, Dövlət Qulluğunu İdarəetmə Şurasının üzvü, professor Seyfəddin Mir Tağı oğlu Qəndilov cənablarına daha çox aiddir…

Tərtər rayonunda sadə zəhmətkeş ailəsində dünyaya göz açan Seyfəddin Qəndilov ailələrinin yaşayış yerini dəyişməsi ilə əlaqədar olaraq ilk təhsilinə Bakıda tanınmış məzunları ilə məşhur olan 190 saylı orta məktəbdə başlamış, atasının cəbhəyə səfərbər edilməsindən sonra 1941-ci ildə dədə-baba yurdu doğma Tərtərə qayıdaraq orta təhsilini burada almışdı. Mədəniyyət və incəsənət beşiyi Qarabağın ictimai mühiti gənc Seyfəddinin taleyində güclü mütaliəyə, elmə, şerə, sənətə, özfəaliyyətə hədsiz maraq yaratmışdı. Onun ifasında məktəbdə keçirilən tədbirlərdə eşidilən şerlər, poemalardan , dram əsərlərindən ifa olunan parçalar dinləyicilərin qəlbini riqqətə gətirməklə, ictimai işlərdə yüksək təşkilatçılığı, yaşıdları arasındakı nüfuzu, onları öz ətrafına toplamaq bacarığı, idman yarışlarında fərqlənməsi, humanitar fənlər üzrə fəaliyyət göstərən dərnəklərdə etdiyi çıxışları, gözəl və

rəvan nitqi, ədəbi dilin tələblərinə uyğun zəngin söz ehtiyatına malik olması gələcəyin böyük şəxsiyyəti olacağından xəbər verirdi…

O, orta məktəbi əla qiymətlərlə bitirib 1948-ci ildə sənədlərini ali məktəbə verir. Ədəbiyyatdan qəbul imtahanı zamanı suallara əhatəli, məntiqli, dolğun, elmi cəhətdən əsaslandırılmış cavabları görkəmli ədəbiyyatşünas alim Cəfər Xəndanı son dərəcə razı salması və ona tarix fakültəsinin fəlsəfə şöbəsinə keçməyi məsləhət görməsi qəlbində fərəh hissini daha da artırır. Universitetin qaynar həyatı, tələbəlik qayğıları, alimlərin auditoriyalarda diqqəti cəlb edən maraqlı mühazirələri, seminar məşğələləri, qayğılı günlər onu öz ağuşuna alır, keçirilən rəngarəng ictimai tədbirlər, ayrı-ayrı fakültələrdə oxuyan tələbələrlə yeni-yeni dostluq əlaqələrinin yaranması, yoldaşlıq görüşləri bir-birindən unudulmaz xatirələrin səlnaməsini yaradır. İllərlə birgə addımlayan Seyfəddin Qəndilov təhsil əlaçısı kimi tələbə yoldaşlarından fərqlənir, komsomol katibi seçilir, keçirilən tədbirlərdə fəal iştirakı fakültə dekanlığının , rektorluğun diqqətindən yayınmır, universiteti fərqlənmə diplomu ilə bitirən ictimaiyyətçi kimi tarix kafedrasında aspiranturada saxlanılır. «1926-1929-cu illərdə Azərbaycan rəhbərliyində gedən daxili siyasi mübarizələr, hakim partiya daxilində gedən siyasi proseslər» mövzusunda namizədlik dissertasiyası ilə əlaqədar Moskva, Tibilisi şəhərlərindəki partiya arxivlərində saxlanılan materiallar üzərində apardığı elmi axtarışlarını 1956-cı ildə uğurla başa çatdırır. Həyatında əvəzsiz rolu olan görkəmli elm xadimi, akademik Yusif Məmmədəliyevin məsləhət və qayğısı ilə işlədiyi kafedrada müəllim-assistent təyin edilir, eyni zamanda universitet komsomol komitəsinin katibi vəzifəsinə irəli çəkilir, daha doğrusu, ikiqat etimad göstərilir…

Seyfəddin müəllim 1958-ci ildə namizədlik dissertasiyasını müvəffəqiyyətlə müdafiə edərək tarix elmləri namizədi alimlik dərəcəsini alır, ictimai elmlər kafedralarının möhkəmləndirildiyi bir vaxtda APİ-nin rektoru Mehdixan Vəkilovun yuxarı orqanlar

qarşısında qaldırdığı məsələdən sonra bir neçə gənc alimlə birgə bu tədris ocağına dəyişirilir. Bir müddətdən sonra yenidən ADU-ya qayıdır, yenidən universitetin elmi, pedaqoji və ictimai həyatında fəal iştirakı, partiya bürosunun ideoloji işlər üzrə müavini seçilməsi, «Elmi əsərlər»inin ictimai elmlər seriyasının məsul katibi olması, burada üzərində tədqiqat apardığı doktorluq dissertasiyasının əsas fəsillərini nəşr etdirməsi, 1967-ci ildə doktorluq dissertasiyasını müvəffəqiyyətlə müdafiə etdikdən sonra mərkəzi mətbuatda, televiziya və radioda müntəzəm elmi-publisist mövzuda çıxışları, müsahibələri, beynəlxalq həyata dair siyasi icmalları, Sülh, Avropa Təhlükəsizliyi, Milli Azadlıq hərəkatları, Yaxın Şərq, Latın Amerikası və Afrika qitəsinin problemlərinə dair əsaslı ümumiləşdirmələri, həmçinin bu məsələlər haqqında Zaqafqaziya respublikalarında və uzaq xarici ölkələrdə, beynəlxalq elmi konfranslarda, simpoziumlarda çıxışları respublikada, həmçinin onun hüdudlarından kənarlarda «Seyfəddin Qəndilov fenomeni»ni formalaşdırır. İttifaqın aparıcı elm ocaqlarında, Berlinin, Varşavanın, Vratslavın, Qdanskın, Saroyevanın, Rostokun, Təbrizin və Tehranın məşhur universitetlərində oxuduğu mühazirələr Seyfəddin müəllimin beynəlxalq elmi ictimaiyyət arasında hörmət və nüfuzunu artır, xalqını ürəkdən sevən, onun adına başucalığı gətirən istedadlı bir alim olduğunu təsdiq edir. Onun elmi, ictimai-siyasi fəaliyyət dairəsinin istiqamətləri get-gedə genişlənir. Tədris, elmi-metodik vəsait və tövsiyələrin, zamanın tələblərinə uyğun çoxsaylı proqram və dərsliklərin hazırlanmasında var qüvvəsini, səyini əsirgəmir, «Azərbaycanda partiya quruculuğuna dair», «Sülh, Avropada təhlükəsizlik, milli azadlıq hərəkatı və tərkisilah məsələlərinə dair», «Sülh proqramının həyata keçirilməsi uğrunda mübarizə», «Milli azadlıq hərəkatı və müasir dövr», «Avropa təhlükəsizliyi», «XX əsr. Siyasi tarix» kimi kitab və monoqrafiyalarını nəşr etdirir.

Seyfəddin müəllim ictimai elmlər üzrə respublika Təhsil Nazirliyində fəaliyyət göstərən Elmi Metodik Şurasına uzun illər

sədrlik etmiş, bir sıra dərsliklərin, «Ali məktəblərdə humanitar elmlərin tədrisi və tədqiqi konsepsiyası»nın, «Humanitar elmlər üzrə ali təhsilin istiqamət və ixtisaslarına dair dövlət standartları»nın çapdan buraxılmasında gərgin əmək sərf etmişdir. Bununla paralel olaraq, elmi-pedaqoji kadrların hazırlanmasına da ciddi tələbkarlıqla yanaşmış, 20-dən artıq elmlər namizədinin, 5 elmlər doktorunun rəhbəri, çoxsaylı müdafiə işlərinin iddiaçılarının opponenti, məsləhətçisi olduğundan, onlara göstərdiyi köməklik və qayğıdan məmnunluq duyur.

Bu böyük insanı tanıyan, tələbəsi, aspirantı, dissertantı, dinləyicisi, yol yoldaşı, həmkarı olan hər bir kəs cəmiyyətdəki rolundan, mövqeyindən və tutduğu vəzifəsindən asılı olmayaraq, onun səmimiyyətindən, vətəndaşlıq amalından bol-bol bəhrələnməyə, davranış və münasibətlərində ona bənzəməyə, insanlarla ünsiyyət saxlamaqda onun kimi təvazökar, alicənab, qayğıkeş, həssas və tələbkar olmağa, obyektivlik naminə heç nəyə, heç kəsə güzəştə getməməyə çalışır.

Seyfəddin müəllimin ötən əsrin altmışıncı illərində o zamanlar dünyada-beynəlxalq aləmdə baş verən olaylar barədə hər dəfə respublika televiziyasının «Planetimizin mənzərəsi», «Qitələr və hadisələr», «Günün ekranı» verilişlərində geniş xalq kütlələrinin diqqətinə çatdırdığı maraqlı, obyektiv dəlil və faktlarla zəngin olan siyasi icmal və məlumatlarını maraqla dinləməkdən hədsiz zövq alanlar, ən çox ideoloji iş fəalları, xüsusən də humanitar elmlər sahəsinin kadrları daha çox ona bənzəməyi, onun kimi canlı xalq dilində, hamının başa düşdüyü anlaşıqlı ictimai-kütləvi üslubda danışmağı, baş verən hadisələrin dinamikasını səciyyələndirməkdə ayrı-ayrı tarixi məqamların roluna diqqəti yönəltməyi, qaranlıqlara aydınlıq gətirməyi başlıca meyar sayırdılar… Bu dövrdə İttifaq miqyasında tanınan, daha doğrusu, məşhur olan Zorin, Zamyatin, Ovçinnikov, Məmməd Sadıqzadə, Həmid Əliyev, Murtuz Ələsgərov, Kesar kimi siyasi icmalçılardan söhbət düşəndə elini, obasını, vətənini, xalqını və onun hər bir üzvünü sonsuz məhəbbətlə sevənlər Seyfəddin müəllimin adını

böyük qürurla çəkməklə yanaşı, onun canlı söhbətlərinə qulaq asmağa, mühazirələrini dinləməyə cəhd göstərirdilər. Onun televiziya, radio və əmək kollektivlərindəki çvxışları bir-birindən həm məzmun, həm də mahiyyət etibarı ilə fərqləndiyindən yaddaşlara daha tez həkk olunardı.

Fürsət düşəndə Şuşaya səfərlər etməsi, burada aparılan abadlıq və quruculuq işlərinin daha çox zövqləri oxşaması baxımından oturub-durduğu rayon rəhbərlərindən Qəşəm Aslanova, Əhəd Kərimova, Niyaz Hacıyevə, SSRİ Xalq deputatı Vaqif Cəfərova səriştəli və faydalı məsləhətlər verməsi, rayonun iqtisadiyyatı ilə maraqlanması, Dağlıq Qarabağda və onun ətrafında baş verən hadisələrin ən ağır vaxtlarında respublikanın görkəmli elm adamlarından Cəmil Quliyev, Qulu Xəlilov, Rəşid Göyüşov, Səfiyar Musayev, respublikanın xalq artisti Süleyman Ələsgərov və onlarca başqaları ilə birgə, həmçinin ayrılıqda dəfələrlə Qarabağa olması, Şuşa ziyalıları və xüsusən də istirahətçilər qarşısında keçirdiyi açıq mühazirələri, görüşləri, söhbətləri keçmş günlərin xoş xatirələrini çözələyir…

Bu xoş xatirələrin bir hissəsi 2000-ci ildə «Qorqud» nəşriyyatında işıq üzü görən «Ömrün anları» kitabında ( tərtibçisi tarix elmləri namizədi Musa Quluzadə, redaktoru Əhməd Elburusdur) öz əksini tapmışdır. Burada milli ziyalı, bir çox fəxri adların daşıyıcısı, adı və ünvanı ilə öyündüyümüz, hədsiz sevgi bəslədiyimiz, hamımız üçün doğma və əziz olan Seyfəddin Qəndilovun ömür yolunun ayrı-ayrı məqamları, anları barədə avtobioqrafik məlumatlarla yanaşı, onun son zamanlar mərkəzi mətbuatda gedən müsahibələrindən bəzi fraqmentlər verilmişdir. Həmçinin, uzun illər bu böyük, nəsillərə nümunə olan şəxsiyyətlə bir yerdə çalışan, əməkdaşlıq, yoldaşlıq, dostluq edən, həmkar olan tanınmış elm, ədəbiyyat, incəsənət və mədəniyyət xadimlərinin ürək sözləri, illərin axarında qəlblərində yaşatdıqları təəssüratları öz əksini tapmışdır. Bu kitabı oxumaq istəyində olan, lakin əldə edə bilməyənlər üçün orada maraq yaradan ifadələrdən

bəzi seçmələri Seyfəddin müəllimi sevənlərin bir daha diqqətinə çatdırmaq yerinə düşər:

***Akademik Vahid Hacıyev:-Azərbaycanın görkəmli alimi, siyasətçisi, ictimai xadimi Seyfəddin Qəndilovu uşaqlıq illərindən tanıyıram. Eyni məktəbin müxtəlif siniflərində təhsil almışıq. Onda şəxsiyyətin formalaşması üçün vacib şərtlərdən olan ziyalılıq duyğusu var idi. Məktəbdə elə iclas, elə tədbir olmurdu ki, orada Seyfəddinin savad və qabiliyyətindən, çalışqanlığından bəhs olunmasın…***

***Akademik Fuad Qasımzadə: -- Seyfəddin müəllim tarixçi alim, yüksək ixtisaslı, bacarıqlı elm və təhsil təşkilatçısı kimi böyük nüfuza malikdir… İdarəçiliyin, dövlətçiliyin, quruculuğun tarixinə dair dərin-dərin məzmunlu, maraqlı, samballı əsərləri var. Təbliğatçılığına, mühazirəçilik, natiqlik bacarığına isə söz ola bilməz… Ona qulaq asmaqdan doymursan…***

***Akademik Bəkir Nəbiyev: - … Seyfəddin müəllimi ancaq nadir natiqlərlə müqayisə etmək olar. Onun nitqində Azərbaycan xalq təfəkkürünün dərinliklərindən gələn bir şirinlik, səsində bir cazibədarlıq var…***

***Filologiya elmləri doktoru, professor Akif Bayramov:-- O, müəllimlərlə, tələbələrlə adi, başa düşüləcək bir dildə danışır, haqqın, ədalətin təntənəsi naminə hamıya etimad bəsləyir… akademiyaya gəlişi yeni ab-hava gətirmişdir.***

***Tarix elmləri doktoru, professor Şərif Haqverdiyev: - Prof. Seyfəddin Qəndilov milli qeyrətə sadiq, xalqımızın məruz qaldığı çətinlikləri və haqsızlıqları qəlbində çəkən, lakin çətinliklər qarşısında müvazinətini, sabaha inamını itirməyən ziyalılardan ibarət nəslə başçılıq edən gözəl müəllim və alim, əməkdar elm xadimi və əməkdar təbliğatçı,bacarıqlı təşkilatçıdır. Onun və nəslinin nümunəsi Azərbaycan xalqının mənəviyyatının, milli şüurunun inkişafına xidmət edir.***

***Azərbaycan Yazıçılar Birliyinin Qarabağ üzrə katibi, şair Ənvər Əhməd: - Seyfəddin müəllim alim olmaqla yanaşı, həm***

***də uzaqgörən və böyük şəxsiyyətdir. Onun qələmindən çıxan elmi əsərlərdə və publisistik yazılarda insan və zaman barəsində elə proqnozlar verilir ki, illər keçdikcə həmin proqnozlar həqiqətə çevrilir.***

***Akademiyanın müxbir üzvü, Milli Məclisin üzvü, professor Nizami Cəfərov: - Təbiət Seyfəddin müəllimə hər şeyi verib – zahirigözəllik, daxili zənginlik, yüksək nitq mədəniyyəti…, ətrafındakların sevincinə şərik olmaq qabiliyyəti!..***

İnsanda gözəl nitqin, rəvan danışıq məharətinin olması böyük mədəniyyətdir. Nitq mədəniyyətinin zənginləşdirilməsi sahəsində Seyfəddin müəllimin zəngin təcrübəsi vardır. Onun nitqinin sadəlik, ardıcıllıq, sistemlilik, yığcamlıq, məntiqlilik, düzgünlük, faktlara əsaslanmaq, obrazlılıq və təsirlilik kimi cəhətləri, həmçinin sadə, aydın və müqayisəli cümlələrdən qurulan gözəl nitqi dinləyicilərinin yaddaşından uzun müddət çıxmır. O, bir natiq kimi ensiklopedik təfəkkürə, zəngin erudisiyaya malikdir. Yazılı və şifahi ədəbiyyatımızı, xalq yaradıcılığını, atalar sözü və məsəlləri dərindən bilir , bütün çıxışlarında onlardan yeri gəldikdə məharətlə istifadə edir. Nitqində işlətdiyi aforizmlər, klassiklərin yaradıcılığından nümunə gətirdiyi bədii təsvir və ifadə vasitələri xalqımızın ictimai-siyasi həyatı, məişəti, qayğı və problemləri ilə üzvi şəkildə əlaqələndirilir. Mədəni həyatımızın yüksəlişi naminə söylədiyi hər fikrə, hər bir hadisəyə ciddi yanaşır, prinsipial münasibət göstərir.

Seyfəddin müəllimin keçdiyi ömür yolunun ilk cığırları çətinliklərdən başlasa da, özünün iradəsi, dözümü, dəyanəti sayəsində keçirdiyi çoxsaylı yuxusuz gecələr , hələ tələbəlik illərində ictimai fəaliyyəti, bilik, bacarıq və vərdişlərə lazımı səviyyədə yiyələnməklə yanaşı, elmi axtarışlara və tədqiqata başlaması onun gələcək bəxtiyarlığının ilk konturlarını müəyyənləşdirmiş, geniş arenaya çıxmağında bələdçi rolunu oynamışdır. O, gənc yaşlarından Azərbaycan cəmiyyətində özünü müdrik, insanların qayğısına qalan, xalqının adət-ənənələrinə son dərəcə sadiq, milli dəyərləri yaşadan və yeni çalarlarla

zənginləşdirən bir şəxsiyyət kimi tanıtmış, ömrü boyu ideal seçdiyi bu keyfiyyətlərə həm sadiq qalmış, həm də dinləyicilər qarşısında hər hansı məsələni şərh edərkən, ilk növbədə, mənəviyyat, ləyaqət, vətəndaşlıq mövqeyi, humanizm ideyalarının təbliğ-təşviq problemlərinə daha çox üstünlük verməkdədir.

Seyfəddin müəllim komsomol katibi olanda da, sıravi müəllim işləyəndə də, APİ, ADU və XTİ- nin müvafiq kafedralarına rəhbərlik edəndə də özünü xalqının ziyalısı, müəllimi, hamının yaxın dostu, yoldaşı, qardaşı, tələbələrinin mənəvi valideyni olduğunu konkret əməli fəaliyyəti ilə nümayiş etdirmişdir.

Azərbaycanda islahatların geniş vüsət aldığı bir dövrdə ölkənin dinamik və proporsional inkişafını təmin etmək üçün kadr hazırlığı siyasətini diqqət mərkəzində saxlayan möhtərəm Prezidentimiz Heydər Əliyev cənabları Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının yaradılması və bu ali təhsil ocağına əməkdar elm xadimi, professor Seyfəddin Qəndilovun rektor təyin edilməsi barədə tarixi fərman imzalamışdır. Bu fərmanın tələblərindən irəli gələn vəzifələrin yerinə yetirilməsi istiqamətində Seyfəddin müəllimin bilavasitə rəhbərliyi ilə aparılın ardıcıl və məqsədyönlü işlər günbəgün, həftəbəhəftə, aybaay, ilbəil öz bəhrəsini verməyə başladı . İlk növbədə, akademiyanın pedaqoji kollektivində sağlam mənəvi iqlim yaradıldı, təsadüfi, işinin öhdəsindən lazımınca gəlməyənlər, əməli fəaliyyətində qəbahətlərə yol verən və müəllim adına ləkə gətirənlər çox mehribanlıqla onların istəyinə uyğun gələn başqa kollektivlərə istiqamətləndirildilər.

Seyfəddin müəllimin bilavasitə rəhbərliyi ilə bu ali təhsil ocağının daxilində və xaricində durğunluq illərinə xas olan görkəmin tamamilə müasirləşdirilməsi, auiditoriyaların, kabinetlərin, kitabxananın əsaslı təmiri, binadaxili bütün komunikasiyaların yenisi ilə əvəz olunması, binanın koridorlarının, həyət və ətrafının müasir inşaat-memarlıq üslubunda sökülüb əsaslı qaydada yenidən qurulması, vaxtilə istifadəsinə zərurət duyulmayan yarımzirzəmi şəraitindəki

otaqların əsaslı təmir edilib kabinet və dərs otaqlarına çevrilməsi sahəsində olduqca diqqətəlayiq işlər görülmüşdür. Binanın istər xarici, istərsə də daxili görkəmi, koridorlarını bəzəyən maraqlı stend və sərgilər indi buraya gələn xarici qonaqları, ixtisasartırma kurslarında olan rəhbər işçiləri, tələbə və müdavimləri heyran edir. Akademiyanın strukturuna daxil olan əsas şöbə və bölmələr kompüterləşdirilmiş, yeni tələblərə cavab verən nəşriyyat fəaliyyətə başlamışdır.

Akademiyada təmir, yenidənqurma, abadlıq işləri ilə yanaşı, pedaqoji proses və xarici ölkələrin müvafiq ali məktəbləri ilə qarşılıqlı əməkdaşlıq, təcrübə mübadiləsi paralel aparıldı. Bir sıra dövlətlərlə, o cümlədən Türkiyə, MDB-yə daxil olan bir sıra ölkələrlə, Fransa, Kanada ilə əlaqələr yaradılmışdı. Tədris planlarının zamanın tələbləri səviyyəsində tərtibi təmin olunmuş, elmi tədqiqat işlərinin başlıca istiqamətləri işlənib hazırlanmşdır. Son iki ildə «Heydər Əliyev və dövlət idarəçiliyi: nəzəriyyə və təcrübə» mövzusunda keçirilən elmi-praktik konfransın materialları əsasında çap olunmuş «Dövlət idarəçilik məktəbi», Azərbaycanın dövlət müstəqilliyinin on illiyinə həsr olunmuş elmi sessiyanın materialları əsasında çap olunmuş «Suverenlik, demokratiya, dövlət idarəçiliyi», «Dövlət idarəçiliyi: sosial-iqtisadi aspektlər» adlı üç samballı elmi-nəzəri problemləri əks etdirən kitab çap olunmuşdur.

Akademiyada yaradılan «Heydər Əliyev dövlət idarəçilik məktəbi»inin dinləyiciləri qarşısında respublikanın görkəmli ictimai-siyasi xadimlərinin, nazirlərin və Milli məclisin üzvlərinin, tanınmış elm xadimləri və alimlərin maraqlı çıxışları müntəzəm olaraq təşkil edilir, burada dövlətçiliyimizin, müstəqilliyimizin möhkəmləndirilməsi baxımından keçirilən rəngarəng tədbirlər idarəçiliyin, xüsusən də məmur əməyinin zamanın tələblərinə uyğun olaraq, əməli cəhətdən yüksək səviyydə formalaşmasına öz müsbət təsirini göstərir. Elitar bir təhsil ocağının rektoru kimi Seyfəddin müəllim onu narahat edən problem və qayğıları özünün zəngin təcrübəsi sayəsində yoluna qoyur. Görkəmli bir elm

təşkilatçısı kimi professor-müəllim heyəti ilə əlaqəli şəkildə işləyir, hamıya göstərdiyi ehtiram, mehribanlıq, sadəlik və yoldaşlıq duyğuları onun tələbkarlığını daha da rövnəqləndirir. Axı, Seyfəddin müəllim ictimat həyata atıldığı illərin xoş xatirələrini yada salanda, ilk öncə onun milli ziyalı kimi formalaşmasında əvəzsiz rolu olan ən istəkli müəllimlərindən, akademiklər Yusif Məmmədəliyev, Mehbalı Qasımov, Zülfəli İbrahimov, İsmayıl Hüseynov, prof. Mehdi Yerevanski və orta məktəbdə riyaziyyat dərsi deyən Cavanşir müəllim kimi görkəmli pedaqoqların necə böyük şəxsiyyət, təmənnasız ziyalı olduqlarını xatırlayır. Onların zəkasının, verdikləri təhsilin, öyrətdikləri elmin və təlqin etdikləri biliklərin, göstərdikləri qayğının müqabilində uşaqlıq illərindən arzuladığı bəxtiyarlığına çatdığından Ulu Tanrıya şükürlər edir.

Azərbaycan fəlsəfi fikir tarixində əvəzsiz xidmətləri ilə tanınan, çoxsaylı fəlsəfi və etik əsərlərini özündən sonrakı nəsillərə mənəvi sərvət qoyan, hikmətli kəlamları elmi məclislərin bəzəyi olan, zəmanəsinin ən görkəmli əxlaq nəzəriyyəçilərindən biri kimi soydaşlarının qəlbində əbədi heykəlini qoyan filosof alim Ziyəddin Bahadur oğlu Göyüşov özünün **«Daxilə pəncərə»** əsərində qeyd edir ki, hər insan ömrü bir kitaba bənzəyir. İnsanın doğulması bu kitabın titul vərəqidir, körpəlik illəri bu kitabın girişidir, sonrakı şüurlu həyatı və davranışları bu kitabın əsas məzmunudur... Kitabın süjeti və məzmunu bilavasitə müəllifdən asılı olduğu kimi, insan ömrünün də əsas məzmunu xeyli dərəcədə onun özündən asılıdır…

Seyfəddin müəllimin ömür yolu nurlu bir kitabdır. Bu kitabın bütün dünyəvi elmləri özündə ehtiva edən biri-birindən gözəl, maraqlı, həm də oxunaqlı fəsilləri var. O fəsillərin hər biri insanlara müdriklik, bəşərilik, mənəviyyatlılıq, çətin məqamlarda dözümlü, dəyanətli olmaq, el-obaya və vətənə sevgi, doğma yurda məhəbbət, kökəbağlılığı yaşadan və nəsillərə ərmağan edən vətəndaşlıq mövqeyi, dövlət müstəqilliyimizin daha da

möhkəmləndirilməsinin başlıca meyarı sayılan azərbaycançılıq aşılayır.

Ziyalılığı ilə məşhur olan Qəndilovlar ailəsinə, Seyfəddin Qəndilov şəxsiyyətinə Azərbaycan cəmiyyətində böyük ehtiram, sonsuz hörmət, ülvi məhəbbət vardır. Bu ailəni hamı özünün doğması, əzizi, mehribanı, xüsusən bu ailədən qayğı və kömək görənlər özlərinin mənəvi dayaqları sayırlar.



# FİLOSOF ZİYƏDDİN GÖYÜŞOV

Özünün 1969-cu ildə Azərbaycan Dövlət Nəşriyyatı tərəfindən işıq üzü görən və geniş oxucu kütləsinin hədsiz rəğbətini qazanan «Həzz və iztirab» əsərinin ikinci səhifəsində yazdığı *«Ömrümə ömür, fərəhimə fərəh qatmış, şadlığımla şadlanan, kədərimlə kədərlənən, əməyimin daimi şəriki, zəhmətkeş həyat yoldaşım Leylaya*[1] *ithaf edirəm»* ifadələri və girişində qeyd etdiyi ilk cümlələrdə insan haqqında yazdığı «hələ qədim vaxtlardan başlayaraq, mütəfəkkirlər insanı «təbiətin tacı», «yer üzünün əşrəfi»,
«gövhərlərin gövhəri» kimi qiymətləndirmişlər. Zənnimizcə bu fikirlərə bunu da əlavə etmək lazımdır ki, insan təbiətin ən mürəkkəb psixikaya, ən zəngin, ən həssas zövq, hiss və duyğulara malik canlısıdır. Yaxşı demişlər ki, « hər bir insan sirlər xəzinəsidir, bacarıb bu sirləri açmaq lazımdır… » kimi dəyərli fəlsəfi fikir və düşüncələri Ziyəddin müəllimin bütün elmi yaradıcılığı boyu inkişafda götürülür.

Ziyəddin Bahadur oğlu Göyüşov 20 may 1920-ci ildə Ağdam rayonunun Boyəhmədli kəndində anadan olub. Uşaqlıq və gənclik illəri burada keçib. Ağdam Müəllimlər İnstitutunu, Azərbaycan Dövlət Universitetini bitirib. Bir müddət pedaqoji fəaliyyətlə məşğul olub. Müəllimlik edib, komsomol işində çalışıb. Ağdam rayon yerli radio verilişləri redaksiyasında redaktor vəzifəsində çalışıb. Elmi yaradıcılığa daha çox meyilli olduğundan işini Bakıya dəyişib. 1953-cü ildə Azərbaycan Elmlər Akademiyasının

[1] Leyla xanım uzun müddət rəhbər komsomol, partiya və sovet orqanlarında aparıcı vəzifələrdə çalışmışdır

Fəlsəfə və Hüquq İnstitutunun aspiranturasına daxil olub. Araşdırdığı elmi-tədqiqat işlərini vaxtından əvvəl başa çatdıraraq iddiaçısı olduğu fəlsəfə elmləri namizədi alimlik dərəcəsini alıb. 1963-cü ildə fəlsəfə elmələri doktoru, 1964-cü ildə professor, 1976-cı ildə Azərbaycan Elmlər Akademiyasının müxbir üzvü olmuşdur. Uzun müddət Akademiyanın Fəlsəfə və Hüquq İnstitutunun fəlsəfə tarixi şöbəsinin müdri işləmiş, eyni zamanda Azərbaycan fəlsəfi fikir tarixinin öyrənilməsinin təşkilatçılarından biri kimi böyük xidmətləri olmuşdur. Xüsusən X1X əsrin ictimai-fəlsəfi fikri tarixinə dair bir neçə elmi əsər yazmışdır. Ömrünün sonunadək Azərbaycanda fəlsəfi etik fikir tarixi problemləri ilə məşğul olmuş, həmin dövrün burjua əxlaqının böhranı məsələlərini tədqiq etmişdir. H. Zərdabinin seçilmiş əsərlərinin ilk dəfə toplanılıb çap olunmasında əlindən gələni əsirgəməmişdir. Azərbaycan Sovet Ensiklopediyasının şura üzvü kimi səmərəli fəaliyyət göstərmişdir. Görkəmli sovet filosofu kimi bir çox xarici ölkələrin ali məktəblərində, xüsusən 1970-ci ildə Ankara, İstambul universitetlərində fəlsəfənin problemlərinə dair mühazirələr oxumuşdur. Həmçinin Azərbaycanın Ali məktəblərində fəlsəfə fənnindən mühazirələr oxumuş və seminarlar aparmışdır.

Z. B. Göyüşov **«Azərbaycan maarifçilərinin etik görüşləri», «müasir burjua əxlaqının iflası», «XX əsrin əvvəllərində Azərbaycan maarifçilərinin əsərlərində əxlaq məsələləri», «Əxlaqi sərvətlər», «X1X - XX əsrlərdə Azərbaycanda etik fikir», «Həzz və iztirab», «Fəzilət və qəbahət», «Daxilə pəncərə», «Filosofskaya mısl v Sovetskom Azerbaydjane. Kratkiy oçerk»** kimi sanballı fəlsəfi-etik əsərləri ilə Azərbaycanda fəlsəfə elmini və onun tarixni zənginləşdirmiş, gələcək nəsillərə böyük, həm də dəyərli bir elmi irs yaratmışdır.

«Əxlaqi sərvətlər» əsərində etikanın əxlaqi sərvətlər, kateqoriyalar və prinsiplər haqqında, bütövlükdə əxlaqi qanunauyğunluqlar haqqında elm olmaqla bərabər, həm də həyat müəllimi olduğu vurğulanır. Bu elm sahəsi əxlaqi sərvətlərin necə

yarandığını, onların məzmunununun və qorunub saxlanılmasının zəruriliyini müəyyən etməklə gənclərimizə necə yaşamağı, öz həyatlarını necə məna və məzmunla zənginləşdirməyi təlqin edir. Müəllif əxlaqi sərvətin mənası və insan həyatında bunların oynadığı rol haqqında dünyada məşhur olan əxlaq nəzəriyyəçilərinin, filosofların , mütəfəkkirlərin, pedaqoqların, alim, yazıçı və dövlət xadimlərinin, həmçinin Azərbaycanın elm, ədəbiyyat və mədəniyyət xadimlərinin fikir və düşüncələrini azərbaycanlı oxuculara orijinal şəkildə çatdırır. Əxlaqi tərəqqi və vicdan, insaf, həya, borc, şərəf, namus, ləyaqət və ədalət kimi əxlaqi sərvətlərin mənalı həyat üçün, xeyirxahlıq və yaxşılıq üçün xalq kütlələrinin yaratdığı sadə əxlaq normalarının ən qiymətli sərvət - stimul olduğunu göstərir, oxucunu ideal və xoşbəxtliyini də bu sərvətlərdə axtarmağa sövq edir.

Ziyəddin Göyüşovun **«Daxilə pəncərə»** monoqrafiyası bu qəbildən olan **«Həzz və iztirab», «Əxlaqi sərvətlər», «Fəzilət və qəbahət», «Səadət düşüncələri»** əsərlərinin məntiqi davamı olmaqla yanaşı, burada əxlaq tərbiyəsinin ən mühüm problemlərindən biri – insanın özünüdərketməsi problemi araşdırılır. Həmçinin bu problemin mahiyyətini yanlış izah edən burjua alimlərinin fikirləri əsaslı tənqid edilir, özünüdərketmənin əsl mahiyyəti barədə maraqlı faktlar, iqtibaslar verilir. Əxlaq tərbiyəsində şəxsiyyətin özünüdərketməsinin rolu və əhəmiyyəti, özünəqiymət, özünənəzarət, özünüifadə, özünümüşahidə, özünəhörmət problemlərinin mahiyyəti və bunların ictimai həyatda əxlaqi baxımdan əhəmiyyəti və məsuliyyət oriyentirləri problemləri bu əsərin əsas qayəsidir. Haqlı olaraq müəllif qeyd edir ki, ***« Qoy hər kəs öz daxilinə pəncərə aça bilsin və bu pəncərədən öz daxili aləminə nəzər salmağı, baxmağı, lazım gələndə orada təmizlik aparmağı bacarsın. Bunun həm cəmiyyət üçün, həm də ayrı-ayrı şəxsiyyətlərin öz fərdi həyatı üçün müstəsna əhəmiyyəti vardır. Öz daxilini görə bilməyən başqalarının daxili mənəvi aləminə nüfuz edə bilməz, özünü***

***görə bilməyən başqalarını görə bilməz, özünü kəşf edə bilməyən başqalarını kəşf edə bilməz…».***

Görkəmli filosofun bu əsərində insanın öz həzzlərinin həm yaradıcısı, həm də istehlakçısı olduğu hərtərəfli şərh edilir. Həmçinin həzzlərin xoşbəxtliklə əlaqəsi, iztirabların insan həyatında rolu, ailənin, məhəbbətin, dostluğun, əxlaqi borcu yerinə yetirməyin, estetik gözəlliyin, biliyin, zəkanın tükənməz həzz mənbələri olması, hər cür gözəlliklərlə zəngin olan təbiətdən alınan həzzlərin insan ömrünü rövnəqləndirməsi barədə diqqəti cəlb edən kəlamlar, dünyanın tanınan dühalarından gətirdiyi nümunələrlə oxucuda yalnız fəlsəfi və etik maraq deyil, həm də ictimai-sosioloji maraq doğurur.

Sovet İttifaqının mövcud olduğu şəraitdə dünyanın bir çox aparıcı ölkələrində adı, ünvanı məşhur olan Ziyəddin təkmilləşmələr apara-apara üzərində daim işlədiyi problemlər onun özünün daxili aləminin, mənəvi dünyasının zənginliyinin güzgüsü olaraq diqqəti cəlb etməklə yanaşı, yeni tərzdə düşünməyi bacaran filosofların yetişməsinə elmi zəmin yaradırdı. Onun yaradıcılığının fəzilətlə bağlı bütün məqamlarının həm elmi, həm bədii məzmununun mərkəzində özünün obrazı tarixi bir şəxsiyyət kimi canlanır. Ümumən Göyüşovlar nəslinə yalnız yaxın və doğma olan, bu ailənin ziyalıları ilə ünsiyyət saxlayan soydaşlarımız deyil, bütün Azərbaycan cəmiyyəti Ziyəddin müəllimin böyük humanist, Azərbaycanı fəlsəfi düşüncələri ilə dünyada şöhrətləndirən elm xadimi olduğunu sonsuz fəxrlə vurğulayırlar.

Onun respublikada filosof kadrların yetişməsində son dərəcə əvəzsiz xidmətləri olmuşdur.

## ARXEOLOQ ALİM



Rəşid Bahadur olğlu Göyüşovu tələbəlik illərindən tanıyırdım. Azərbaycan Dövlət Pedaqoji İnstitutunda arxeologiya fənnindən

seminar məşğələləri aparırdı. Tələbə dostlarım onun barəsində ağızdolusu danışırdılar. Məni onunla bir kafedrada işləyən həmyerlim rəhmətlik Surxay Əmiraslanov tanış etmişdi. Sadə təbiətli, təvazökar, qayğıkeş bir insan olduğuna görə tələbələr həmişə o söhbətlərinə maraqla qulaq asardılar. Göyüşovlar ailəsinə, etik fəlsəfi əsərlərini sevə-sevə oxuduğum görkəmli filosof Ziyəddin müəllimə qarşı xüsusi rəğbətim olduğu üçün Rəşid müəllimin söhbətlərini dinləməyə məndə də sonsuz həvəs yaranmışdı. Ona Ziyəddin müəllimin yaradıcılığı barədə suallarla müraciət edər, aldığımız cavabların ümumi məzmunundan məmnun qalardıq… Tale elə gətirdi ki , bu ailənin ortancıl ağlu Əkbər Göyüşovla ailəvi dostluq əlaqələrimiz bizi daha da yaxınlaşdırdı, doğmalaşdırdı. Mənə fəlsəfə elmləri doktoru, professor Ziyəddin Göyüşovla zirvə şəhəri Şuşada tanış olmaq, onun ictimai-siyasi, etik fikirlərini dinləmək xoşbəxtliyi nəsib oldu. Rəşid müəllimin fərdi minik maşını ilə Şuşanın görməli yerlərinə səyahətlərimiz, bəlkə də saza-sözə, musiqiyə olan ümumi maraqlarımız üst-üstə düşdüyünə görə təbii münasibətlərimiz formalaşmağa başladı. Əkbər müəllim müəyyən məsələlərin həllində yaxın məsləhətçimə, yol göstərənimə çevrilmişdi. Həyat yoldaşı Gözəl xanımın azəri qadınlarına məxsus mehmannəvazlığı bizi ailəlikcə bu ailənin doğma üzvləri siyahısına daxil etmişdi… Bu doğma, insani münasibətlər Göyçə mahalında yaşayan qardaş-bacıma, qohum-əqrabama da sirayət etmişdi. Göyüşovlar ailəsinin büllur kimi saf, müqəddəs, respublikada sayılan bir ziyalı nəsil olduğuna görə

mənən öz ehtiramlarını bildirir, dostluq əlaqələrini və ünsiyyətlərini yaşatmağı özlərinə mənəvi borc sayırdılar. Ziyəddin müəllimin də, Rəşid müəllimin də ünvanı, adı onların hər biri üçün müqəddəsləşmiş, doğmalaşmış, güvənc yerinə çevrilmişdi…

Rəşid Bahadur oğlu Göyüşov haqqında Azərbaycan EA Arxeologiya və Etnoqrafiya İnstitutunun əməkdaşı Qara Əhmədovun «Azərbaycan arxeologiyası» jurnalının 2000-ci il tarixli sayında uzun illər həmin institutun şöbə müdiri işləmiş, tarix elmlər doktoru, professor Rəşid Bahadur oğlu Göyüşovun həyat və fəaliyyətindən bəhs edən «Rəşid Göyüşov – vətənpərvər alim» sərlövhəsi ilə maraqlı, həm də mənim qəlbimdən keçən, fikrimdə dolandırdığım zəngin faktlara əsaslanan tərcümeyi-halı, elmi əsərlərinin siyahısı verilmişdir. Rəşid müəllim yaddaşlarda yaşayan, xatirələrdə yaşadılan, doğma Vətəni Azərbaycanın – xalqının böyük arxeoloq alim oğludu. Adı tarixlər boyu yaşayacaq bu şəxsiyyətin özü kimi müqəddəs ruhu onu tanıyanların qəlbində əbədi olaraq özünə yer tutmuşdur. Bu baxımdan verilən fikirlər yazının müəllifinə məndə hədsiz hörmət, rəğbət və sevgi yaratdı. Tərcümeyi-hal materialları adətən eyni faktların bu və ya digər şəkildə ifadəsi kimi qələmə alınsa da, buraya bəzən artırmaların edilməsinə təbii zərurət yaranır, yazının ümumi məzmununun zənginləşdirilməsi üçün haşiyələrə də yol verilir. Qara müəllimin məqaləsi əsasında Rəşid müəllimin elmi yaradıcılığı barədə ürəyimdən keçənləri topluya daxil etməyi özümə mənəvi borc bildim:

Rəşid Bahadur oğlu Göyüşov 1930-cü il dekabrın 5-də Ağdam rayonunun Boyəhmədli kəndində anadan olmuşdur. Orta təhsilini öz doğma kəndində aldıqdan sonra, 1949-cu ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna qəbul edilir və buranı 1953-cü ildə müvəffəqiyyətlə bitirir. Rəşidin ərsəyə gəldiyi, boya-başa çatdığı kənd tarixi abidələrlə zəngin olduğundan onun qəlbində tarix elminə maraq hələ orta məktəb illərindən baş qaldırmışdı. O, hər gün bu abidələrin arası ilə məktəbə gedir, möhtəşəm govurqala şəhər xarabalıqları, iri daş heykəllər və

nəhəng antik dövr məbədlərinin qalıqları daim onun diqqətini cəlb edir, uşaqlıq həvəsi ilə bu abidələrin sirrini öyrənməyə çalışırdı.

R. Göyüşov ali təhsilini başa vurduqdan sonra təyinatla Salyan, Ağdam və Ağcabədi rayonlarında müəllim, tədris hissə müdiri və orta məktəb direktoru vəzifələrində çalışmışdı. Lakin arxeologiya elminə olan həvəs onu 1959-cu ildə Azərbaycan EA Tarix İnstitutuna gətirib çıxarmış və həmin txtisas üzrə aspiranturaya qəbul olunmuşdur. Respublikanın tanınmış qocaman alimi S. M. Qazıyevin rəhbərliyi ilə elmi fəaliyyətə Azərbaycanın qədim paytaxtı Qəbələ şəhərindən başlamış, müəllimindən qazıntı aparmağın sirlərini öyrənmiş, ona təklif edilən **«Qəbələ şəhərinin ulus məmulatı (1 –X əsrlər)»** adlı dissertasiyasına aid material toplamış, həmin materialları qazıntıların gedişində izləmək və dərindən tədqiq imkanı əldə etmişdir.

Rəşid müəllim həmin əsərini akademik Ə. Ə. Əlizadənin, G. Ə. Əbilovanın, görkəmli Qafqazşünas alim K. V. Treverin rəsmi opponentlikləri ilə 1962-ci ildə Tarix İnstitutunun Elmi Şurasında yüksək səviiydə müdafiə edərək iddiaçısı olduğu alimlik dərəcəsini almışdır.

Qarabağda arxeoloji tədqiqatları davam etdirən R. Göyüşov Alban katolikosluğunun iqamətgahı olmuş, həmçinin alban memarlığının incisi sayılan Xəznəgah (Qanzasar) məbədində apardığı tədqiqatların nəticəsində özünün **«Qanzasar məbədinin dini, etnik mənsubiyyətinə dair»** adlı məqaləsini yazıb nəşr etdirmişdir. Bu məqalə Qanzasarı erməni abidəsi hesab edən və hətta onu erməni memarlığının incisi adlandıran erməni və erməniпərəst alimlər arasında böyük narazılığa səbəb olmuşdur. Buna görə o, 1970-ci illərdə erməni elmi ədəbiyyatında ciddi tənqidlərə məruz qalmışdı. Bu vəziyyət heç də onu ruhdan salmamış, əksinəbu mövzuda tədqiqat və araşdırmalarını davam etdirmiş, zəngin arxeoloji, epiqrafik materiallar və yazılı məlumatlar əsasında öz mövqeyini siddi şəkildə müdafiə etmiş,

1986-cı ildə rus dilində «Qanzasar alban abidəsidir» adlı kitabçasını çapdan buraxmışdır. Ümumiyyətlə, R. Göyüşov 1960-cı illərin sonlarından «Qafqaz Albaniyasında xristianlıq» mövzusunda tədqiqat aparmağa başlamış və bu məqsədlə o, ilk Alban rahibinin dəfn olunduğu və ilk orta əsr Alban memarlığının ən böyük abidələrindən Ağoğlan məbədinin yerləşdiyi şəhər yerində fasiləsiz olaraq arxeoloji qazıntı işləri aparmışdı.

Məlum olduğu kimi, erməni alimləri Amarası Şərqi Ermənistan ərazisində yerləşən erməni şəhəri kimi qələmə almışlar, hətta R. Göyüşov onlardan bir qrupunun qeyri-qanuni qazıntı işləri apararaq, ilk Alban rahibi Qriqorişin qəbrini dağıtdıqlarını müəyyən etmişdir. O. on ilə yaxın Amarasda apardığı qazıntılar zamanı şəhərin tarixinə, onun iqtisadi və sosial həyatına dair xeyli maddi mədəniyyət qalıqları aşkara çıxarmış, nəticə olaraq qazıntı materialları və yazılı mənbələr əsasında 1975-ci ildə özünün «Amaras - Ağoğlan» adlı monoqrafiyasını nəşr etdirmişdir. Bu əsərə görə erməni müəllifləri onu tarixi saxtalaşdırmaqda günahlandırmışlar.

1976-cı ilin sentyabrında R. Göyüşov SSRİ EA Dağıstan filialının Q. Dadasi adına Tarix, Dil və Ədəbiyyat İnstitutu tərəfindən Cənubi Dağıstan arxeoloji ekspedisiyasına dəvət olunmuş, burada az müddətdə Dərbənd, Məhərrəmkənd, Qasımkənd və Axta rayonları ərazisində xristian abidələri ilə tanışlıqdan sonra özünün geniş hesabatını yazmışdır.

1976-cı ildə Rəşid müəllim özünün «Qafqaz Albaniyasında xristianlıq» mövzusunda doktorluq dissertasiyasını başa çatdıraraq, uzun müzakirələrdən sonra, erməni alimlərinin siddi böhtanlarına baxmayaraq, başda akademik Ziya Bünyadov olmaqla azərbaycan və gürcü mütəxəssislərin köməyinə arxalanaraq, 1979-cu ildə Gürcüstan EA Tarix İnstitutu nəzdindəki İxtisaslaşdırılmış Elmi Şurada müvəffəqiyyətlə müdafiə etmişdir. Bu dissertasiya işini bir daha təkmilləşdirərək, onu 1985-ci ildə monoqrafiya şəklində rus, azərbaycan və ingilis dillərində çap etdirmişdir.

1970-80-ci illərdə Azərbaycanın bir növ nəhəng tikinti meydanına çevrildiyi vaxtlarda Rəşid müəllim çalışdığı İnstitutda «Yeni tikinti sahələrinin arxeoloji tədqiqi» üzrə xüsusi şöbənin yaradılması ideyasını irəli sürür və 1980-ci ildə məqsədinə nail olur. Azərbaycan EA Rəyasət Heyətinin qərarı ilə yaradılan həmin şöbəyə rəhbər təyin edilir. Bu məqsədlə Naxçıvanda Araz su qovşağı tikintisi zonasının, Xudafərin və Qız Qalası su qovşaqlarının, Yenikənd SES-nin, Mozdok – Qazıməmməd qaz kəməri çəklişi zonası və digər böyük tikinti zonalarının arxeoloji abidələri bilavasitə onun rəhbərliyi ilə öyrənilmişdir.

Azərbaycanda arxeologiya elminin inkişafına öz töhfələrini verən Rəşid müəllim ali məktəb tələbələrinin bu sahə üzrə dərsliyə olan ehtiyacını nəzərə alaraq, 1986-cı ildə elmi ictimaiyyət tərəfindən rəğbətlə qarşılanan «Azərbaycan arxeologiyası» adlı dərs vəsaitini, Qarabağ tarixinin araşdırılması istiqamətindəki elmi fikirlərini «Qarabağın keçmişinə səyahət», «Gəncəsar», «Qarabağın etnik tarixinə dair» kimi əsərlərini, məşhur rus arxeoloqu, akademik A. İ. Martinovla şərikli «SSRİ arxeologiyası» kitabını nəşr etdirmişdir.

Rəşid müəllimin ən böyük elmi nailiyyətlərindən biri Şabran arxeoloji ekspedisiyası olmuşdur. Azərbaycanın məşhur orta əsr şəhərlərindən olan, böyük Xaqaninin «Həbsiyyə»sinin yazıldığı Şabran şəhəri qalıqlarının aşkar edilməsi bilavasitə onun adı ilə bağlıdır. O, təşkilatçılıq bacarığı ilə bu ekspedisiyanın nailiyyətlərini nəinki sabiq Sovet İttifaqı, hətta dünya miqyasına çıxarmağa müvəffəq olmuşdur. 1980-ci illərin əvvəlində Azərbaycan KP MK-nın birinci katibi və daha sonra SSRİ Nazirlər Soveti Sədrinin birinci müavini vəzifəsində işləyən Azərbaycan Prezidenti möhtərəm Heydər Əliyev cənabları, məşhur Norveç səyyahı Tur Heyerdal, məşhur rus arxeoloqu, **«Ermitaj muzeyi»**nin direktoru akademik V. V. Piotrovski və başqa görkəmli elm adamları Şabranda olmuş və Rəşid müəllimin fəaliyyətini yüksək qiymətləndirmişlər. Hörmətli Prezidentimiz

Heydər Əliyev cənabları Rəşid müəllimi «Fədakar alim» adlandırmışdır.



Dünya şöhrətli səyyah-alim Tur Heyerdal 1981-ci ilin 30 avqustunda görkəmli akademik Həsən Əlirza oğlu Əliyevin rəhbərliyi ilə Azərbaycanın bir qrup alimləri ilə Dəvəçi, Xaçmaz, Quba rayonlarında, Yalama-Nabran zonasında olarkən Rəşid müəllimlə görüşərkən Şabran şəhərinin yaranması tarixi, onun Qafqaz xalqlarının tarixində rolu və yeri haqqında tapılan qazıntılar baxımından məlumatlarını dinləmişdi. Burada aparılan işləri yüksək qiymətləndirən Norveç səyyahına MK-nın birinci katibi H. Əliyev tərəfindən Şabran şəhərinin xarabalıqlarından tapılan XİI əsrə aid boşqab Azərbaycan xalqı adından hədiyyə edilmişdi.

Hörmətli alim, gözəl insan olan Rəşid Göyüşov elmi-tədqiqatla yanaşı uzun illər pedaqoji fəaliyyətlə məşğul olmuş, Azərbaycan Dövlət Pedaqoji, Tibb, Sənaye Unversitetlərində mühazirələr oxumuş, professor Y. Mahmudovun təşəbbüsü ilə bir neçə il

BDU-nun tarix fakültəsində Dövlət İmtahan Komissiyasının sədri olmuşdur.

Görkəmli alim 1964-cü ildən başlayaraq respublikamızın Bakı, Dəvəçi,Yevlax,Göyçay, Biləsuvar, Şəki, Qazax, İsmayıllı şəhərlərində, keçmiş İttifaqın Moskva, Leninqrad, Səmərqənd, Alma-Ata,Tbilisi, İrəvan, Novasibirski şəhərlərində keçirilən elmi sessiya, konfrans və simpoziumlarda müntəzəm olaraq çıxışlar etmiş, apardığı tədqiqatların nəticələri ilə elmi ictimaiyyəti yaxından tanış etmişdir. Həmçinin dəvət olunduğu ali məktəblərdə – Ankara, Təbriz, Kemerova, Daşkənd və digər şəhərlərin universitetlərində mühazirələr oxumuşdur.

Rəşid müəllim erməni ekstremislərinin Dağlıq Qarabağda törətdikləri seperatçı münaqişələrin ilk çağlarında ciddi narahatçılıq keçirən vətənpərvər ziyalılardan biri kimi bu problemlə maraqlananlara Qarabağın tarixini dəqiqliyi ilə çatdırmaq üçün tarixi sənədləri əldə sübut etmiş, bu vilayətə məxsus abidələrin təbliği sahəsində ardıcıl iş aparmışdır. Ən ağır vaxtlarda Dağlıq və Aran Qarabağın rayonlarının, xüsusən Şuşanın ərazisində mövcud olan tarix və memarlıq abidələri ilə maraqlanan xarici qonaqlarla döyüş bölkələrinə səfər etmişdir. 1993-cü **ildə «Qarabağın keçmişinə səyahət»** adlı elmi-kütləvi kitabçasını nəşr etdirmiş, obyektiv, yüksək elmi səviyyədə yazılmış 100-dən çox məqalə ilə respublika mətbuatında və xarici ədəbiyyatda çıxışları olmuşdur. Onun ermənipərəst xarici jurnalist və missionerlərlə prinsipial söhbətləri əsasən Qarabağ abidələrinin dağıdılmasının qarşısının alınmasına yönəldilmiş, ömrünün son dəqiqələrinədək Azərbaycan abidələrinin qorunması, saxlanması və təbliği problemləri barədə düşünmüşdür.

Rəşid müəllim gözəl dost, mehriban insan, isdedadlı alim, bacarıqlı elm təşkilatçısı, ünsiyyətdə olduğu adamlara həssaslıqla yanaşan, təvazökar, Vətənini, xalqını canından artıq sevən, ailəcanlı, alimlik şərəfini müqəddəsliklə yaşadan, valideynlik borcunu hər şeydən üstün tutan əvəzolunmaz bir şəxsiyyət idi. Amansız ölüm onu ömrünün 70-ci baharına üz tutduğu bir vaxtda

–1999-cu ilin 18 yanvarında, «Ramazan bayramı» günündə bizlərdən: istəkli övladları Bahadurdan, Altaydan, sevimli həyat yoldaşı Zemfira xanımdan, qohum-əqrəbadan, dost-tanışlardan ayırdı. Artıq neçə ildir ki, Rəşid müəllimin alimlər arasında yeri görünür…

Lakin təsəllimizi onun əziz və istəkli yadigarı , BDU-nun **«Türk və Qafqaz xalqları tarixi»** kafedrasının dosenti, tarix elmləri namizədi , ata yolunun layiqli davamçısı Altay müəllimin geniş ictimaiyyət arasında qazandığı hörmət və nüfuzda tapırıq…

## NƏSİLLƏRƏ NÜMUNƏ



Onu çoxdan tanıyıram. Rəhbər kadrların daimi fəaliyyət göstərən biraylıq kursunun dinləyicisi idim. Kursun rəhbəri mərhum Qüdrət Muradov respublikanın tanınmış elm adamlarının, rəhbər işçilərin dinləyicilər qarşısın-da çıxışlarının təşkilinə xüsusi təşəbbüskarlıq göstərirdi. Növbəti mühazirə saatının fəlsəfə tarixindən olduğunu və özü ilə auditoriyaya təşrif gətirən, nurani görkəmi ilə diqqəti cəlb edən müəllimin adını, soyadını, elmi dərəcəsini və vəzifəsini bildirəndə mənimlə yanaşı əyləşən bir

nəfər zəngdən sonra Tofiq müəllim barədə böyük fəxrlə söhbət açdı: əsilli-nəsilli, müqəddəs bir ailənin övladıdır, -dedi. Atası Əli müəllim uzun illər rayonumuzda rəhbər vəzifədə çalışıb. Zəngilanda Rəsulovların böyük hörmət və nüfuzu vardır...

Tofiq Əli oğlu Rəsulov Azərbaycanın dilbər guşələrindən sayılan Gədəbəy rayonunun Düzrəsullu kəndində əvvəl, may ayının 21-də dağların al-yaşıla büründüyü bir zamanda dünyaya göz açıb. Uşaqlığını, məktəb illərini başı göylərə ucalan sıra dağların və gen dərələrin qoynunda uyuyan doğma yurdu Gədəbəydə keçirib. Orta məktəbi isə 1947-ci ildə Zəngilan rayonunda bitirib. 1952-ci ildə ADU-nun tarix fakültəsinin fəlsəfə şö”bəsini fərqlənmə diplomu ilə bitirib. H.Zərdabi adına Gəncə Pedaqoji İnstitutunda kabinet müdiri, daha sonra müəllim işləyib. 1954-1957-ci illərdə SSRİ EA-nın Fəlsəfə İnstitutunun aspiranturasında oxuyub və 1958-ci ildə “X1X əsrin 90-cı illərində Lenin tərəfindən pozitivizm sosiologiyasının tənqidi” mövzusunda dissertasiyasını müvəffəqiyyətlə müdafiə edərək fəlsəfə elmlər namizədi alimlik dərəcəsini alıb. Bir müddət Azərbaycan Elmlər Akademiyasının Fəlsəfə və Hüquq

İnstitutunda kiçik və baş elmi işçi vəzifələrində çalışıb .Gənc alim kimi Azərbaycan KP MK aparatında mə”sul işə irəli çəkilib. Təbliğat-təşviqat sahəsindəki yaradıcı və təşkilatçılıq fəaliyyəti qiymətləndirilərək MK-nın nəzəri və siyasi orqanı “Azərbaycan Kommunisti” jurnalına baş redaktorun müavini vəzifəsinə tə'yin olunub. Burada elm aləminə can atan gənc kadrların yetişməsi üçün qayğı və köməkliyini əsirgəməyib, köklü məsələləri əks etdirən elmi, ictimai-siyasi məqalələrin dərcinə daha çox əhəmiyyət verib. Görkəmli alimlərin jurnalın səhifələrində imzalarının vaxtaşırı görünməsinə hər vasitə ilə nail olmağa sə”y göstərib. Özünün çoxsaylı broşüra və məqalələrini “Vaprosı filosofii”, “Azərbaycan Kommunisti”, ”Təşviqatçı” jurnallarında, “Elm”, ”Azərbaycan” nəşriyyatlarında, “Azərbaycan Ensiklopediyası”nda, respublika qəzetlərində nəşr etdirmək ilə siyasi-ictimai elmlərin inkişafina mə”nəvi töhfələrini vermişdir. Tofiq müəllimin elmi yaradıcılıq xronologiyasını nəzərdən keçirəndə istər –istəməz adam özündə fərəh hissi duyur. O, ümumi həcmi 80 çap vərəqi təşkil edən 55 elmi, elmi-tədqiqat, tədris -metodiki, elmi -metodiki məqalənin, bir monoqrafiyanın, büroşüraların müəllifidir. Azərbaycan KP MK-nın Təbliğat-Təşviqat şö”bəsi mühazirəçilər qrupunun rəhbəri olarkən mühazirəçilərə, siyasi mə”lumatçılara metodik köməklik məqsədilə buraxılan 12 büroşüranın bilavasitə həm redaktoru, həm də müəllifi olmuş, respublikanın görkəmli filosof və tarixçilərindən bir çoxunun”Azərnəşr” tərəfindən müxtəlif illərdə işıq üzü görən elmi əsərlərinin redaktoru olmuş, həmçinin özünün müsbət rə”yini bildirmişdir.

Yeri gəlmişkən, ”XIX əsrin 90-cı illərində Lenin tərəfindən pozitivizm sosiologiyasının tənqidi” adlı Azərbaycan Elmlər Akademiyasının nəşriyyatı tərəfindən 1960-cı ildə çap olunan monoqrafiyasına Moskva Dövlət Universitetinin professoru Q. M. Şestakovun ”Voprosı filosofii” jurnalının 1962-ci ildə çıxan dördüncü sayında geniş bir rə”y yazılmışdır:

“Əsərin elmi dəyəri ondan ibarətdir ki, burada indiyədək az tədqiq olunan subyektiv sosiologiyanın Qərbi Avropa pozitivizm ilə əlaqəsi müəyyənləşdirilir. Lavrov-Mixaylovski tə”liminin fəlsəfi mənbəyi kimi pozitivizm hərtərəfli təhlil olunur... ”Bu fikir görkəmli rus alimi V.Q.Xrosun SSRİ EA Fəlsəfə İnstitutunun “Elm” nəşriyyatında 1972-ci ildə nəşr olunan “Xalqçılıq ideologiyası və marksizm”kitabında və həmin nəşriyyat tərəfindən işıq üzü görən(1965) “SSRİ-də və Avropanın sosialist ölkələrində marksist-leninçi fəlsəfə və sosiologiya” kitabında da çox maraqlı, həm də zəngin elmi fəlsəfi ifadələrdə öz əksini tapmışdır.

Kafedra müdiri kimi tədrisin elmi-metodik tə'minatı Tofiq müəllimin diqqət mərkəzindədir. Fəlsəfə fənninin tədrisinə əməli köməklik məqsədi ilə bir neçə metodik vəsaitin müəllif və tərtibçisi kimi səmərəli işi maraq doğurmuşdur. Onun Moskva İctimai Elmlər Akademiyasının Tədris Metodiki Şö'bəsi tərəfindən “Dialektik materializm üzrə tapşırıq və çalışmalar toplusu” nəşr olunmuşdur. Ondan İttifaqın bütün Partiya Məktəblərində istifadə edilmişdir. Azərbaycan Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının tələbələri, həmçinin professor T. Ə. Rəsulovun müdiri olduğu “Fəlsəfə və sosial psixologiya” kafedrasının professor və müəllim hey”əti həmin topludan bir mənbə kimi istifadə edirlər.

Tofiq müəllimin təkcə əsərlərinin başlıqlarını oxuyan hər bir kəs onun fəlsəfi düşüncə və axtarışlarının miqyas və mündəricəsi haqqında müəyyən təsəvvür əldə edə bilər: “Karl Marks və ictimai tərəqqi”, "Pitrim Sorokinin türkiyəli həmfikiri”, ”Oqyust Kontun fəlsəfi və sosioloji görüşləri“, ”Vətəndaşlıq borcu, mə”nəvi sima”, ”L. Feyerbax”, ”Fəlsəfi fikrin tarixində insan problemi”, ”İnsanın mahiyyəti və təbiət”, ”Humanizm və milli şüur”, ”İnsan ən yüksək dəyər və tərəqqinin məqsədidir” kimi düşündürən əsər başlıqları öz siyasi, elmi dəyəri ilə diqqəti cəlb edir.

Onun xüsusi yazı üslubu var, doğma dili dərindən bilir, böyük problemləri sadə dildə deməyi bacarır. T. Rəsulov nəinki

respublikada, həm də keçmiş İttifaq məkanında tanınan şəxsiyyətlərdəndir. Əmək və təşkilatçılıq fəaliyyətinin on səkkiz ili Azərbaycan KP MK aparatı, on səkkiz ili Bakı Ali Partiya Məktəbi və onun varisi BSİPİ ilə bağlıdır. Bu illər ərzində mühazirəçilər qrupunun rəhbəri və fəlsəfə kafedrasının müdiri vəzifələrinin öhdəsindən şərəf və ləyaqətlə gəlib. Moskva, Kiyev, Leninqrad, Novosibirsk, Tbilisi, Daşkənd və digər şəhərlərdə keçirilən Ümumittifaq, respublika, zona elmi nəzəri, elmi-praktik konfranslarda, təbliğatçıların toplanışlarında bacarıqlı, təşkilatçı rəhbər partiya işçisi, elmi ictimaiyyət arasında özünəməxsus nüfuzu olan bir filosof alim kimi iştirak etmiş, keçirilən tədbirlərin gündəliyində müzakirə obyekti olan məsələlərlə bağlı elmi-metodik, tədris-metodik məzmunlu çıxışları rəğbətlə qarşılanmışdır.

Respublikamız dövlət müstəqilliyi əldə edəndən bu günədək Tofiq müəllim özünün maarifçilik və təbliğatçılıq fəaliyyətini uğurla davam etdirir. Onun üçün auditoriya məhdudiyyəti yoxdur, radio-televiziya auditoriyasından tutmuş bir neçə nəfərdən ibarət kiçik qruplarla da işləməyi bacarır. Özünün dediyi kimi, üçün bir nəfər də auditoriyadır.

Azərbaycan dövlətçiliyinin qurulması və möhkəmləndirilməsinə həsr olunan elmi-praktik konfranslarda "Milli ideologiya və sosial ədalət", "Heydər Əliyev müstəqil Azərbaycan dövlət quruculuğunun me"marıdır", "Dövlət müstəqilliyi konsepsiyası" və bu kimi mövzularda mə"ruzələri çoxsaylı dinləyiciləri olan geniş auditoriyalarda maraq doğurmuşdur.

Tofiq müəllim həssas, qayğıkeş, humanist, fəzilətli bir insandır. Onun mühazirələrini dinləyən, seminarlarında iştirak edən tələbələr, dinləyicilər, opponenti olduğu alimlər, həqiqi elm adamları, filosoflar və hər gün onun müdrik söhbətlərini eşidən, eşidə-eşidə özü üçün nəticə çıxarmağı bacaranlar Tofiq müəllimin kimliyini qiymətləndirə bilərlər. Bu insan sərrafı, son dərəcə sadə, mehriban, ixtisasını mükəmməl bilən alim-müəllim-pedaqoqu

elmində və tərbiyəsində tam formalaşmayanlar necə var elə duya bilməzlər... Tələbənin ehtiyacını, çətinliyini, arzu və istəyini nəzərə almaq, dar məqamlarda köməklik göstərmək keyfiyyətləri Tofiq müəllimə xasdır. Təhsil aldığım illərdə çox müəllim-alim görmüşəm. Elələri var ki, özü qəsdən tələbəni çətinə salır, öyrətdiyini deyil, xüsusən öyrətmədiklərini soruşmaqla özünün xoşagəlməz obrazını yaradır... Tofiq müəllim ideal filosofun, bəşəri arzularla yazıb-yaradan pedaqoq-müəllimin ümumiləşdirilmiş obrazıdır. O, tanıdığı-bildiyi adamları hamını ziyalı, adət-ən”ənələrimizin yaşadılmasında aparıcı bir qüvvə kimi görmək istəyir. Təkcə Gədəbəyin təbiətinin əsrarəngizliyi, dağlarının vüqarı deyil, bütün Azərbaycanın təbii gözəllikləri və bir də insanların mə”nəvi kamilliyi onun həyat və ilham qaynağıdır. Ona görədir ki, ömrü boyu müqəddəsliyi, ucalığı, ülviliyi yaşada-yaşada, cəmiyyətin və şəxsiyyətin mə”nəvi həyatının fəlsəfi təhlilini verə-verə müdrikləşib, müqəddəsləsşib. Sadə adamların ləyaqətinə hörmət etməyi vətəndaşlıq, ziyalılıq üçün mə”nəvi dəyər və borc sayıb. Hansı işdə işləyibsə, hansı mövzuda yazıbsa, ziyalı nüfuzunu qoruyub, elmi ictimaiyyətin hörmət və ehtiramını qazanıb. Ömür səlnaməsinin ayrı-ayrı məqamlarında oturub-durduğu, dostluq-yoldaşlıq, əməkdaşlıq etdiyi görkəmli şəxsiyətlərdən Firudin Köçərli, Məqsəd Səttarov, Cəmil Əhmədli, Camal Mustafayev, Seyfəddin Qəndilov, Fuad Qasımzadə, Həsən Şirəliyev, Zakir Bağırov, Ziyəddin Köyüşov, Nurqələm Mikayılov, Qurban Yusifzadə, Həmid İmanov, Məmmədəli Zeynalov, Adil Nəcəfov, Adil Mənsimov, Maqsud Cəlilov, İmran Cəfərzadə, Dəmir Alməmmədov, Qurban Bayramov, Əmrəli İsmayılov və onlarca başqalarının oynadığı rolu böyük qürur hissi ilə söz-söhbətlərində yaşadır, həyat və fəaliyyətini bəşəri duyğulara qovuşduran elmi idrakın başlanğıc yolu kimi qiymətləndirir.

Tofiq müəllim hansı vəzifədə işləməsindən asılı olmayaraq, respublikanın rəhbər işçiləri arasında öz xüsusi sambalı, mənəvi və ziyalı zənginliyi ilə sayılıb. İttifaq miqyasında keçirilən bütün

tədbirlərdə nümayəndə heyətinin tərkibində respublikamızın ziyalılarını şərəflə təmsil edib...

T. Ə. Rəsulovun-yüksək hörmət və nüfuz sahibi bu insanın təltifləri, fəxri fərmanları var. Ən böyük təltif və mükafatı respublikanın ictimaiyyəti, həmkarları, tanış-dostları, tələbələri arasında qazandığı ülvi məhəbbət və sevgidir. Bu sevgi kökəbağlılıqdan irəli gələn sevgidir, nəsildə, gendə yaşadılan məhəbbətdir. Bu deyilənləri mərhum şairimiz Hüseyn Arifin "Ədəbiyyat və incəsənət" qəzetinin 4 noyabr 1978-ci il tarixli sayında "Gedək Gədəbəyə, gedək" şe"rindən də aydın seçmək mümkündür:

***...Könlümün sazında inlədi bir sim,***
***Gəzdi barmaqlarım qəm tellərində.***
***Bir müəllim vardı,Əli müəllim!***
***Yerişi, duruşu yerli-yerində .***

***Duydum istisini nur kamalının ,***
***Məclisdə bir durub, bir oturanda***
***Düşdüm sorağına aşıq Alının***
***Onunla bir axşam Arıqıranda.***

***Yaşıl həyətdəki o şirin ülfət***
***Xəyaldan silinməz bir səhifədir;***
***Qədim ustadlardan uzandı söhbət,***
***Mən dedim, o dedi, Qaytaran dedi .***

***Kitablar varlığı, qələmlər canı,***
***Tarixlər fikrində varaqlanırdı,***
***Uşaq vicdanı tək təmiz vicdanı,***
***Palıd vüqarı tək vüqarı vardı...***

Bu şe'rdə adı böyük ehtiramla çəkilən Əli müəllim Respublika ictimaiyyətinin çox yaxından tanıdığı, uzun illər Zəngilan

rayonunda rəhbər vəzifələrdə işləmiş bir şəxsiyyətdir. Onun Aşıq Alı irsinin toplanmasında, ümumiyyətlə aşıq yaradıcılığının inkişafında elmi tədqiqat aparanlara köməklik göstərməkdə əvəzsiz xidmətləri vardır. Respublikanın məşhur adamları ilə tez-tez görüşər və məktublaşardı…

Əli müəllimin Gədəbəyin «Tərəqqi» qəzetində dərc olunan məqaləsi haqqında Azərbaycanın görkəmli filosofu, professor Ziyəddin Bahadur oğlu Göyüşovun yazdığı məktubdakı sözlər nə qədər səmimidir: «Hörmətli Əli müəllim! Məktubunuzu və «Tərəqqi» qəzetində dərc olunmuş məqalənizi oxudum. Mənim «Sədaqət köhnəlmir» adlı məqaləmə diqqət yetirdiyiniz və ona xüsusi qiymət verib, haqqında xüsusi məqalə yazdığınız üçün Sizə ürəkdən təşəkkür edirəm və dərin minnətdarlığımı bildirirəm.

E’tiraf edirəm ki, əxlaq – etika mövzusunda az-çox yazdığım hər nə varsa, buna məni xalqımızın Sizin kimi kamil, müdrik, zəki oxucuları sövq etmişdir. Sizin kimi təmiz, saf, qərəzsiz, paxıllıq və başqa rəzalətlərdən uzaq oxucuların qiymətini zəhmətimə və əsərlərimə verilən ən yüksək mükafat hesab edirəm. Bu əsərlər heç bir mübaliğəsiz, müəyyən mə’nada xalqımızın ümumi zəkasının məhsuludur.

Sizə möhkəm can sağlığı, könül xoşluğu və qəlb rahatlığı arzu edirəm. Dərin ehtiramla Z.Göyüşov, «Hörmətli Əli müəllim! Bir ustadım kimi «Fəzilət və qəbahət» kitabımı – bu kiçik hədiyyəmi Sizə təqdim edirəm». Z. Göyüşov 15 sentyabr 1975-ci il».

Əli müəllim haqında yazılan, deyilən nə qədər xoş sözlər varsa, hamısı onun yaşadığı ərazinin təbiəti və burada yaşayan insanların saflığı ilə bağlıdır, buranın adamlarının paklığından, insanı və şəxsiyyəti qiymətləndirmək bacarığından irəli gəlir. Bu ülvi gözəllikləri duymaq və duyulanları mə’nəvi dəyər kimi insanlarla bölüşmək yalnız Əli müəllim kimi şəxsiyyətlərə xasdır... Əli müəllim Göyçə mahalı ilə qəlbən bağlı olan bir insan, rəhbər işçi kimi yaddaşlarda yaşayır. Doğma rayonunda rəhbər vəzifədə işləyəndə Göyçədə ermənlərin etdiyi haqsızlıqlardan doğma yurd-yuvasını tərk edib Gədəbəyin kəndlərinə pənah gətirən

soydaşlarına qayğı ilə yanaşılmasına, onlar üçün həyətyanı torpaq sahələrinin ayrılması üçün əməli addımlar atılmasına həssaslıq göstərməsini indi də yaşlı adamlar böyük fəxrlə danışırlar. Belə humanist şəxsiyyətlərin yolu ilə getmək müqəddəs bir işdir. O yolu yalnız oğullar gedirlər… Ona görə də ataların yolu oğulların yoludur,- deyiblər. Tofiq müəllimin atası Əli müəllimə həsr olunan bu poetik misralar, həmçinin filosofun yazdığı qeydlər ata-bala onların hər ikisinə aiddir. Axı, ayrı-ayrı adamların həyatının mə”nasına qiymət vermək üçün müəyyən obyektiv ölçü mövcuddur. Bu ölçüyə görə o həyatı ictimai mə”nalı həyat hesab etmək olar ki, bu həyat mərhum filosof Z. B. Göyüşovun “Əxlaqi sərvətlər” əsərində qeyd etdiyi kimi, ” mütərəqqi tarixi inkişafın qarşıya qoyduğu tələblərə cavab verən əxlaq normaları daxilində bu tələblərin yerinə yetirilməsinə, cəmiyyətin mütərəqqi inkişafına, öz xalqının, vətəninin tərəqqisi naminə xidmət etmiş olsun... Həyatın mə”nası bu həyatın özünə xidmət etməkdən ibarətdir”. Tofiq müəllimin bir alim kimi həyatı bu ifadələrlə üst-üstə düşür. İnsanların, şəxsiyyətin mə'nəvi həyatının fəlsəfi məsələlərini öyrənmək onun elmi fəaliyyətinin əsas istiqamətlərindəndir. Onu düşündürən məsələlərdən biri müasir dövrdə insanların həqiqi mə”nəvi dəyərlərə yiyələnməsi və insan qəlbini və cəmiyyəti pozan yalançı dəyərlərdən necə qorumaq məsələsidir.

Tofiq müəllim təvazökar, özünətələbkar, bununla yanaşı, özünün yüksək insani ləyaqətini qiymətləndirən müdrik bir insandır, sevimli müəllimdir. Təbiətə vurğunluğundan ömrünün yetmişinci baharının sahilləri həmişə olduğu kimi, yenə də güllü-çiçəklidir. Bu sahillər yaşıllıqlara qərq olub... O, bu yaşıllıqlar qoynunda əngin səmalara yüksələn başı qarlı uca dağların zirvələrini böyük sevgi və məhəbbətlə özünə məskən seçən bir qartalı xatırladır.

## İQTİSADÇI ALİM, YAZIÇI-PUBLİSİST ÖMRÜ



2002-ci ilin yanvar ayının doqquzunda Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının bütün kollektivi onlar üçün doğma və əziz olan, ömrünü-gününü iqtisad elminin inkişafına həsr edən. əməkdar elm xadimi, respublikamızın ictimaiyyəti arasında böyük nüfuz qazanan, son dərəcə həssas və qayğıkeş bir insan kimi tanınan Əbülfəz Kərbəlayı Cəbrayıl oğlu Qasımovun anadan olmasının 70-illik yubileyini təntənə ilə qeyd etmişdir .

Akademiyanın rektoru, əməkdar elm xadimi, professor Seyfəddin Qəndilov cənablarının Əbülfəz müəllim haqqında söylədiyi fikirlər, onun ictimai-siyasi həyatda fəal iştirakının bəzi məqamlarına dair xatiratları və səmimi ürək sözləri buraya toplaşanların qəlbində daha dolğun təəssürat yaratdı. Yubliyarın keçdiyi ömür yolunun, sözün əsl mənasında, nəsillərə əvəzsiz bir nümunə olduğunu vurğulaması alqışlarla qarşılandı.

Onun bu sevincli, bu fərəhli günündə hamı kimi, mənim də deməyə ürək sözlərim vardı: Bu möhtəşəm, həm də elitar təhsil ocağının auditoriyalarında Əbülfəz müəllimin keçdiyi dərslərin çoxsaylı müdavimlərindən biri olduğumu yada salanda ikiqat fərəh hissi keçirməklə, onun gənclik eşqi ilə oxuduğu mühazirələr, elmi-nəzəri-praktik məsələlərin aktual problemlərinə həsr etdiyi canlı və maraqlı seminar məşğələləri, keçirdiyi elmi-əməli konfranslar, burada irəli sürülən müddəaların bacarıq və vərdişlərə çevrilməsi üçün göstərdiyi alim-müəllim qayğıkeşliyi, rəhbər kadrlar hazırlayan pedaqoq tələbkarlığı indi respublikamızın aqrar sənaye kompleksinə daxil olan

strukturlarda, elmi-tədqiqat və təhsil ocaqlarında çalışan keçmiş müdavimlərinin həyat yolunu işıqlandırdığı barədəki düşüncələrim məni çox da uzaq olmayan keçmişə apardı.

Azərbaycan ictimaiyyəti Əbülfəz müəllimi təkcə alim, ictimai xadim kimi tanımır. Bu adın müqəddəs saydığımız çörəklə, bərəkətlə, halallıqla bağlı səciyyəvi cəhətləri özündə ehtiva edən çalarları da vardır. Yazıçı-publisist kimi onun 1988-ci ildə «Yazıçı» nəşriyyatında işıq üzü görən «Mənim çörəkli dünyam» kitabını oxuyanlar onun tərcümeyi-halına daha yaxından bələd olarlar. Bu kitab haqqında hələ o zamanlar mərkəzi mətbuatda dərc olunan məqalələri, respublikanın tanınmış şəxsiyyətlərinin ürək sözlərini bir oxucu kimi bu gün mən böyük məmnunluqla yad edirəm. Bu kitab barədə yazılan, Əbülfəz müəllimin yaradıcılığına verilən qiymət haqqında adlı-sanlı ziyalılarımızın bir neçəsinin sözlərini oxucu diqqətinə yetirmək istəyirəm: Görkəmli ictimai xadim, mərhum akademikimiz İman Mustafayevin -- ***«Təbiət zəngindir, hər gülün, hər çiçəyiin öz ətri vardır. Amma bu zəriflik içində çörəyin ətrinə çatanı yoxdur…»,*** akademik Fuad Qasımzadənin -- ***«Bu kitabı çörək haqqında «Himn» adlandırıram.Arzum budur ki, çörək ətri saçan bu himn daim dünyamızda, hər bir ailədə çalınsın, onun əks-sədası bütün cahana yayılsın»***, filologiya elmləri doktoru, mərhum alim Nazim Axundovun -- ***«Bu kitab müqəddəs nemət barədə «Dastan»dır, əsl «nəsihətnamə»dir. Gənc nəslin təlim-tərbiyəsində onun müstəsna rolu şübhəsizdir»***, xalq şairi Məmməd Arazın -- ***«Mənim çörəkli dünyam» kitabını qızlarına cehiz qoyan analar haqlıdırlar. Çünki bu kitabda çörək işığında ən ülvi və xeyirxah insani duyğular inci kimi sapa düzülmüşdü…»*** kimi dəyərli, məntiqli, insan duyğularını ehtizaza gətirən kəlamları oxuyanlar Əbülfəz müəllimin qənirsiz qələm sahibi olmasını təsdiqləməklə yanaşı, onun tədqiqatçı alim kimi elmi-publisist, bədii-sənədli yetgin, dəyərli bir əsər ərsəyə gətirən müəllifin keçirdiyi narahatçılıqlara qibtə edir.

Qibtə edilən sənətkarın əsəri barədəki bu poetik ifadələr həm də Əbülfəz Bərəkət şəxsiyyətinə, onun bədii yaradıcılığına verilən qiymətdir. Onun alim təxəyyülünə, yazıçı düşüncəsinə, publisist idealına sənətdə, elmdə, ictimai həyatda püxtələşmiş müdrik oxucu rəyləridir.

Möhtərəm Prezidentimiz cənab H.Ə.Əliyevin respublikamıza rəhbərlik etdiyi 1969-1982-ci illər və Moskvada işlədiyi vaxtlar yaxşı yadımdadır. O zamanlar Əbülfəz müəllim Azərbaycanda kənd təsərrüfatının inkişaf perspektivlərinə, kənd təsərrüfatının aqrar-sənaye yönümündə ixtisaslaşması və təmərküzləşməsi məsələlərinə elmi əsaslarla yanaşan, bunlara ayrı-ayrı kənd təsərrüfatı rayonlarındakı nümunəvi kolxoz və sovxozların timsalında iqtisadi təhlil verən alim kimi şöhrət tapmışdı. Rəhbər orqanlarda çalışanlar ondan məsləhət almağa, onun rəhbərliyi ilə respublika əhəmiyyətli tədbirlər keçirməyə daha çox təşəbbüs göstərərdilər.

Əbülfəz müəllimin tövsiyəsi ilə respublikanın rəhbərliyi qarşısında bu və ya digər məsələnin əməli həlli üçün qərar hazırlanması təklifləri irəli sürülərdi. Bünövrəsi Qəşəm Aslanovun və Əhəd Kərimovun təşkilatçılığı ilə işlənən və hazırlanan, rəhbər orqanlar qarşısında qaldırılan, eyni zamanda «Şuşa şəhərində kurort kompleksini daha da inkişaf etdirmək tədbirləri haqqında» Azərbaycan KP MK-nın və Respublika Nazirlər Sovetinin birgə qəbul etdiyi qərar əsasında Şuşa rayonundakı təsərrüfatların tərəvəzçilik, ətçilik və südçülük istiqamətində ixtisaslaşması barədə nəzərdə tutulan bəndlərinin ideyaçısı Əbülfəz Qasımov olmuşdur.

Əbülfəz müəllimin tez-tez Qarabağda, onun zümrüd tacı Şuşada qonaq olmasını, Ağdamda yaratdığı «Çörək» muzeyi ilə bağlı qayğılarını, narahatçılıqlarını, «Mənim çörəkli dünyam» kitabının ***«Dəyirmana gedən yollar», «Dübəndi çayı», «Müəllimimin dedikləri», «Anamın gəlinlik paltarı», «Xırman gecələri» kimi fəsillərinin, həmçinin « Xanqızının harayı»*** məqaləsinin yazıldığı anlar Şuşa xatirələrini çözələyir…

Böyükdən kiçiyə hamı Əbülfəz müəllimi tanıyırdı. O, şəhərə gəzməyə çıxanda adamlarla öz doğmaları kimi görüşər, vəziyyətləri barədə hal-əhval tutar və müəyyən problemdən çətinlik çəkənlərə köməklik etməyi özünə mənəvi borc sayardı. Hammaloğlu Hüseynin ailəsində əziz qonaq olsa da, bütün şəhər əhli onu öz əziz mehmanı sayardı. Əbülfəz müəllimin yaxından tanıdığı adamlar onunla görüşmək, söhbət aparmaq, müəyyən məsələlərin həllinin səmərəli yolları barədə məsləhətləşmək üçün göstərdikləri təşəbbüslər faydalı nəticələr verərdi…

Həm Ə. Qasımov, həm də bizlər üçün əziz və unudulmaz olan yubiley təntənəsində ürəyimdən keçən duyğuların bir hissəsini poetik misralara çevirdiyim « Gəlir» rədifli qoşmanı oxuculara təqdim etməyi özümə borc bildim:

*Ünvanına səcdə qılır nəsillər,*
*Sorağın çox uzaq ellərdən gəlir.*
*Əkib-becərdiyin gülün, çiçəyin*
*Təravətli ətri illərdən gəlir!*
*Yetmiş illik ad gününə dostların;*
*Toplaşıbdır şad gününə dostların…*
*Sədaqətin, məhəbbətin dostların*
*Ərmağan etdiyi güllərdən gəlir!..*
*Məsum körpə ikən sıxsa da zaman,*
*Cəlillər, Cavidlər yurdu Naxçıvan*
*Qoymadı tək-tənha, nə də ki giryan…*
*Bilirsiz, dahilik genlərdən gəlir!..*
*Hamıya doğmasan, dostsan, Əbülfəz!*
*Yerin var tarixdə, heç vaxt silinməz,*
*Sizlərə yar olsun gözə görünməz –*
*Bu duyğu urəkdən, dillərdən gəlir!*

Əbülfəz müəllimin ömür yolu çoxsəhifəli, həm də oxunaqlı bir kitabdır. O kitabı səhifələyən hər bir oxucu ….Əbülfəz müəllimin kamilliyin zirvəsinə ucaldığını, bu zirvənin daha uca, daha

əlçatmaz olduğunu onun yola saldığı mənalı 70 ilin fövqündə qiymətləndirəcəklər. Əbülfəz müəllimin hər şeyi kökündən öyrənməklə qəlbləri oxumaq, ötəri nəzər salmaqla adamların daxili aləmini qiymətləndirmək, dəqiq elmi mülahizələr yürütmək, hər şeyi aydın görmək kimi fitri istedadı diqqəti cəlb edir. Onunla daimi sıx əlaqə saxlayan, məsləhətlərinə, köməyinə mənəvi ehtiyac duyan, onun səciyyəvi xüsusiyyətlərini özündə tərbiyə edib yaşadan çoxsaylı tələbələri adından şanlı yubileyi münasibətilə ürəkdən təbrik edir, can sağlığı, xoşbəxtlik, uzun ömür, yeni yaradıcılıq uğurları arzulayıram…



## NÜFUZLU ZİYALILARIMIZDAN BİRİ

Azərbaycanın dilbər guşələrindən olan Şuşa şəhərinin siyasi-mədəni həyatı görkəmli tarixi şəxsiyyətlərin formalaşmasında mühüm rol oynamışdır. Azərbaycan elminin, incəsənətinin, ədəbiyyatının inkişafına öz layiqli töhfələrini verən bu şəhərdə dünya miqyasında tanınan S. S. Axundov, Y. V. Çəmənzəminli, Üzeyir Hacıbəyov, Bülbül, Rəşid Behbudov, Xan Şuşinski, S. Şuşunski,
Mirzə Xosrov Axundov, Süleyman Ələsgərov, F. Şuşunski… kimi ölməz şəxsiyyətlər dünyaya göz açmış, həyat və fəaliyyətləri ilə özlərindən sonra gələn nəsillərə zəngin irs qoyub getmişlər. Elmi-texniki tərəqqi əsri olan XX yüzillikdə Şuşa mühitində istedadı, qabiliyyəti və ictimaiyyət arasındakı nüfuzu ilə seçilən ziyalı nəsli yetişmişdir. Bunların hamısının adını sadalamaq bir zərurət olsa da, onlardan barələrində hər zaman xoş sözlər eşitdiyim, şəxsən tanıdığım və ünsiyyətdə olduğum ziyalılardan Ə. Əlizadə, A. Hacıyev, K. Qəhrəmanov, A. Babayev, İ. Məhərrəmov, R. Məhərrəmov, Ə. Əhmədov, N. Əlişov, Ə. Rüstəmov, A. Rüstəmov, M. Rüstəmov, İ. Əbilov, S. Zeynalov, H. Allahverdiyev, N. Ağayev, N. Babayev, A. Əliyev, D. Dadaşov, M. Abbasov, E. Əliyev, S. Ağakişiyev, M. Süleymanov, M. Əliyev və dostluq etdiyim onlarca başqalarının adı mənim üçün doğma , əziz olduğu qədər də müqəddəsdir. Onlardan biri də böyük nüfuz sahibi Məmməd Məmmədovdur.

Məmməd Əli oğlu Məmmədov 1923-cü ilin oktyabrında keçmiş Səfərəliyev rayonunun Ziyadlı kəndində anadan olub. Onun mənsub olduğu nəsil Gəncəbasarda ad-sanı ilə məşhur

olduğundan Azərbaycanın əksər bölgə və əyalətlərinin – Qarabağın, Eldarın, Dəstəfurun, Gədəbəyin, Göyçə və Cavanşir mahallarının ən sayılan adamlarının hələ inqilabdan çox-çox əvvəl bu tayfanın ağsaqqalları ilə dostluq əlaqələri olub. Bu ailə ilə dost-tanış olanlar , yaxınlıq edənlər zəndlərində yanılmayıblar. Əksinə bu dostluqdan onlara böyük şərəf, şan-şöhrət nəsib olub… Babasının dostlarının atası Əli ilə davam etdirdikləri doğma münasibətlərini, onların bir-birinə arxa durmasını gəncliyindən müşahidə edən Məmməd, həyatda babası və atası kimi dostcanlı, qonaq-qaralı olmağı, son tikə çörəyini dost-tanışadan əsirgəməyəcəyini arzulayıb. Hərəkətlərində, davranışında onlara bənzəməyə çalışıb. Kökəbağlılığını nümayiş etdirib. Təhsildə, ictimai həyatda fərqlənib. Orta təhsilini müvəffəqiyyətlə başa çatdırdığı bir vaxtda alman faşistlərinin ümumi Vətənimiz olan SSRİ-nin üzərinə qəfləti hücumu başlayıb. Ali təhsil almaq, ailə qurmaq arzusunda olsa da, Vətənin müdafiəsinə səfərbər olunub. Müharibənin başlanğıcından sonunadək qanlı döyüş cəbhələrində Mozdokdan Berlinədək şanlı bir yol keçib… Vətən, xalq qarşısındakı əvəzsiz xidmətlərinə görə doğma azərbaycana sinəsini bəzəyən orden və medallarla qayıdıb… Gəncə Pedaqoji Texnikumuna daxil olub, buranı 1947-ci ildə buranı fərqlənmə diplomu ilə bitirib. Orta ixtisas təhsili almaqla kifayətlənməyib , elə həmin il S. Ağamalıoğlu adına Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun baytarlıq fakültəsinə sənədlərini verərək qəbul imtahanlarından topladığı yüksək balla buranın tələbəsi olub. Döyüşlərdən qələbə ilə qayıdan, tələbə dostlarından yetkin dünya- görüşü, təcrübəsi, iti zəkası ilə seçilən bu gənc, institutun ictimai-siyasi həyatında nümunəviliyi ilə fərqlənir. Perspektivli kadr olduğu nəzərə alınaraq, onun təyinatı bir başa pedaqoji sahəyə - Kürdəmirdəki sovxoz texnikuma müəllim vəzifəsinə verilir.

M. Məmmədov təyinat yerində cəmi üç ay işləyir. Kənd təsərrüfatı Nazirliyinin zəmanəti ilə 1952-ci ilin noyabr ayında M. H. Vəzirov adına Şuşa kənd təsərrüfatı texnikumuna direktor

təyin edilmişdir. Şuşa mühitində Məmməd müəllim çox az müddətdə məşhurlaşmışdır, şuşalıların istəklisinə, doğmasına, keçirilən məclislərin ağsaqqalına çevrilmişdir. Məmməd müəllim fenomeni yaranmışdır. Onunla ünsiyyətdə olmağa, onun rəhbərlik etdiyi kollektivdə işləməyə hamı can atırdı.

Seçkili orqanlarda təmsil olunan Məmməd müəllim dəfələrlə rayonun aparıcı rəhbər vəzifələrinə məsləhət bilinsə də, pedaqoji sahədən uzaqlaşmamış, fasiləsiz olaraq 33 il eyni vəzifədə çalışmışdır.

M. Məmmədov kənd təsərrüfatı mütəxəssisi olmasına baxmayaraq, Şuşa rayonunun sosial-iqtisadi problemlərinə yaxından bələd olan, onun mədəni həyatında əlindən gələni əsirgəməyən bir ziyalı, əvəzi olmayan bir şəxsiyyət idi. Rəhbərlik etdiyi kollektivdə hamı ondan razılıq və böyük məmnuniyyətlə söhbət açar, göstərdiyi qayğı və köməkliyi xüsusilə vurğulayardılar.

Respublikanın heyvandarlıqla məşğul olan rayonlarının baytar və zootexnik kadrlarına olan ehtiyacının ödənilməsində, texnikumun yeni binasının, yataqxana korpusunun tikintisi, şəhərin abadlıq və yaşıllaşdırılması sahəsində görülən işlərdə Məmməd müəllimin böyük zəhməti vardı. Məmməd müəllim olan yerdə işgüzarlıq, səmimiyyət, təbii yoldaşlıq hökm sürürdü. Hamı onu özünə yaxın dost, qohum, yoldaş, valideyn sayırdı. Respublikada tanınan bir çox adamların həyatında Məmməd müəllimin oynadığı rolu bu işə şahid olanlar inkar etməzlər. Məmməd müəllim 1985-ci ilin 18 mayında qəflətən dünyasını dəyişəndə onun matəminə gələnlər sırasında kimlər yox idi?!.. Bu gözlənilməz ölüm onun doğmaları ilə yanaşı, bütün Şuşa əhlini necə sarsıtdığını ifadə edən daha yeni söz və ifadə işlətməkdə acizlik çəkirəm…

M. Məmmədov Şuşanın «Gəncə qapısı» adlanan ərazisində uyuyur. Onun məzarı üzərində ucaldılan mərmər daşın üstündə nəqş olunan bədənnüma əksi gələcəyə çox nikbin nəzərlərlərlə baxırdı… Lakin bədnam erməni millətçilərinin törətdiyi faciələr, torpaqlarımızı işğal etmələri indi onun ruhuna rahatlıq vermir, bu



ruh sanki soydaşlarının geri qayıdacaq köçlərinin «həsrətini» çəkir…

Məmməd müəllim 62 illik həyatının 33 ilini ictimai həyata atıldığı Şuşada yaşayıb, yaradıb, nüfuz və hörməti də burada qazanıb. Həyatda onun arzu və istəklərinə böyük vətəndaşlıq məsuliyyəti ilə əməl edən övladları da Şuşada dünyaya göz açıb, Şuşanın sakini, vətəndaşı adına layiq olduqlarını hər yerdə nümayiş etdiriblər…

Məmməd müəllimin ömür-gün yoldaşı Pakizə xanım əziz və istəkli övladları – Zabit, Sabit, Lətafət və Məlahətlə nəfəs alır, onlarla öyünür. Zabit tibb elmləri namizədidir, Tibb Universitetinin Məhkəmə Tibb Ekspertiza kafedrasının dosentidir . Sabit ixtisasca iqtisadçıdır, Şuşa kənd təsərrüfatı texnikumunun direktorudur, oğluna atası Məmmədin adını qoyub. Lətafət və Məlahət ixtisaslarını mükəmməl bilən həkimlərdir, gözəl və mehriban ailələri vardır. Övladlarını Məmməd müəllimin adına layiq böyüdürlər…

Məmməd müəllimin yaxın qohumlarının əksəriyyəti ilə Şuşada tanış olmuşam. Bu tanışlıqdan sonra səmimi ünsiyyətimiz yaranıb. Hamısının xasiyyətində Məmməd müəllim mehribançılığı, səmimiyyəti, təmkini olduğunu yəqinləşdirmişəm. Qardaşları Tahir və Bəhram Məmmədovlarla, respublikanın prokurorluq orqanlarında işləyən və əmi deyə müraciət etdiyim Saleh Əlizadənin övladlarından bacısı oğlanları - Vilayət, Mehman, Kəramət və Nofəllə, qayınları – Zahid, Səfər, Müzəffər, Valehlə, şərabçılıq sahəsində çalışan Bəndərlə olan görüşlərimiz unudulmazdır.

Bu ailənin yaxınları ilə mən həmişə fəxr etmişəm, indi də edirəm. Allah Məmməd müəllimə rəhmət etsin, məzarı nurla dolsun…

## GÖRKƏMLİ EKOLOQ ALİM

İnsan həyatının unudulmayan, yaddaqalan anları sırasında tələbəlik

illərinin özünəməxsus yeri var. Aldığı ixtisasdan, gələcəkdə hansı vəzifəni aparacağından asılı olmayaraq, hər kəs ictimai həyata bu illərdə atılır, özünün fəal həyat mövqeyi ilə dostlarının yaddaşına həkk olur. Gəncliyində necə səmimi, sadə, mehriban, qayğıkeş, dostcanlı, nailiiyyətinə sevinən, məhrumiyyətinə ürəkdən təəssüflənən dostları heç vaxt unuda bilmisən. Belə dostların yaşa dolanda reallıqlara əsaslanan mənəvi keyfiyyətlərini görəndə və ya geniş ictimaiyyət tərəfindən dəyərləndirildiyini eşidəndə qəlbində xoş duyğular baş qaldırır. Fərəhindən özünü dünyanın bəxtəvəri sanırsan.

Çoxsaylı tələbə dostlarım, iş yoldaşlarım olub. Onların hamısı ailəmiz üçün əzizdir. Əksəriyyəti ilə gənclikdə necə bir-birimizə ərklə müraciət etmişiksə, indi də həmin təbiilik qalmaqdadır. O təbii münasibətləri yaşadanlardan, dostlarının fəxri sayılanlardan biri də gözəl ailə başçısı, ictimai-siyasi xadim, elm təşkilatçısı, dünyada tanınan siyasətçi Heydər Əliyev məktəbinin sınaqlardan çıxmış, mübariz və tələbkar rəhbərlərindən biri, görkəmli ekoloq alim, professor Qərib Şamil oğlu Məmmədovdur.

***O, 1947-ci ilin yanvar ayının 6-da Qərbi Azərbaycanın Amasiya rayonunun Yeniyol kəndində anadan olub. Səkkizilliyi təhsilini doğma kənddə başa vurduqdan sonra Amasiya rayon mərkəzindəki orta məktəbiə bitirib. 1966-70-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunun biologiya-coğrafiya fakültəsində coğrafiya ixtisası üzrə təhsil alıb. 1973-76-cı illərdə Azərbaycan EA Torpaqşünaslıq və Aqrokimya İnstitutunun aspiranturasında oxuyub. 1978-ci ildə həmin institutda namizədlik, 1991-ci ildə Ukrayna Respublikası***

***Dnepropetrovsk Dövlət Universitetində doktorluq dissertasiyasını müdafiə edib, 1992-ci ildən professordur.***

Professor Q. Ş. Məmmədov ABŞ-Hüyuston, Fransa-Montelye, Türkiyə-Adana, İsveçrə-Sürix, İran-Təbriz, Rusiya-Moskva, Ukrayna-Kiyev, Xarkov, Özbəkistan-Daşkənd, Qazaxıstan-Alma-Ata, Moldova-Kişinyov, Gürcüstan-Tibilisi, Ermənistan-İrəvan, Qırğızıstan-Bişkek, Tacikistan-Düşənbə şəhərlərində keçirilən beynəlxalq və regional konfransların iştirakçısı olub. Otuzdan çox gənc alimin namizədlik və doktorluq dissertasiyasının uğurla müdafiəsinə elmi rəhbərlik edib.

O, keçmiş SSRİ EA Ümumittifaq Torpaqşünaslıq Cəmiyyəti Mərkəzi Şurasının V. V. Dokuçayev «Rus qaratorpağı» kitabının 100 illiyinə həsr edilmiş yaddaş medalı (1983), XTNS-nin Bürünc medalı ilə (1987) təltif edilib.

Professor Q. Məmmədov Azərbaycan Milli Elmlər Akademiyası Torpaqşünaslıq və Aqrokimya İnstitutunda kiçik elmi işçi, böyük elmi işçi, laboratoriya rəhbəri, direktor vəzifəsində çalışıb. Hazırda həmin institutun «Torpaqların aqroekologiyası və bantirovkası» laboratoriyasının rəhbəridir. Azərbaycan Respublikası Dövlət Torpaq və Xəritəçəkmə Komitəsinin sədridir. Onun 300-dən artıq elmi əsəri, on monoqrafiyası, 20-dən çox metodik tövsiyəsi və kitabçası, 2 tərcümə kitabı İspaniya, Fransa, Türkiyə, Polşa, İran, Rusiya, Ukrayna, Gürcüstan və digər MDB ölkələrində çap olunub. 18 müəlliflik şəhadətnaməsinin və 4 səmərələşdirici təklifin müəllifidir. Azərbaycan Respublikasının ekoloji problemlərinin sistem halında öyrənilməsi konsepsiyasının yaradıcısıdır. Torpaqların iqtisadi və ekoloji cəhətdən qiymətləndirilməsi məsələlərinin elmi əsaslarla həlli, elmi işlərin nəticələrinin torpaq islahatı prosesində tətbiqi, torpaqların münbitlik modellərinin yaradılması, torpaq örtüyünün öyrənilməsi metodikası, relyefin plastikasının nəzərə alınması üsulu ilə torpaq xəritələrinin hazırlanması metodologiyası və ekologiyası sahəsində görkəmli , özü də yeganə mütəxəssisdir.

Q. Məmmədovun «Elm» nəşriyyatında Moldova Elmlər Akademiyasının akademiki İ. A. Krupenikovun elmi redaktorluğu ilə çapdan buraxılan «Azərbaycan torpaqlarının ekoloji qiymətləndirilməsi» monoqrafiyasında Azərbaycan respublikasının torpaqlarının münbitliyinə təsir göstərən amillər, onların regional xüsusiyyətləri, coğrafi yayılması qanunauyğunluqlarından söhbət açılır, torpaqların ekoloji qiymətləndirilməsinin nəzəri və metodiki problemlərinin həlli yolları göstərilir. Torpaqların ənənəvi və müasir üsullarla bontirofkasının, pul ilə qiymətləndirilməsinin və münbitliyinin ekoloji modellərinin təhlili verilir.

Əsər həm ixtisas sahibləri – torpaqşünaslar, coğrafiyaçılar, ekoloqlar, aqronomlar, həm də kənd təsərrüfatı profilli institutların tələbələri üçün dəyərli vəsaitdir.

Azərbaycan MEA-nın müxbir üzvü Q. Ş. Məmmədovun «Elm» nəşriyyatında 2002-ci ildə çapdan buraxılan **«Görkəmli təbiətşünas, böyük ziyalı»** kitabı görkəmli alim və ictimai xadim Həsən Əlirza oğlu Əliyevin anadan olmasının 95 illiyi münasibətilə(1907-2002) ömür yoluna, elmi-ictimai fəaliyyətinə həsr olunmuş, eyni zamanda onun həmin nəşriyyatda işıq üzü görən **«Azərbaycanın torpaq ehtiyatları», «Azərbaycanın meşələri»** (coğrafiya elmləri doktoru Mahmud Yusif oğlu Xəlilovla birgə), **«Azərbaycanın şimal-şərq əkinçilik zonası torpaqlarının qiymətləndirilməsi»** (Vidadi Quliyevlə birgə ) monoqrafiyaları oxucular, xüsusən də xalq təsərrüfatının bu mühüm sahələrində çalışan mütəxəssislər tərəfindən rəğbətlə qarşılanmışdır.

Q. Məmmədov 1994-99-cu illərdə Ali Attestasiya Komissiyasının kənd təsərrüfatı üzrə ekspert komissiyasının Elmi katibi olub, hazırda həmin komissiyanın üzvüdür. O, 1995-ci ildə birinci çağırış Azərbaycan Respublikası Milli Məclisinə deputat seçilmişdir.

Bir sıra xarici ölkələrin təhsil və elm müəssisələri ilə əməkdaşlıq edən Q. Məmmədov 2001-ci ildə Azərbaycan MEA-nın müxbir üzvü seçilmişdir, Rusiya Ekologiya Akademiyasının və Beynəlxalq Ekoenergetika Akademiyasının akademiyasının akademikidir.

Qərib müəllim tələbkar rəhbər, ictimai-siyasi xadim, elm təşkilatçısı, səmimi, qayğıkeş , nəsillərə nümunə olan həssas bir insandır. Dost-tanışlarına, tələbə və iş yoldaşlarına, həmkarlarına qarşı olduqca mehribandır. Gözəl ailə başçısıdır. Ailə üzvləri onu sonsuz bir məhəbbətlə sevir. İki övlad atasıdır. Qızı Təranə ali məktəbi bitirib. Oğlu Ruzi Azərbaycan İqtisad Universitetinin tələbəsidir. Bir nəvəsi var.



## QARA MUSTAFA OĞLU NAMAZOV

**F**ilologiya elmləri doktoru, BDU-nun Azərbaycan ədəbiyyatı kafedrasının professoru, respublikanın əməkdar müəllimi, Azərbaycan Yazıçılar Birliyini və Aşıqlar Birliyi İdarə Heyətinin üzvü Qara Mustafa oğlu Namazov 1930-cu il mayın 8-də Qərbi Azərbaycanın keçmiş Qazax nahiyəsinin Əmirxeyir kəndində doğulub. Doqquzuncu sinfə qədər həmin kənddə və qonşu Gölkənd kəndində təhsil alıb. 1948-ci ildə türkdilli əhalinin deportasiyası ilə bağlı Ağstafa rayonunun Dağkəsəmən kəndinə gəlib, burada orta məktəbi bitirib. Ordu sıralarında (1951-1955) xidmət etmişdir. Ədəbi fəaliyyətə 1956-cı ildə «Sovet Ermənistanı» qəzetində çıxan «Vətən», «Kəndimizin qızları» adlı ilk şerləri ilə başlamışdır. Sonra «Ədəbi Ermənistan», «Tər çiçəklər», «Gənclik nəğmələri», «İlk addımlar», «Gənc qələmlər» və s. almanaxlarda silsilə şerləri, S. Vurğunun gəncliyinə həsr edilmiş «Bir qərinədə» poeması dərc olunmuşdur. ADU-nun filologiya fakültəsinin kitabxanaçılıq şöbəsini bitirmişdir (1956-1961). Buranın mərkəzi kitabxanasında şöbə müdiri, sonra Azərbaycan EA-nın Tarix İnstitutu kitabxanası və arxivinin direktoru olmuşdur (1959-1967). Eyni zamanda Nizami adına Ədəbiyyat İnstitutu şifahi ədəbiyyat şöbəsinin qiyabi aspiranturasında təhsilini davam etdirmişdir. «Azərbaycan aşıq şerinin inkişafı tarixindən» mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir (1968). ADU-nun kitabxanaçılıq fakültəsində müəllim, baş müəllim (1966-1970) işləmiş, sonra filologiya fakültəsinin Azərbaycan sovet ədəbiyyatı kafedrasına dosent

keçmişdir. «Azərbaycan sovet uşaq və gənclər ədəbiyyatının inkişaf mərhələləri (1920-1985)» mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir (1987). Q.Namazov üç istiqamətdə ədəbi, elmi və pedaqoji fəaliyyətini davam etdirmişdir: şifahi xalq ədəbiyyatı və aşıq yaradıcılığı, Azərbaycan uşaq ədəbiyyatı, pedaqoji sahədə. O, aşıq yaradıcılığı ilə bağlı «Aşığın sazı və sözü» (1980), Azərbaycan və rus dilində «Azərbaycan aşıq sənəti» (1984) kitabları, ayrı-ayrı toplularda elmi-publisistik məqalələr çap etdirmişdir. Dədə Qorqud, Sarı Aşıq, Qurbani, Koroğlu, Qaracaoğlan, Abbas Tufarqanlı, Xəstə Qasım, Dədə Ələsgər, Molla Cuma, Hüseyn Bozalqanlı və Aşıq Şəmşirin rus dilində çap olunan seriya kitablarının birinə ilk ön söz yazmışdır.

Qara müəllim respublikada uşaq ədəbiyyatının kursunu yaratmışdır. Uzun illər bu sahədə dərs deyərkən kursun proqramını, iki cilddən ibarət «Azərbaycan uşaq ədəbiyyatı antologiyası», didaktik –nəsihətamiz şerlərdən ibarət «Oğluma nəsihət», «Balalara töhfə», ayrı-ayrı sənətkarların əsərlərindən seçmələr, «Günəş verək uşaqlara», «Deyin, gülün, övladlarım!», «Gəl, gəl, a yaz günləri», «Mənim kitabım» toplularını və bütün bunların zəminində ilk dəfə olaraq o, «Azərbaycan uşaq ədəbiyyatı» (1984) ali məktəb dərsliyini çap etdirmişdir. «Azərbaycan Ensiklopediyası» Nəşriyyat-Poliqrafiya Birliyi tərəfindən onun xalq yaradıcılığından seçmələrdən nəfs tərtibli beş kitabı işıq üzü görmüşdür. Professor Q. Namazov çox elmi-bədii əsərlərin redaktoru, rəyçisi olmuşdur. Uzun illər BDU-da və başqa ali məktəblərdə xarici ölkələrin uşaq ədəbiyyatından, müasir lirika və ədəbi tənqid, poema janrı, S, Vurğun yaradıcılığından, şifahi xalq ədəbiyyatından, müasir ədəbiyyatdan ümumi və xüsusi kurslar aparmışdır. Bakıda və Türkiyənin müxtəlif şəhərlərində, Bolqarıstanda aşıq sənətinə və Azərbaycan - türk folkloruna dair konfranslarda məruzələr etmişdir.1996-cı ildə Silivke(Türkiyə) şəhərində keçirilən türk boyları konfransında «türk» sözünə və Azərbaycan-türkmən folkloru

əlaqələrinə dair etdiyi məruzələrinə görə adı üzərinə həkk olunmuş 2 medalla mükafatlandırılmışdır. Kitabları və özü haqqında Türkiyədə və İranda məqalələr çap olunmuşdur. Dərslikləri və monoqrafiyaları Türkiyə və İranın ali məktəblərində tədris olunur. Q. M. Namazov Nizami adına Ədəbiyyat İnstitunun sifarişilə «13-18-ci yüzilliklərdə Azərbaycan şifahi xalq ədəbiyyatı və aşıq yaradıcılığı» (10 ç.v.) elmi əsərini institutun hazırladığı çoxcildli ədəbiyyat tarixi redaksiyasına vermişdir. Ümumiyyətlə, Q. Namazovun monoqrafiya, dərslik, dərs vəsaiti və müxtəlif tərtiblərdən ibarət 30-a qədər kitabı və 300-ə yaxın elmi-nəzəri və publisist məqaləsi çap olunmuşdur.

Q.Namazov tərcümə işi ilə də məşğul olmuş, V.Şufun (Borst) Şamaxı zəlzələsindən bəhs edən «Səlimə» poemasını, Qaracaoğlanın «Aramızda qarlı dağlar dayanıb» şerlər toplusunu geniş ön sözlə (İ. Vəliyevlə birlikdə), Yan Raynisin, Lesya Ukrainkanın şerlərini dilimizə çevirmişdir.

Q.Namazov Milli Zadəgan Universitetində(1994-1995), Ali Tətbiqi Elmlər Kollecində (1995-1998) ümumfənlər kafedrasının müdiri işləmiş, şifahi xalq ədəbiyyatından, uşaq ədəbiyyatından və müasir ədəbiyyatdan mühazirələr oxumuş, həmin ali məktəblərdə elmi şuranın üzvü olmuşdur. Q.Namazovun rəhbərliyilə 10 nəfər dissertasiya işi müdafiə edərək filologiya elmləri namizədi alimlik dərəcəsi almışlar. 25 doktorluq və namizədlik işinə opponent olmuşdur. O, Respublika Təhsil Nazirliyi elmi-metodiki şurasının, Bakı Dövlət Universiteti EŞ-nın və filologiya fakültəsi elmi şurasının, Nizami adına Ədəbiyyat İnstitutu folklor bölməsi elmi şurasının, fakültənin ixtisaslaşdırılmış müdafiə şurasının, EA Şəki Regional müdafiə şurasının üzvü, Dədə Qorqud Elmi Tədqiqat Laboratoriyasının rəhbəridür. O, uzun illər Dağlıq Qarabağın mərkəzi Xankəndində fəaliyyət göstərən Pedaqoji İnstitutun dövlət imtahan komissiyasına rəhbərlik etmiş, ermənilərin azərbaycanlılara qarşı yeritdiyi məkrli siyasətini yerindəcə tənqid etmişdir.

Q.Namazovun araşdırmalarından biri də Amerikada yaşayan qırmızıdərililərin türksoylu olması və bəzi qəbilələrin məhz Azərbaycandan getmələrinə dair silsilə yazılarıdır.

Görkəmli alim, yazıçı-publisist Qara Namazov 2002-ci ildən BDU-nun filologiya fakültəsinin dekanı vəzifəsində çalışır. Onun respublika ictimaiyyəti arasında böyük hörmət və nüfuzu vardır. Tanışları, dostları, tələbə və dissertantları Qara müəllimin bəşəri dəyərləri yaşadan bir şəxsiyyət, zəhmətkeş alim, qayğıkeş, səmimi, müdrik bir insan olduğunu yeri düşəndə vurğulamağı həmişə özlərinə şərəf sayırlar…

## ŞAİR, ALİM, NAŞİR, PUBLİSİST



İsmayıl Ömər oğlu Vəliyev 1951-ci il martın 18-də Ermənistanın Allahverdi rayonunn (keçmiş Loru mahalının) Böyük Ayrum kəndində anadan olmuş, orada 8 illik məktəbi, sonra isə Noyemberyan rayonunun Yuxarı Körpülü kəndində orta məktəbi əla qiymətlərlə bitirib Çöçkən və Şınıq sovxozlarında, sonra isə Ağtala tikinti mə'mulatları kombinatında fəhlə işləmişdir. Bakıda 8 nömrəli texniki-peşə məktəbində təhsil almış, oranı fərqlənmə diplomu ilə bitirib "Leninneft" trestinin neft və qazçıxarma idarəsində elektrik montyoru olmuşdur. 1970-1975-ci illərdə Azərbaycan Dövlət Universitetinin jurnalistika fakültəsində təhsil almışdır. Tələbəlik illərində Kiyevdə, Lvovda və Moskvada keçirilmiş Ümumittifaq tələbə-elmi konfranslarında elmi məruzələrlə çıxış edərək birinci dərəcəli diplomlara layiq görülmüşdür. 1975-ci ildən Azərbaycan Dövlət Nəşriyyatında korrektor və redaktor vəzifəsində işləmişdir. 1976-cı ildə Moskva Poliqrafiya İnstitutunda baş redaktor və redaksiya müdirlərinin ixtisasartırma kursunda oxumuş və oranı "əlaçı" diplomu ilə bitirmişdir. 1978-ci ildən "Yazıçı" nəşriyyatında ədəbiyyatşünaslıq və publisistika redaksiyasında redaktor, incəsənət və klassik ədəbiyyat redaksiyasının müdiri, 1980-ci ildən Azərbaycan Dövlət Nəşriyyat, Poliqrafiya və Kitab Ticarəti İşləri Komitəsində Nəşriyyatlar İdarəsinin rəisi, 1984-cü ildən Azərbaycan KP Mərkəzi Komitəsinin təbliğat və təşviqat şöbəsində təlimatçı (1984-1986), mühazirəçi, MK-nın ideologiya

üzrə katibinin köməkçisi (1986-1987), təbliğat və təşviqat şö'bəsi müdirinin mətbuat məsələləri üzrə müavini (1987-1989) vəzifələrində işləmişdir. Azərbaycan Sovet Ensiklopediyası Baş redaksiyasında baş redaktorun birinci müavini (1989-1991), baş redaktor (1991-1992), Azərbaycan-Türkiyə birgə müəssisəsi "Göytürk" Nəşriyyat, Poliqrafiya və Ticarət Şirkətinin Baş direktoru (1991-1992) olmuşdur. 1993-cü ildən "Azərbaycan Ensiklopediyası" Nəşriyyat-Poliqrafiya Birliyinin Baş direktoru və Baş redaktorudur.

1971-ci ildən Azərbaycan Radio və Televiziyası ilə əməkdaşlıq edir. Belə ki, o, on ilə yaxın "Bulaq" folklor verilişinin daimi müəlliflərindən biri olmuşdur. Onun hazırladığı verilişlərin bir çoxu radionun qızıl fondunda saxlanılmaqdadır. Bundan əlavə "Zəka" radio elmi proqramının uzun illər ssenari müəllifi və aparıcısı olmuşdur. Televiziyanın vaxtilə populyar olan "İdrak" proqramı da İ.Vəliyevin ideyası əsasında yaradılmış və uzun müddət onun müəllifliyi və aparıcılığı ilə davam etdirilmişdir.

İsmayıl Vəliyev bədii yaradıcılığa 1965-ci ildə "Azərbaycan pioneri" qəzetində dərc etdirdiyi kiçik sənədli hekayə ilə başlamışdır. O vaxtdan uşaqlar üçün şer və hekayələr yazmış, "Azərbaycan pioneri" jurnalında və ayrılıqda xeyli nağıl və hekayələri dərc olunmuşdur. Onun uşaq hekayələri beynəlxalq təşkilatların mükafat və qrantlarına layiq görülmüşdür.

İ.Vəliyev publisistika və tərcümə işi ilə ardıcıl məşğul olur. Qədim şumerlərin məşhur "Bilqamıs dastanı"nı, "Avesta"dan parçaları, Qədim Misir ədəbiyyatı nümunələrini, rus, litva, ukrayna, türk, türkmən və b. dillərdən bir sıra elmi və bədii əsərləri tərcümə etmişdir. Onun redaktəsi və rəhbərliyi ilə Azərbaycanda ilk dəfə olaraq fundamental həcmdə "Qədim Şərq ədəbiyyatı" (müntəxabat, 1999) kitabı nəşr olunmuşdur. 1983-cü ildə "Ədəbi portret: onun funksiyası və tipologiyası" mövzusunda namizədlik dissertasiyası müdafiə edərək filologiya elmləri namizədi alimlik dərəcəsi almışdır. 1999-cu ildə "Ədəbiyyatda

insan konsepsiyası. Tarixi təşəkkülü və inkişaf mərhələləri" mövzusunda monoqrafiyasını nəşr etdirmişdir. Həmin monoqrafiya müəyyən ixtisarlarla Ankarada nəşr olunmuşdur. 2001-ci ildə doktorluq dissertasiyasını müvəffəqiyyətlə müdafiə etmişdir.

İ.Vəliyev 1979-cu ildən Azərbaycan Jurnalistlər Birliyinin, 1985-ci ildən isə Yazıçılar Birliyinin üzvüdür. 21 kitabın, 300-dən çox elmi, 500-dən çox elmi və publisistik məqalənin, elmi məruzə və çıxışın müəllifi, 9 kitabın tərcüməçisidir. Onlarla iri həcmli ensiklopedik, elmi və bədii kitabın redaktoru, tərtibçisi və naşiri olmuşdur. İ.Vəliyevin bəzi əsərləri ingilis, alman, türk, ukrayna, rus və ərəb dillərinə tərcümə olunub. Xarici ölkələrdə, o cümlədən Almaniya, Macarıstan, Türkiyə, İran, Rusiya, Ukrayna, Qazaxıstan, Litva, Gürcüstan və b. ölkələrdə keçirilmiş elmi konfrans və tədbirlərdə mə'ruzə və çıxışlar etmiş, məruzələri və çıxışlarının tezisləri elmi əsərlərdə və mətbuatda dərc olunmuşdur. İ.Vəliyev Qafqazda və keçmiş Sovetlər Birliyi məkanında baş verən siyasi hadisələr, milli münaqişələr, qaçqınlıq problemi və onların həlli yolları, insan hüquqları, müasir konfliktologiya məsələləri ilə də məşğul olmuş, SSRİ-nin dağılması prosesi və onunla bağlı regionda və dünyada baş verən hadisələrin elmi-nəzəri təhlili ilə bağlı "Dünya susur, tarix susmur", "Burulğanlar içində", "Qaçqınlıq", "Qara gündəlik" kitablarını nəşr etdirmiş, bu mövzuda yüzə yaxın məqaləsi dərc olunmuşdur. Onun rəhbərliyi və müəllifliyi ilə iri həcmli "Deportasiya" adlı kitab nəşr edilmişdir. Dağlıq Qarabağda və onun ətrafında baş verən hadisələrlə əlaqədar dəfələrlə Şuşada, Laçında və başqa bölgələrdə olmuş, hadisələrin xronologiyasını daimi nəzarətdə saxlamaqla, olanları, başımıza gətirilənləri, ürəyindən keçənləri geniş oxucu kütləsinə təqdim etdiyi, zəngin faktlara əsaslanan «Dünya susur, tarix susmur» kitabında vermişdir.

İ.Vəliyev kitab nəşri və yayımı, mətbuatın nəzəri və praktiki məsələləri ilə də ciddi məşğul olur. Beynəlxalq kitab sərgi və

yarmarkalarında dəfələrlə ölkəmizi təmsil etmiş, mükafatlar almış, elmi seminar və simpoziumlarda məruzələrlə çıxış etmişdir. Kitab nəşri və mətbuat məsələləri ilə bağlı tədris proqramlarının və elmi məqalələrin müəllifidir. Bakı Dövlət Universitetində və digər ali məktəblərdə "Mətbuat tarixi", "Redaktənin nəzəriyyə və təcrübəsi", "Nəşriyyat işinin təşkili və idarə edilməsi", "Mətnşünaslıq" və s. fənlərdən mühazirələr aparır.

İ.Vəliyev 1995-ci ildə ictimai-siyasi mövzuda yazdığı publisistik əsərlərə görə Azərbaycan jurnalistlərinin "Qızıl qələm" mükafatına, 1998-ci ildə uşaq hekayələrinə görə Açıq Cəmiyyət İnstitutu — Beynəlxalq Soros fondunun qrantına layiq görülmüşdür. Bir çox elmi, siyasi və ədəbi qəzet və jurnal redaksiya heyətlərinin, Azərbaycan Həmkarlar İttifaqı Konfederasiyasının idarə hey'ətinin (1998-ci ildən) üzvüdür. Evlidir, 3 övladı var.

İ.Vəliyev tədqiqatçı alim, yazıçı-jurnalist və təşkilatçı mütəxəssis kimi səmərəli fəaliyyət göstərir, öz elmi işini respublikanın ictimai həyatı ilə əlaqələndirməyi bacarır. Özünə və başqalarına tələbkardır, diqqətli və məs'uliyyətlidir. Ona tapşırılan vəzifələri ləyaqətlə və vaxtında yerinə yetirməyə çalışır. Tabeliyində çalışan əməkdaşlara qarşı səmimidir, kollektivdə ciddi iş ahəngi formalaşdırmağı, işgüzar mühit yaratmağı bacarır.

İ.Vəliyev 1991-ci ildə Ensiklopediyaya işə gəldiyi vaxtdan indiyədək bu elmi-nəşriyyat müəssisəsinin təsərrüfat problemlərini uğurla həll etmiş, onu maliyyə böhranından çıxarmaq üçün bir ilə "Rusca-azərbaycanca lüğət"in hər üç cildinin çapına nail olmuş, çətinliklərə baxmayaraq "Qısa iqtisadi lüğət", "Hüquq Ensiklopedik lüğəti", "Azərbaycan" soraqçası (azərbaycan və rus dillərində; həm də tərtibçilərindən biridir), "Fəlsəfə ensiklopedik lüğəti", "Dünya xalqları", "Dünya dövlətləri", "Şəfa ensiklopediyası", "Kütləvi tibb ensiklopediyası", "Azərbaycan toponimləri ensiklopedik lüğəti" və s. kimi iri həcmli, böyük əhəmiyyətli ensiklopedik kitabların baş redaktoru olmuş və onların yüksək səviyyədə nəşrini tə'min etmişdir. Onun nəşriyyat işi sahəsində qazandığı təcrübə və elmi-nəzəri bilik bu sahədə

xarici ölkələrlə əlaqələrin daha da genişlənməsinə imkan yaratmışdır.

O, Rusiya, İngiltərə, Türkiyə, Ukrayna, İran, Belorusiya, Orta Asiya respublikaları, Tatarıstan, Başqırdıstan və b. ölkələrin ensiklopediyaçı alim və naşirləri ilə yaradıcılıq əlaqələri saxlayır. “Türküstan” ensiklopediyasının redaksiya hey’ətinin üzvüdür. Türkiyə — Azərbaycan və Orta Asiya respublikalarının iştirakı ilə hazırlanan “Türk xalqlarının görkəmli adamları” ensiklopediyasının ideya müəllifi və baş redaktorudur.

İ.Vəliyev işlədiyi və əlaqəli olduğu təşkilatlarda, o cümlədən respublika ziyalıları arasında böyük hörmət və nüfuza malikdir.

Ədəbiyyatşünas, şair-publisist, filologiya elmləri doktoru, professor İsmayıl Ömər oğlu Vəliyevin mənəvi keyfiyyətləri, ailə həyatı, ictimai fəaliyyəti, yaradıcılığı haqqında 2002-ci ildə Azərbaycan Milli Ensiklopediyası Nəşriyyatında çapdan buraxılmış «Uzaq dağların adamı» toplusunda adlı-sanlı adamlarından Cavad Heyət, Anar, Fikrət Qoca, Ayaz Vəfalı, Şamil Vəliyev, Ramiz Məmmədzadə, Elçin Mehrəliyev, Gülruba Kərimova, Tofiq Hacıyev, Gülrux Əlibəyova, Abel Məhərrəmov, Misir Mərdanov və onlarca başqalarının dəyərli, xoş ürək sözləri vardır. Bu xoş sözləri təkrarlamaq da olardı. Lakin daha təfərrüatı ilə maraqlanmaq istəyənlərə yuxarıda adını çəkdiyim toplunu, həmçinin filologiya elmləri namizədi Tofiq Qəhrəmanovun «Ömrün ziyalı cavabdehliyi», Elçin Mehrəliyevin «İnsana poetik, publisistik və elmi baxış» monoqrafik kitabları oxumağı tövsiyə edərdim…

## NİZAMİ MANAF OĞLU XUDİYEV



Nizami Manaf oğlu Xudiyev 1949-cu ilin aprelində qədim Naxçıvanın dağları qoynuna sığınan Şahbuzda ziyalı ailəsində anadan olub. Hələ orta məktəb illərində onun ədəbiyyatçı olmaq, ali məktəbi fərqlənmə diplomu ilə bitirərək aspiranturada qalmaq, gələcəyin tanınmış filoloqlarından olmaq ən böyük arzularından biri imiş.

«Niyətin hara , mənzilin ora» deyi atalar. Şahbuz rayon orta məktəbini 1966-cı ildə müvəffəqiyyələ bitirərək. Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (İndi ADPU-dur) filologiya fakültəsinə daxil olmuş, uşaqlıq illərində qəlbindən keçən arzularını həyata keçirmiş, Nizami Gəncəvi adına təqaüdlə oxumuş, buranı fərqlənmə diplomu ilə bitirərək Elmi Şuranın qərarı ilə doğma təhsil ocağının «Azərbaycan dilçiliyi» kafedrasında müəllim vəzifəsində saxlanılmışdır.

Nizami Xudiyev 1978-ci ildə «Abdulla Şaiqin nəsr dili» mövzusunda namizədlik, 1990-cı ildə «Azərbaycan ədəbi dili lüğət tərkibinin inkişaf qanunauyğunluqları» mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. 1990-cı ildən professordur.

Professor Nizami Xudiyev 1979-1991-ci illərdə Azərbaycan Dövlət Pedaqoji Unversitetinin Həmkarlar İttifaqı Komitəsinin sədri, 1991-1994-cü illərdə birinci prorektor, 1996-cı illərdə universitetin rektoru vəzifəsində çalışmışdır.

1996-cı ildən Azərbaycan Dövlət Teleradio Verilişləri Şirkətinin sədridir.

Azərbaycan dilçilik elminin inkişafında professor Nizami Xudiyevin xidmətləri böyükdür. O, otuzdan çox monoqrafiya,

dərslik, dərs vəsaitinin, 16 sənədli filmin ssenarisinin, bir neçə orta məktəb dərsliyinin , iki yüzdən artıq məqalənin müəllifidir. Onun bir sıra kitab və məqalələri xarici ölkələrdə nəşr olunmuşdur.

Nizami Xudiyevin gərgin elmi araşdırmalarının məhsulu olan «Azərbaycan ədəbi dilinin təşəkkülü», «Tərcümə ədəbiyyatı və ədəbi dilimiz», «Azərbaycan ədəbi dili tarixi», «Heydər Əliyev və Azərbaycan dili», «Radio, televiziya və ədəbi dil» və bu kimi fundamental əsərləri Azərbaycan dilçilik elminə sanballı töhfədir.

O, türkoloq alim kimi respublikamızda və digər ölkələrdə, o cümlədən Moskva, Nalçik, Bişkek, Ufa, Aşqabad, Daşkənd, Tbilisi, Alma-Ata, Ankara, İstambul, İzmir, Adana, konya və başqa şəhərlərdə keçirilən qurultay və simpoziumların nümayəndəsi və iştirakçısı olmuş, elmi məruzələrlə çıxış etmişdir.

N. Xudiyev ictimai-siyasi xadim kimi dövlət, hökumət və parlament nümayəndə heyətinin tərkibində xarici ölkələrdə respublikamızı təmsil etmişdir.

Onun elmi-pedaqoji fəaliyyəti və yaradıcılıq uğurları bir sıra yüksək mükafatlara layiq görülmüşdür. O, "Akademik Y. Məmmədəliyev", «Abdulla Şaiq», «Araz», «Humay» mükafatları ilə təltif olunmuşdur. Azərbaycan Yazıçılar və Jurnalistlər Birliyinin Ziyalılar Cəmiyyəti İdarə Heyətinin üzvüdür. İki dəfə 2 saylı Şərur-Babək seçki dairəsindən Azərbaycan Milli məclisəinə deputat seçilmişdir.

## PAŞA QƏLBİNUR



Amerika Oftalmologiya Akademiyasının həqiqi üzvü, Amerika və Dünya Türk Cümhuriyyətləri Oftalmoloji Birliyinin idarə heyətinin üzvü. Akademik Y. Məmmədəliyev və Ümumitğifaq Komsomol mükafatı laureatı. Tibb elmləri doktoru, professor. Azərbaycan Yazıçılar Birliyinin üzvü Paşa İsmayıl oğlu Musayev. Bu ad indi dünyanın bir çox ölkələrinin vətəndaşlarına yaxşı tanışdır.

Taleyin, Allahtalanın əsrlər boyu Türk dünyasına, onun gözəl məkanlarından olan Azərbaycana və Azəri xalqına bəxş etdiyi nadir istedadlardan olan alim, şair, filosof Paşa Qəlbinur dünyanın saymaqla qurtarmaq bilməyən çoxsaylı yaxın-uzaq ölkələrinin Elmlər Akademiyalarının həqiqi və fəxri üzvüdür. Tibb elminə dair 150-dən artıq elmi məqalənin, 3 elmi monoqrafiyanın, 10 elmi ixtiranın müəllifidir. Həm elmi, həm də bədii yaradıcılıq sahəsində dəfələrlə mükafatlara layiq görülmüşdür.

Paşa İsmayıl oğlu Musayev 1952-ci ilin 30 martında Şəmkir rayonunun Çinarlı kəndində anadan olub. 1968-ci ildə orta məktəbi qızıl medalla bitirib, N. Nərimanov adına Azərbaycan Tibb İnstitutunun müalicə-profilaktika fakültəsinə daxil olub. İnstitutu fərqlənmə diplomu ilə qurtardıqdan sonra Gəncədə və Bakıda göz həkimi işləyib.

1978-81-ci illərdə S. M. Seçenov adına 1 Moskva Tibb İnstitutunun aspiranturasında təhsil alıb.

1981-ci ildə məşhur oftalmoloq, akademik M. M. Krasnovun rəhbərliyi ilə **«Gözün buynuz qişasının bullez distrafiyasının**

**yeni cərrahi üsulla müalicəsi»** mövzusunda namizədlik dissertasiyasını vaxtından altı ay əvvəl müdafiə edib.

1981-ci ilin dekabrından ATİ-nin göz xəstəlikləri kafedrasının müəllimi, 1988-ci ildən professoru, 1990-cı ildən isə həmin kafedranın müdiridir.

Elmi-tədqiqatla yanaşı ədəbi yaradıcılığını paralel davm etdirən Paşa Qəlbinurun 1984-cü ildə ***«Ay bir əlçim buluddur»*** adlı ilk və 1987-ci ildə ***«Payız məktubu»*** ikinci şerlər kitabı nəşr olunub. Elə həmin il 34 yaşlı gənc alim ***«Gözün yarımkeçirici baryerləri»*** mövzusunda Moskvada doktorluq dissertasiyasını müdafiə edib. 1990-cı ildə ***«Rəngli göz yaşları»,*** 1996-cı ildə ***«İtmiş həsrət kimi»,*** 2002-ci ildə ***«Ağlıma gələn başıma gəldi», «Təbabət poeziyanın əyarı kimi», «Paşa Qəlbinur-50»*** kitabları işıq üzü görüb…

Azərbaycanın görkəmli adamları seriyasından Paşa Qəlbinurun həyatı, elmi və bədii yaradıcılığı haqqında Aybəniz Əliyevanın «Paşa Qəlbinur» (1996), Altay Məmmədovun «Qəlbinur poeziyası XX1 əsrin astanasında» (1999) adlı iki monoqrafiya çap olunmuşdur.

Professor P. İ. Musayev orqan və toxuma transplantalogiyasında yeni istiqamət müəyyənləşdirmiş, qlaukomanın cərrahi müalicəsində Musayev üsulunu tətbiq etmiş, XX əsrdə Rusiya Federasiyası Farmakopiya Komitəsinin rəsmi təsdiq etdiyi Azərbaycanın yeganə dərman preparatı olan **«Aktipol»u kəşf etmişdir.** «Aktipol» dünyada bu günə qədər istifadə olunan ən effektli antivvirus dərmanlarından biri hesab olunur. Onun elmi rəhbərliyi altında 12 namizədlik, 1 doktorluq dissertasiyası müdafiə edilmişdir.

P. İ. Musayev işgüzar səfərdə olduğu və elmi konfranslarda iştirak etdiyi Amerika, Rusiya, Hollandiya, Kanada, Türkiyə, İran və digər xarici ölkələrdə çap olunmuş 150-dən artıq elmi əsərin müəllifidir. O, oftalmoloqların (1994) dünya konqresinin Kanadada, Torantoda, 1995-2001-ci illərdə Amerika

Oftalmologiya Akademiyasının Los-Anjelosda, San-Fransiskoda, Atlantda və başqa şəhərlərdə keçirilən illik konqreslərinin , həmçinin digər beynəlxalq məclislərin iştirakçısı olub.

Paşa Musayevin adı dünyanın ən məşhur oftalmoloqlarından Amerika alimləri – Traytman, Fraunkfelder, ispan oftalmoloqları Barrakver qardaşları, Fransız professoru Almalrik, alman professoru Dardanie, rus alimləri akademik Krasnov, Fyodorov və başqaları ilə bir sırada çəkilir. Bu alimlərin əksəriyyəti onun haqqında ən xoş ürək sözlərini deyiblər: oftamoloqların marşalı da adlandırıblar, dünyanın bir nömrəli işıq cərrahı da!

Professor P. İ. Musayev bu alimlərdən fərqli olaraq, mikroskopsuz da cərrahiyyə əməliyyatı aparmaq imkanı var. Gözlərinin yaxını görmə qabiliyyəti 3 dəfə, uzağı görmə qabiliyyəti iki dəfə adi adamda olduğundan güclüdür. Bu Allah vergisidir, göz cərrahı üçün əvəzsiz nemətdir. Təbiət bu vergini göz cərrahı olmaq üçün Paşa Qəlbinura əvvəlcədən bəxş edib. Aybəniz xanım Əliyeva çox yerində Paşa müəllimi dahi alim olmaqla yanaşı, böyük praktik adlandırır: Gözlərinin nurunu , həm də ümidini itirmiş, işığa təşnə insanlar dünyanın müxtəlif guşələrindən ona pənah gətirir. Həmkarları da,ucqar dağ kəndlərində yaşayan camaat da hələlik onu əvəz edə biləcək ikinci bir şəxsiyyətin varlığını görə bilmir... Şöhrətin ən uca zirvəsində yaşayan gənc işıq Tanrısı yaşadığımız adi dünyanın insanlarından daha çox əfsanəvi-mifik qəhrəmanları xatırladır – daha çox isə insanlar üçün Allahlardan od oğurlayan cəfakeş Prometeyi!

Paşa Qəlbinurun müayinə otağının qarşısında insan növbəsi heç vaxt əskik olmur, həftənin bütün günlərində əlindəki müqəddəs bıçağı ilə insanlara işıq paylayır, zülmətlərə, qaranlıqlara öz işığı ilə divan tutur…

Şəxsiyyəti ilə sənəti vəhdət təşkil edən Paşa Qəlbinur mənəvi dəyərlərimizi qoruyub saxlayan, onu yaşada-yaşada gələcək nəsillərə ərmağan edən alim, şair, filosofdur. Xəstəxananın göz xəstəlikləri şöbəsinin müdiri gənc həkim Qurban Mehbalı oğlu İndi onun gələcəyinə inandığı, bu sahə üzrə barmaqla göstərilən

cərrahlardan biri olacağına əminlik duyur. Paşa müəllimin rəhbərlik etdiyi kafedrada indinin və gələcəyin məşhur və istedadlı oftamoloqlarının yetgin bir dəstəsi fəaliyyət göstərir. Onlardan Sevinc Əkbərovanı, Ulduz Quliyevanı, Flora Ağamalıyevanı, Solmaz Əliyevanı, Səkinə xanım Muradəliyevanı, Qabil Zülfüyevin, Leyla xanımın adlarını böyük fəxrlə çəkmək olar.

İsmayıl əmi ilə İldız xanımın doğma xalqına xidmət edən, soydaşlarının sağlamlığı keşiyində dayanan, ad-sanı, şan-şöhrəti dillər əzbəri olan övladlarının - Paşanın, Nazimin, Sevincin bütün Azərbaycan xalqının övladları olması ilə fəxr ediblər… Sevinc xanım qardaşı Paşa Qəlbinurla bir kafedrada çalışır. Namizədlik və doktorluq dissertasiyalarını Moskvada müdafiə edərək iddiaçısı olduğu alimlik dərəcələrini alıb. Savadlı, təvazökar, səmimi bir insan kimi çalışdığı kollektivin, müalicə etdiyi xəstələrin hörmətini qazanıb. Qardaşı Nazim biologiya elmləri namizədidir.



## SEVİNC İSMAYIL QIZI ƏKBƏROVA

Sevinc İsmayıl qızı Əkbərova 1960-cı ilin 5 fevralında Şəmkir rayonunun Çinarlı kəndində ziyalı ailəsində anadan olub. 1967-1977-ci illərdə buradakı qəsəbə orta məktəbində təhsil alıb. Orta məktəbi müvəffəqiyyətlə bitirib. 1977-ci ildə N. Nərimanov adına ATİ-nin ikinci müalicə-profilaktika fakültəsinə qəbul olunub. 1983-cü ildə buranı uğurla bitirib. Sevib-seçdiyi həkimlik sənətini 1 saylı Bakı şəhər klinik xəstəxanasının göz xəstəlikləri şöbəsində həkim-ordinator kimi davam etdirə-etdirə elmi-tədqiqatla məşğul olub. Moskva şəhərindəki Rusiya Tibb Elmləri Akademiyasının Göz Xəstəlikləri İnstitutunun professoru V. F. Şmıryovanın rəhbərliyi ilə «İlkin açıqbucaqlı qlaukomalı xəstələrin dərman müalicəsinin kliniki – morfoloji əsaslandırılması» mövzusunda 1994-cü ildə namizədlik, 2000-ci ildə isə yenə həmin institutunda (elmi məsləhətçiləri professor Paşa Qəlbinurun və vürusoloq professor Q. A. Qaleqovdur) «Paraaminobenzoy turşusunun herpes mənşəli kerativlərin müalicəsində işlədilməsinin eksperimental - kliniki əsaslandırılması» mövzusunda doktorluq dissertasiyalarını müdafiə edərək iddiaçısı olduğu elmi dərəcələrə layiq görülüb.

Sevinc xanım Əkbərova Rusiya Oftamoloqlarının Y11 qurultayında (Moskva, 2000), Avropa Oftomoloqlarının X111 Beynəlxalq konqresində (İstanbul, 2001), Türkiyə Oftomoloqlarının Uluslar konqreslərində (1994, 1996) və digər beynəlxalq konfranslarda elmi məruzələrlə çıxış edib.

S. İ. Əkbərova Türk Cümhuriyyətləri Oftomoloji Birliyinin və AzərbaycanOftomoloqlar Cəmiyyətinin yzvüdür. Onun tibbi ümumiləşdirmə və nəticələri virusologiya və immunologiya sahələrində uğurla tətbiq olunur.

Onun elmi əsərləri və məqalələri Azərbaycan, Rusiya, Hollandiya, Türkiyə, Macarıstan, Ukrayna, Almaniya, Türkmənistan və digər ölkələrin nüfuzlu nəşriyyatlarında dərc edilmişdir. 50-dən artıq elmi əsərin, monoqrafiya və ixtiraların müəllifidir.

Sevinc xanım Əkbərova göz xəstəliklərinin dərman müalicəsi, gözün şiş xəstəlikləri, virus xəstəlikləri, gözün ön şöbəsinin bəzi cərrahi əməliyyatları və digər bu kimi sahələr üzrə tanınmış mütəxəssisdir.

S. Əkbərova Moskva şəhərindəki Elmi-Tədqiqat Göz Xəstəlikləri İnstitutu, Rusiya Tibb Elmləri Akademiyasının İnkişaf Biologiyası və Virusologiya İnstitutları, Moskva şəşər Oftomoloji Klinik Xəstəxanası və digər tibb müəssisələri ilə sıx elmi əməkdaşlıq edir. Onun tibb sahəsində qazandığı elmi nailiyyətləri mətbuatda, radio və televiziyada geniş işıqlandırılır.

Sevinc xanım Rusiya EA İnkişaf Biologiya İnstitu ilə çalışdığı klinikanın elmi əməkdaşlıq müqaviləsinə əsasən həmin institutun nümayəndə heyəti sırasında 2002-ci ilin noyabrında Belçikanın Brüssel şəhərində ixtiraların təşkil olunmuş «Ümumdünya ixtiralar salonu»nda Brüssel Evrika 2002 sərgisində iştirak etmişdir. Sərgidə prof. Paşa Musayevin rəhbərliyi ilə təklif olunan bu yeni dərman preparatının müəllifləri Paşa Qəlbinurla birgə bacısı və tələbəsi Sevinc xanım, bir də Olqa Stroyeva «Aktipol»un» kəşfinə görə ixtira müəllifləri kimi Belçika Maliyyə Nazirliyinin xüsusi mükafat və prizinə, həm də fərqləndirici qızıl medala layiq görülmüşdür.



## AQİYƏ HƏBİB QIZI NAXÇIVANLI

O, 1950-ci ildə Oğuz şəhərində məşhur general Cəmşid Naxçıvanskinin nəslindən olan, respublikanın əməkdar müəllimi, qabaqcıl maarif xadimi Həbib müəllimin ailəsində anadan olub. Uşaqlıq və məktəb illərini burada keçirib. Oğuz şəhərindəki 1 saylı orta məktəbi (1967), M.F. Axundov adına Azərbaycan Pedaqoji Dillər İnstitutunu (1972) bitirib. Təyinatla doğma rayonunda müəllimlik fəaliyyətinə başlayıb. Təşkilatçılığını nəzərə alan rayon rəhbərliyi onu kamsomol işinə irəli çəkib. Əvvəlcə raykom komsomolun katibi, sonra isə birinci katibi vəzifələrində(1973-1977) işləyib, rayon partiya komitəsinin büro üzvü, rayon Sovetinin deputatı seçilib. Gənc nəslin tərbiyəsində apardığı məqsədyönlü fəaliyyəti nəzərə alınaraq Azərbaycan LKGİ MK-nın üzvü seçilmiş və 1977-1978-ci illərdə komsomolun Mərkəzi Komitəsinin məktəbli-gənclər şöbəsinin müdiri vəzifəsində işləmiş, 1978-1980-ci illərdə Bakı Ali Partiya Məktəbinin dinləyicisi olmuşdur.

Aqiyə Naxçıvanlə Azərbaycan KP MK-nın təyinatı ilə Naxçıvan Vilayət Partiya Komitəsinə (1980) məsul vəzifəyə göndərilmişdir. 1983-cü ildən Bakı şəhər 26 Bakı komissarı Rayon Partiya Komitəsinin təşkilat şöbəsində işləmişdir. O, 1986-cı ildə Bakı Ali Partiya Məktəbində müəllimlik fəaliyyətinə başlamışdır. Əvvəlcə BAPM-də, daha sonra BSİPİ-nin «Mədəniyyət» kafedrasında baş müəllim, «Azərbaycan və rus dilləri» kafedrasının müdiri,

Aspirantura və doktorantura» şöbəsinin müdiri, institutun elmi katibi vəzifələrində çalışmışdır.

A. Naxçıvanlı «X1 – X11 əsrlərdə Azərbaycanda ədəbi-bədii ənənələrin estetik mədəniyyətşünaslıq baxımından təhlili» mövzusunda namizədlik dissertasiyası müdafiə edərək fəlsəfə elmləri namizədi alimlik dərəcəsini almışdır. İki monoqrafiyanın, 30-dan çox elmi məqalənin müəllifidir.

1999-cu ildən Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının «Siyasi idarəetmə» fakültəsinin dekanı vəzifəsində işləyir.

Dosent A. Naxçıvanlı «Dövlət hakimiyyətinin siyasi və əxlaqi əsasları» mövzusunda yazdığı doktorluq dissertasiyası müdafiə mərhələsindədir.

Aqiyə xanım respublikanın və DİA-nın ictimai həyatında yaxından iştirak edir. Elmi konfranslarda maraqlı elmi məruzə və mühazirələri maraqla qarşılanır. O, «Əməkdə fərqlənməyə görə» medalı, Respublika Təhsil Nazirliyinin Fəxri fərmanı, «Simurğ» Milli Mükafat Fondunun «Məsuliyyətli və mübariz Azərbaycan vətəndaşı» naminasiyası üzrə 2002-ci ildə keçirdiyi müsabiqənin laureatının ali dərəcəli diplomu ilə təltif olunmuşdur.

Yeni Azərbaycan Partiyası Səbail Rayon Siyasi Şurasının üzvüdür. Səbail Rayon YAP Qadınlar Şurasının sədr müavinidir. Aqiyə xanımın anadan olmasının 50 illik yubileyi münasibətilə «Azad Azərbaycan» qəzetinin 10 mart 2000-ci il tarixli sayında dərc olunan «Vətənə, xalqa bağlı ömür» başlıqlı publisist məqalədə bu gözəl insan haqqında yazılan sözlər yada düşür: « Hər səhər Dövlət İdarəçilik Akademiyasının pilləkənlərini şux yerişli bir qadın qalxır və bir də şəfəq qaralanda oranı tərk edir. Onun geyimi kimi təbiəti də sadədir… Uzun illərdir bu qadın bütün şüurlu həyatını, zəkasını gənc nəslin tərbiyəsinə, müasir zamanla ayaqlaşa biləcək kadrların hazırlanmasına sərf edir. Bu qadın Azərbaycan qadınının bütün gözəl xüsusiyyətlərini özündə birləşdirən Aqiyə xanım Naxçıvanlıdır…».



## ROZA ƏLİ QIZI ƏLİYEVA

O, Qərbi Azərbaycanın sazlı-sözlü bölgələrindən olan, bir ətəyi Kür çayından şimala sarı Eldarın ətəyinədək uzanan, bir tərəft Gədəbəy, Şəmşədin və Qazax mahalları ilə həmsərhəd olan Tovuz şəhərində anadan olub. Dünyaya göz açandan ailələrində təhsilə, elmə, şerə, sənətə həssaslıqla yanaşıldığının şahidi olub, təhsildə fərqləndiyinə görə başqalarına nümunə göstərilib, örünək olmağa çalışıb. Atası Əli müəllimin el-oba arasındakı ziyalı nüfuzuna, şan-şöhrətinə xələl gəlməsin deyə Roza xanım hər işdə başqalarından seçilməyi özünə mənəvi borc sayıb. Orta məktəbi müvəffəqiyyətlə bitirdikdən sonra Bakı Dövlət Universitetinə daxil olub, buranı 1962-ci ildə bitirərək əmək fəaliyyətinə Azərbaycan Elmlər Akademiyasının Torpaqşünaslıq və Aqrokimya İnstitutunda laborant vəzifəsindən başlayıb. Sonralar kiçik və baş elmi işçi vəzifələrində çalışıb. 1965-1969-cu illərdə həmin institutun aspirantı olub. 1971-ci ildə namizədlik dissertasiyasını müdafiə edərək iddiaçısı olduğu kənd təsərrüfatı elmləri namizədi alimlik dərəcəsini alıb. Baş elmi işçi vəzifəsində çalışdığı illər ərzində Respublika torpaqlarının iqtisadi qiymətləndirilməsi üzrə elmi məqalələr, braşuralar və kitab çap etdirmişdir.

R.Ə. Əliyeva apardığı elmi tədqiqatın nəticələrini mərhum akademik Həsən Əliyevlə birlikdə hazırladıqları **«Azərbaycan torpaqlarının səmərəli istifadə olunması»** kitabında çap etdirmişdir.

1984-cü ildən hazırki vaxta kimi əvvəllər Bakı Ali Partiya Məktəbində, sonra Sosial İdarəetmə və Politologiya İnstitutunda

və bu institutun bazasında yaradılmış Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasında dosent, «Bazar iqtisadiyyatının dövlət tənzimlənməsinin nəzəriyyəsi və praktikası» kafedrasının müdiri vəzifələrində çalışır. Müstəqilliyin əldə edilməsi ilə Respublikamızda iqtisadi sistemin transformasiyası və bazar iqtisadiyyatına keçidin iqtisadi inkişafın yeganə istiqaməti qəbul olunmuşdur. Bazar iqtisadiyyatı şəraitində milli iqtisadiyyatın inkişaf etdirilməsi ilə əlaqədar «İqtisadiyyatın dövlət tənzimlənməsi» və «Dövlətin İnvestisiya siyasəti» fənləri üzrə tədris proqramları və elmi məqalələr çap etdirmişdir. Ümumiyyətlə, dosent R. Əliyeva bir kafedra müdiri kimi DİA-nın elmi, ictimai və tədrisində fəal iştirak edir, elmi konfranslarda və simpoziumlarda aktual mövzularda məruzələrlə çıxış edir. O, bir kitabın, 2 braşuranın, 3 fənn üzrə proqramın, 2 metodik göstəriş və 52 elmi məqalənin müəllifidir.

Roza xanım görkəmli siyasi və ictimai xadim, respublikanın tanınmış ziyalılarından olan, şair təbiətli qənirsiz insan mərhum Firudin Əliyevin ömür-gün yoldaşı kimi ailənin hər iki valideyninin üzərinə düşən ağırlığın öhdəsindən təkbaşına gəlir. Övladlarını Firudin müəllimin adına-sanına, cəmiyyətdəki mövqeyinə uyğun böyütməkdə kökəbağlılıq ənənələrinə sadiq qaldığından qızı Elza göz həkimi, oğlanları - Rəşad DİA-nın dissertantı, Rövşən Respublika Dövlət Yol Polisində daxili xidmət mayoru, kiçik oğlu Fəxri Azərbaycan İqtisad Universitetinin aspirantıdır.

Azərbaycan qadınlarına və analarına xas olan bütün dəyərli mənəvi keyfiyyətlərləri Roza xanımda gbrmək mümkündür. Qayğıkeş, səmimi, təvazökar, alicənab, tələbələrinə qarşı həssas bir pedaqoqdur. Kollektivdə böyük hörmət və nüfuzu vardır.



## ÇƏTİNLİKDƏ KEÇƏN ÖMÜR

Yolasalma mərasiminə çox az qalırdı. Ayrılıq dəminin yaxınlasdığını görən Məmmədzaman əmi ömür-gün yoldaşı Zeynəb xanımla və doğmaları ilə halal-hümmət edib, bir qədər aralıda sakit dayanaraq, məhzun-məhzun bu mənzərəni seyr edən oğlanlarına yaxınlaşdı, onları bir-bir bağrına basıb doyunca öpdü. Hamıdan kiçik, son beşiyi balaca Sadığı başı bərabərinə göyə qaldırdı, köksünün altında riqqətlə döyünən ürəyinə tərəf endirdi, onun başını qolunun arasına alıb qəlbindən keçənləri demək istədisə də, bunu bacarmadı… Sifətində gilələnən göz yaşları yağış damcıları kimi körpənin yanaqlarını islatdı. Müharibənin ölüm-dirim meydanı olduğunu, insanlara fəlakət gətirdiyini yaxşı bilirdi, qəfil başlayan bu müharibənin neçə-neçə ailəni başsız, saysız-hesabsız uşaqları atasız qoyacağına heç şübhəsi də yox idi. Lakin o, körpəsinə «düşməni tezliklə məğlub edib qayıdacağıq, ananın sözünə bax, dərslərini yaxşı oxu…» sözlərini deyib ailə üzvlərindən, doğma el-obadan ayrıldı, bilmirdi ki, bu son vida görüşüdür…

Kənddə başı papaqlılar yalnız ağsaqqallar, bir də yeniyetmələr idi. Təsərrüfatda aparıcı qüvvə qadınlar sayılırdı. Ailənin qayğıları Zeynəb xanımla yanaşı boyük oğlanlarının üzərinə düşmüşdü. Onlar şəxsi təsərrüfatlarından əldə etdikləri məhsulla və kolxozdan aldıqları məvaciblə ailənin dolanışığını güc-bəla ilə təmin edirdilər. Hətta on iki yaşlı Sadıq da yaşıdları ilə birlikdə kolxozda çalışmağa başlamışdı.

Uşaqlıq yaddaşı möhkəm olur. Müharibə illərini Sadıq Səlimov belə xatırlayır: o zamanlar əksər kəndlərdə məktəblər yeddiillik idi. Orta məktəblərin sayı az idi. Kəndimizin gəncləri

sırasında mən də qonşu Hacallı kəndindəki orta məktəbdə təhsilimi davam etdirirdim. Bir gün eşitdik ki, kolxozumuzun sədri bizim məktəbdən geri çağırılmağımız və təsərrüfatda işləməyimz üçün məktəb direktoruna təzyiq göstərmək istəyib, o isə mütərəqqi fikirli ziyalılardan biri olduğundan sədrlə qətiyyən razılaşmayıb, etirazını bildirib, məsələni rayon rəhbərliyinə çatdırmaqla yersiz söz-söhbətə son qoyulub.… Beləliklə, kolxoz sədrinin «istəyindən» yayınan Sadıq və onun həmkəndlilərinə orta təhsil almaq nəsib olub. Əlaçı şagird kimi məktəbin müəllim və şagird kollektivinin dərin hörmətini qazanan bu gəncin ictimai işlərdə yaxından iştirakı gələcəyin fəal təkilatçılarından biri olacağına böyük ümid yaradıb.

1949-cu ildə ali məktəbə sənədlərini verdi, qəbul imtahanlarını uğurla başa vurub müsabiqənin nəticələrini gözlədi… O, adını qəbul olunanların siyahısında görəndə illərdən bəri qəlbində yaşatdığı çoxdankı arzusuna çatdığının sevincindən mənəvi bir rahatlıq duydu. Yalnız ürəyindən bu fikirləri keçirdi: «Anama və yaxın qohumlarımıza gözaydınlığına gələcəklər. Kaş atam müharibədən qayıtmış olaydı və taleyindən nigaran ayrıldığı son beşiyinin Azərbaycan Dövlət Universitetinin hüquq fakültəsinə qəbul olunduğunu görüb fərəhlənəydi…»

Tələbəlik illəri onun həyatında silinməz izlərlə səciyyələndi: ictimai işlərdə iştirakı, universitetin, həmçinin fakültənin professor-müəllim heyəti və tələbələri arasında qazandığı hörmət və nüfuzu, əlaçı tələbə olması gələcək həyatı üçün bir zəmin oldu. Fərqlənmə diplomu ilə həyata vəsiqə alan bu gənci Elmi Şuranın qərarı ilə 1954-cü ildə Ümumttifaq Hüquq İnstitutunun aspiranturasına tövsiyə edilsə də, buraya göndərilənlərin sayı ayrılan yerdən çox olduğundan o, Azərbaycan SSR Elmlər Akademiyası Fəlsəfə və Hüquq İnstitutunun aspiranturasının qiyabi şöbəsinə daxil olduğu bir vaxtda respublika komsomolunun Mərkəzi Komitəsinin təbliğat-təşviqat şöbəsinə təlimatçı vəzifəsinə irəli çəkilmiş, bir müddətdən sanra komsomol təkilatı şöbəsinə dəyişirilərək, əvvəlcə Şirvan, sonra isə Qazax

zonası üzrə məsul təşkilatçı vəzifəsində çalışmışdı. Xam və dincə qoyulmuş torpaqların geniş miqyasda istifadəyə verildiyi dövrdə Azərbaycan komsomolunun məsul işçisi kimi azərbaycanlı gənclərin «Xam torpaqlar»da işləməyə gedən dəstələrinə rəhbərlik etməklə öz təşkilatçılıq qabiliyyətini əldə olunan yüksək mükafatlarla sübut etdi.

Gənclk enerjisinin coşub-çağladığı, əməli fəaliyyəti ilə nüfuz qazandığı, təşkilatçılıq qabiliyyətinin, gənclərə rəhbərlikdə qəti tələbkarlığının daha da vüsətləndiyi bir zamanda «Xam torpaqlar»ın istifadəyə verilməsində fədakarlıqla fərqlənənlər sırasında adına söylənilən xoş sözlər rəhbər partiya dairələri tərəfindən nəzərə alındı, 1964-cü ilin oktyabrında Azərbaycan KP Mərkəz Komitəsi aparatına işə götürülməsi onun həyatında ömrü boyu unudulmayacaq hadisə oldu. Göstərilən bu yüksək etimadın şərəflə, məsuliyyətlə doğruldulması üçün gərgin əmək sərf etmək, müntəzəm olaraq zəhmətkeşlər arasında məqsədyönlü ideya-tərbiyə işləri aparmaq, verilən tapşırıqları vaxtında və həssaslıqla yerinə yetirmək, ilk növbədə, tükənməz güc, qüvvə, dözüm, dəyanət və kütlələrlə işləmək bacarığı tələb olunurdu. Bu tələbləri hər an belə şəxsi nəzarətində saxlamaqla əməli işi, nöqsanlara qarşı barışmazlığı, insanlara qayğısı ilə respublikanın geniş ictimaiyyətinə özünü tanıtdı. Perspektivi olan rəhbər kadr kimi Sov. İKP MK yanında Ali Partiya Məktəbinə (1966) göndərildi. Moskvanın ictimai-siyasi həyatı, buradakı təhsil illəri Sadıq müəllimin taleyində çoxsaylı görüşlərə, xatirələrə, təəssüratlara, müxtəlf ixtisaslardan olan görkəmli adamlarla dostluq əlaqələrinin yaranmasına meydan verdi. Eyni zamanda, təhsilini 1969-cu ildə müvəffəqiyyətlə başa vuraraq doğma kollektivə qayıtması onun tərcümeyi-halında daha böyük yaradıcılıq və quruculuq səhifələrinin açılması üçün tamamilə yeni bir başlanğıc oldu.

Azərbaycan KP MK-nın tarixi avqust 1969-cu il plenumunun qərarlarına uyğun olaraq respublikada həyata keçirilən kadr siyasətinə, kadrların tərbiyə olunmasına, seçilib yerləşdirilməsinə son dərəcə tələbkar münasibətin gücləndiyi bir şəraitdə Sadıq

müəllimin Quba rayonuna rəhbər göndərilməsi onun özü üçün də gözlənilməz oldu. Çünkü Heydər Əliyev kimi tələbkar, nöqsanlara güzəştə getməyən, qətiyyətli bir rəhbərin - ölkə başçısının kadrı olmağın məsuliyyətli bir missiya olduğunu dərk etmək, onun nəhəng, irimiqyaslı quruculuq fəaliyyəti ilə ayaqlaşmaq, inkişafın vüsət almasına cavab verən kadr olmaq ciddi bir iş idi.

Görkəmli adamların, tarixi şəxsiyyətlərin yurdu, qədim bağlar diyarı Qubanın sosial-iqtisadi və mədəni quruculuğu sahəsində zamanın tələbinə uyğun möhtəşəm işlər görmək, illərdən bəri yığılıb qalan köklü problemləri aradan qaldırmaq böyük təşkilatçılıq, seçkili orqanların bütün vəsilələrində çalışan kadrlara, idarə, müəəsisə, təşkilat və təsərrüfat rəhbərlərinə qarşı tələbkarlıq göstərmək, verilən tapşırıqların icrasını nəzarətə götürüb uçotunu aparmaq adi hal olsa da, bununla kifayətlənmək Sadıq müəllimi qane etmirdi. Ətalətdən ayılmayan, köhnə qaydalarla işləməkdən əl çəkməyən səriştəsiz kadrlardan yaxa qurtarıb özünün komandasını yaratmaq üçün kompleks tədbirlərin həyata keçirilməsinin zəruriliyinə ciddi ehtiyac duyulurdu. Raykomun plenum və büro iclaslarının müzakirəsinə çıxarılan məsələlər aqrar sənaye kompleksində, ümumtəhsil, mədəni-maarif, səhiyyə ocaqlarında, rabitə, məişət və kommunal-mənzil xidməti sahələrində mövcud olan gerilik, çatışmazlıq və nöqsanların aradan qaldırılmasına bilavasitə öz müsbət təsirini göstərdi. Yeni adət-ənənələrin, ritualların, peşə bayramlarının keçirilməsi istehsalın dinamik və proporsional inkişafını təmin etməkdə rayon əhalisində zəngin əmək coşqunluğuna səbəb oldu. Abadlıq, yaşıllaşdırma, inşaat, yol-tikinti işlərinə, yaşayış məntəqələrinin müasir görkəmə salınmasına qayğı və diqqət, həmçinin əsaslı vəsait qoyuluşu artırıldı. Nəzərdə tutulandan çox mənzil sahəsi tikilib istifadəyə verildi. H. Ə. Əliyev cənablarının təşəbbüsü ilə yeni intensiv polimet və spur bağçılığın inkişaf etdirilməsi barədə qəbul olunan qərarın yerinə yetrlməsi istiqamətində görülən işlər, təcrübə mübadiləsi məqsədilə rayonun

bu sahədə çalışan rəhbər və orta özək kadrlarının dəfələrlə Moldaviyaya kollektiv səfərlər etməsi öz bəhrələrini verdi. Rayon üzrə meyvə istehsalı və tədarükü planı 13 min tondan 116 min tona çatdırıldı, əhalinin maddi güzaranı nəzərə çarpacaq dərəcədə yaxşılaşdırıldı. Hər hektardan məhsuldarlığın 12-13 sentnerdən 55-60 sentnerə çatdırıldı.

Sadıq müəllim Quba Rayon Partiya Komitəsinin birinci katibi işlədiyi on üç ildən artıq bir müddətdə Heydər Əliyev məktəbinin ən layiqli yetirmələrndən biri kimi, bu görkəmli ictimai-siyasi xadimin qayğısı nəticəsində həm ictimai həyatda, həm də şəxsi işlərində çoxsaylı müvəffəqiyyətlər qazanmışdır: O, İttifaq hökumətinin yüksək təltiflərinə - iki dəfə Qırmızı Əmək Bayrağı, bir dəfə Oktyabr İnqilabı Ordenlərinə və çoxsaylı medallarına layiq görülüb. Üç çağırış dalbadal Azərbaycan SSR Ali Sovetinə deputat seçilib, eyni zamanda uzun müddət Respublika Ali Sovetinin «Təbiəti mühafizə və təbii ehtiyatlardan istifadə üzrə daimi komissiyanın» sədri olub. Gənclərin tərbiyəsindəki xidmətlərnə , uzun illər partiya orqanlarında xidmətlərinə və anadan olmasının 50 illiyi münasibətilə müxtəlif vaxtlarda Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin Fəxri Fərmanlarına layiq görülüb.

Sadıq müəllimmin özünün dediyi kimi, ötən əsrin 80-ci illərinin əvvəlində möhtərəm Heydər Əliyevin SSRİ Nazirlər Soveti Sədrinin birinci müavini vəzifəsinə təyin olunması qədirbilən xalqımızı hədsiz sevindirmişdi. Onun hər dəfə doğma respublikamıza gəlişini səbrsizliklə gözləyirdik. Mənim həyatımda maraqlı və yaddaqalan günlərdən ən qiymətlisi möhtərəm Prezidentimizin İttifaq hökumətinin rəhbəri kimi 1983-cü ilin 22 sentyabrında Quba rayonuna gəlməsi və bir vaxtlar bağçılığın inkişafı ilə bağlı qəbul edilmiş qərarın yerinə yetirilməsi vəziyyəti ilə maraqlanması və görülən işlər barədə ona məlumat verdiyim gündür. Heydər Əliyev cənablarının rayonun vəziyyətı ilə daima maraqlanması, quruculuq işlərinin görülməsinə böyük köməklik və qayğısı vardı. Verilən məlumatlardan məmnunluqla söz açdı və

perspektv üçün tövsiyələr verdi. Lakin təəssüflər olsun ki, zati-aliləri H.Əliyevin bu qiymətli tövsiyə və məsləhətlərinin bütövlükdə həyata keçirilməsinə imkan yaradılmadı…

***Qısa arayış: Sadıq Səlimov 1932-ci il 21 martda Qəbələ rayonunun Kürd kəndində anadan olub. Əmək fəaliyyətinə1954-cü ildə Azərbaycan komsomolunun Mərkəzi Komitəsindən başlamış, təlimatçı, məsul təşkilatçı, Azərbaycan KP MK – da təlimatçı, Sov. İKP MK yanında Moskva Ali Partiya Məktəbində dinləyici, Azərbaycan KP MK-da təlimatç, Quba RPK-da birinci katib,1984 – 90-cı illərdə Cəlilabad rayonunda Natarial Kontorunda baş Dövlət natariusu vəzifələrində işləyərək çətin və şərəfli ömür yolu keçmişdir. Dövlət quruculuğunun nəzəri-hüquqi problemləri ilə məşğul olan bir alim kimi Bakı Ali Partiya Məktəbinin «Partiya və sovet quruculuğu» kafedrasında pedaqoji işə dəvət olunmuş, sonra isə Bakı Sosial İdarəetmə və Politologiya İnstitutunun «Dövlət quruculuğu və hüquq» kafedrasına rəhbər təyin olunmuşdur. 1999-cu ildən isə Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının «Dövlət idarəçiliyinin hüquqi təminatı » kafedrasının müdiridir.***

Sadıq müəllim çox işgüzar, tələbkar bir ziyalıdır. Bu yaxınlarda onun «Azərbaycanın dövlət və hüquq tarixi» adlı dərs vəsaiti nəşr olunub. Ömrünü gənclər arasında keçirib. Söhbət düşəndə müəllimliklə məşğul olduğu illərdən hədsiz məmnunluq duyduğunu bildirir və deyir: özümü çox xoşbəxt sayıram ki, Seyfəddin Qəndilov kimi böyük rəhbərlik təcrübəsi olan əməkdar elm xadimi, respublikamızın hüdüdlarından çox-çox uzaqlarda tanınan görkəmli bir ictimaiyyətçi alimin rəhbərlik etdiyi elitar təhsil ocağının əməkdaşıyam. Burada bu böyük insanın apardığı yaradıcı quruculuq işlərindən, professor-müəllim və tələbə, dinləyici və kollektiv üzvlərinə göstərdiyi qayğıdan aldığım mənəvi zövqü ən yüksək dəyər sayıram. Akademiyanın ictimai-siyasi həyatında islahat komissiyasının rəhbəri kimi yaxından iştirakımı kadr hazırlığı sahəsində rektorluğun yeritdiyi ardıcıl və

məqsədyönlü xəttin həyata keçirilməsində sərf etdiyim vaxtdan hədsiz fərəh duyuram.

Sadıq müəllim 70-illik şərəfli bir ömür yaşayıb, yola saldığı illərin hər biri onun yaddaşında unudulmaz bir xatirə ilə əlamətdardır. Bu böyük , nəsillərə nümunə olan şəxsiyyətin həyatı, tərcümeyi-halı onunla birlikdə çalışan, yoldaşlıq edən hər bir insan üçün qalın-qalın cildli kitablara sığmayan bədii-sənədli, həm də maraqla oxunan bir salnamədir. Onu oxuyanlar, kimliyindən, nəçiliyindən asılı olmayaraq, bu zəngin məxəzdən bəhrələnənlər rəhbərin və rəhbər əməyinin nə olduğunu, milli ləyaqətimizin daha da zənginləşməsinə yaradıcı alim töhfəsinin əzəmətini duyacaqlar.

Ömrünün müdriklik mərhələsinə qədəm qoyan, zəngin həyat yolu keçmiş, təcrübəli rəhbər, xalqımızın şanlı oğlu, əziz və istəkli dastumuz Sadıq Səlimov haqqında ürək sözlərini yazmaq, onu təbrik etmək özü də bir səadət , əbədi xoşbəxtlikdir . Bu mənəvi dəyərlərin zirvəsində isə Sadıq vüqarı, əzəmətli Sadıq şəxsiyyəti dayanır…

Sadıq müəllimin ömrünün mənalı on üç ili Qubada keçib. Bu diyarla, onun qurub-yaradan mərd və cəsur insanları ilə bağlı xoş xatirələri var...

«Dünyaya pəncərə» qəzetinin 15 mart №3(76) və «Azad Azərbaycan» qəzetinin 13 mart № 19 (261) 2002-ci il tarixli sayları.



## SURƏDDİN MUSA OĞLU ZEYNALOV

Surəddin Zeynalov 1957-ci ildə Qərbi Azərbaycanın tarixi ərazilərindən olan Göyçə mahalın Basarkeçə bölgəsindəkı Qamışlı kəndində anadan olub. Bu kəndin görkəmli şəxsiyyətlərindən adı dillər əzbəri olan təbib Hacı Nağı barədə yaşlılardan eşitdiyi maraqlı söhbətlər hələ uşaqlıq illərində məktəbli Surəddinin yaddaşında dərin iz saldığından gələcəkdə həkim olmağı qət etmişdi. Ona görə də “Fizika”, “Kimya”, “Biologiya” fənlərini xüsusi həvəslə öyrənər, ali məktəblərə qəbul proqramı əsasında bu fənlərdən çətinlik yarada biləcək mövzuları ixtisas müəllimlərinin köməyi ilə özü üçün aydınlaşdırardı. Orta məktəbdə əlaçı şagird kimi tanınmışdı. “Vardenis” rayon qəzetinin əməkdaşı kimi “Məktəb həyatı” rubrikasında hazırladığım materiallarin birində onun oxuduğu məktəb və sinif haqqında geniş məlumat vermişdim…

1974-cü ilin qəbul imtahanları təzəcə yekunlaşmışdı, hamı kimi Surəddinin atası Musanın da gözü yolda idi, şad xəbər gözləyirdi… Mənə ailəmizə ən yaxın və doğma olan Allahverdi Abbasov Musanın oğlu Surəddininlə birgə tanıdığım bir neçə gəncin yüksək balla ali məktəblərə – N. Nərimanov adına Azərbaycan Tibb İnstitutunun müalicə-profilaktika fakültəsinə girdiyini bildirəndə çox sevindim…

Surəddin ilk gündən təhsil əlaçısı olmaq üçün gecəni gündüzə qatdı, tələbə adını şərəflə doğrultdu, illər bir-birini əvəz etdikcə həkimliyin sirlərini ciddi cəhdlə öyrəndi, 1980-ci ildə müvafiq ixtisas üzrə ali təhsilli gənc həkim təyinatla Rusiya

Federasiyasının Yeles şəhərindəki "Dəmir yol" xəstəxanasına göndərildi. 1985-ci elədək burada cərrah-ordinator işlədi, tanınmış, məşhur həkimlərlə ünsiyyəti, birgə fəaliyyəti onun bir cərrah kimi püxtələşməsində az rol oynamadı. Həkim məsuliyyətinin böyük bir missiya olduğunu işgüzarlığı, tələbkarlığı, diqqətliliyi, həssaslığı ilə ətrafındakılara sübut etdi. Keçirdiyi həyəcanlı əməliyyatlar getdikcə onun üçün adiləşdi. İki yüzdən artıq ağır, həm də mürəkkəb cərrahlıq əməliyyatlarının yerinə yetirilməsi üçün sərf etdiyi əməyə görə birinci dərəcəli cərrah adına layiq görüldü. Onun tələbəlik illərində tibb elminə, müəyyən mövzularla bağlı elmi-tədqiqata hədsiz maraq göstərməsi və xeyli vaxt keçsə də bu işlə məşğul olmaması onu hər an narahat edirdi. Bu narahatçılığa nəhayət 1986-cı ildə çson qoyuldu: N. N. Semaşko adına Moskva Tibbi Stomatologiya İnstitutunun aspiranturasına qəbul oldu, Moskva mühiti, səhiyyə elminin inkişafı sahəsindəki yeniliklər, təcrübəli tibb alimləri ilə birgə iş yeni bir həyatın başlanğıcı oldu. Cərrah işlədiyi Moskva şəhər 80 saylı klinik xəstəxana və onun sağlamlığın keşiyində duran peşəkar çoxsaylı kollektivinin yaradıcı fəaliyyəti ikinci bir aspirantura təsirini bağışladı. Gərgin zəhmət, əməli işlər, elmi axtarış və ümumiləşdirmələr öz bəhrəsini verdi. 1990-cı ildə **"Kəskin pankreatitin fermentativ peritonitlə ağırlaşmasının diaqnostikası və müalicəsi"** mövzusunda namizədlik dissertasiyasını müdafiə edərək tibb elmləri namizədi elmi adını almış, elə həmin il müsabiqə yolu ilə Azərbaycan Tibb Universitetinin birinci cərrahi xəstəliklər kafedrasına assisent vəzifəsinə seçilmişdir. 1993-cü ildə universitetin Elmi Şurasının qərarı ilə Moskva şəhərinə doktoranturaya göndərilmiş, 1996-cı ilə kimi Semaşko adına Moskva Tibbi Stamatologiya İnstitutunun doktoranturasında əyani təhsil almış və həmin il **"Qarın boşluğunun kəskin cərrahi xəstəliklərinin kompleks diaqnostikasında teploviziyanın rolu** " mövzusunda doktorluq dissertasiyasını müvəffəqiyyətlə müdafiə etmişdir.



1998-ci ildə Azərbaycan Tibb Universitetinin birinci cərrahi xəstəliklər kafedrasına dosent vəzifəsinə seçilmiş və hazırda bu vəzifədə işləyir.

S. M. Zeynalov istedadlı alim-tədqiqatçı, yaradıcılıq təfəkkürünə malik, bacarıqlı, formalaşmış elm adamı, işgüzar həkim, peşəkar pedaqoq və gözəl insandır. Qarın və doş boşluğu üzvlərində yüzlərlə mürəkkəb, həm də uğurlu, rekonstriktiv və bərpaedici əməliyyatlar yerinə yetirməklə saysız-hesabsız ailələrə sevinc bəxş etmişdir. Tibb Universitetində ilk dəfə olaraq endoskopik cərrahi əməliyyatları dosent Surəddin Zeynalov keçirmiş və ölkəmizdə endocərrahlığın inkişafi üçün məqsədyönlü işlər görməsi razılıqla qarşılanmışdır. Onun gənc həkimlərin hazırlanması və formalaşmasında, ixtisaslarının artırılmasında, cərrahlıq elminin sirlərinə yiyələnməsində xüsusi xidmətləri var.

Tibb elmləri doktoru S. Zeynalov Azərbaycan Cərrahlar Cəmiyyətinin(1991), Rusiya Endoskopik Cərrahlar Assosiasiyasının(1996) üzvüdür. Müxtəlif ölkələrdə çap edilmiş 30-dan çox elmi əsərin, ocümlədən bir dərsliyin və bir monoqrafiyanın müəllifidir. Müasir cərrahlığın ayrı-ayrı bölmələri üzrə 6 beynəlxalq sertifikat almışdır.

## BƏHRAM SALMAN OĞLU AVILOV

O, 1938-ci ildə Göyçə mahalındakı Basarkeçər rayonunun Qanlı kəndində anadan olub. Orta təhsilini rayonun Çaxırlı kəndində bitirib. Hələ uşaqlıqdan özündən böyük qardaşı Bəylər kimi ali təhsil alıb müəllim

olmağı qarşısına məqsəd qoyub. 1959-cu ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna qəbul olub. Buranı "Lenin" təqaüdü ilə oxuyub, 1964-cü ildə fərqlənmə diplomu ilə bitirib. Təyinatla Saatlı rayonuna göndərilib. Lenin-kənd kənd məktəbində direktorun tədris işləri üzrə müavini və tarix müəllimi işləyib. Təyinat müddətini başa vurduqdan sonra Bakıya qayıtmış və Abşeron Rayon Partiya Komitəsində əvvəlcə təlimatçı, sonra isə şöbə müdiri vəzifəsində işləyib.

Bəhram Avılov 1968-1971-ci illərdə Azərbaycan EA Fəlsəfə və Hüquq İnstitutunda fəlsəfə elmi üzrə aspiranturada oxuyub.

1971-ci ildə namizədlik dissertasiyası müdafiə edərək, fəlsəfə elmləri namizədi adına layiq görülüb.

1973-1977-ci illərdə Azərbaycan EA Prezidentinin nəzdindəki "Fəlsəfə" kafedrasında baş müəllim işləmiş və aspiranturada dərs demişdir.

1977-ci ilin fevralından Azərbaycan İnşaat-Mühəndisləri İnstitutunda "Tarix və politologiya" kafedrasında dosentdir. Çoxsaylı elmi məqalələrin və monoqrafiyaların müəllifidir. "Milli məsələnin konkret sosioloji yolla tədqiqi", "Gəncləri beynəlmiləl tərbiyəsində əmək kollektivlərinin rolu", "Xatirələrdə yaşayan günlər, yaxud dadeportasiya ", "Göyçə və göyçəlilər" kitabları oxucuların masaüstü kitablarıdır. Onun "Dostluq və qohumluq borcu" adlı kitabı bu yaxınlarda işıq üzü görəcəkdir.

## CƏFƏR ƏLFİDA OĞLU MƏMMƏDOV



Qədim Naxçıvan Azərbaycan elmini, incəsənətini, mədəniyyətini, ədəbiyyatını şöhrətləndirən alimlər, bəsstəkarlar, rəssamlar, heykəltəraşlar, memarlar, şair və nasirlərin, saysız-hesabsız ictimai-siyasi və dövlət xadimlərinin yurdudur. Bu diyar dünya mədəniyyətinə bəxş etdiyi görkəmli tarixi şəxsiyyətləri ilə uca dağlar kimi çox-çox uzaqlardan daha əzəmətli görünür. Şahbuzu da, Ordubadı da, Şəruru da, Sədərəyi də, Vabəki də, o taylı-bu taylı azərbaycanın Culfası da əzizdir, müqəddəsdir Naxçıvanın özü kimi… Mehriban, mərd, mətanətli, dəyanətli övladları ilə öyünən bu diyar zəngin təbii sərvətləri ilə də digər ərazilərdən fərqlənir.

Bu yazıda günəşli Azərbaycanın bir parçası olan, çoxsaylı ziyalıları ilə tanınan Culfanın Bənənyar kəndinin yetirməsi, fəxri-fəxarəti sayılan, respublika əhalisinin sağlamlığı keşiyində rəhbərlik etdiyi xəstəxananın bütün kollektivi ilə dayanan bacarıqlı səhiyyə təşkilatçısı Cəfər Əlfida oğlu Məmmədov barədə yığcam məlumat verilir.

O,1960-cı ildə Naxçıvan Muxtar Respublikasının Culfa rayonundakı Bənənyar kəndində dünyaya göz açıb. Uşaqlığını doğa kənddə keçirib, buradakı orta məktəbi 1977-ci ildə müvəffəqiyyətlə bitirərək , elə həmin ildə də çoxdan arzusunda olduğu Nəriman Nərimanov adına Tibb İnstitutunun müalicə-profilaktika fakültəsinə daxil olub. Həkimliyin incəliklərinə yiyələnmək üçün səy və bacarığını əsirgəməyib. Keçirdiyi yuxusuz gecələr, görkəmli alimlərin oxuduğu maraqlı elmi

mühazirələr, keçirdiyi nəzəri - əməli seminarlar onun gənc bir həkim kimi yetişməsində əvəzsiz rol oynayıb. Perspektivli gələcəyi olduğunu nəzərə alan rektorluq onun M. Qasımov adına Respublika Klinik Xəstəxanada internatura keçməsini məqsədəuyğun sayıb. Təyinatla 1984-cü ildə Naxçıvana göndərilib. Əvvəlcə burada patoloq-anatom, sonra isə travmotoloq işləyib.

C. Ə. Məmmədov 1988-ci ilin aprelindən 1997-ci ilədək Elmi Tədqiqat Travmotologiya və Ortapediya İnstitutunun poliklinika şöbəsində həkim-travmotoloq, plastik cərrahiyyə şöbəsində həkim-travmotoloq, müdir, operasiya blokunun müdiri işləyib. Elmi-nəzəri bilikləri əməli təcrübə ilə üzvü şəkildə əlaqələndirməkdə xüsusi səriştəsi, yüksək təşkilatçılığı ilə fərqləndiyinə, həmçinin «Həkimlərin attestasiyasını daha da təkmilləşdirmək tədbirləri barəsində » Azərbaycan Respublikası Səhiyyə Nazirliyi 27 dekabr 1992-ci il tarixli əmrinin tələblərinin yerinə yetirilməsində fərqləndiyinə görə Attestasiya Komissiyasının 15 dekabr 1993-cü il tarixli qərarı ilə travmotologiya-ortepediya ixtisası üzrə ali dərəcə diplomu, Səhiyyə Nazirinin 24 dekabr 1999-cu il tarixli 367 K № -li əmrinə əsasən ali dərəcəli həkim - travmotoloq- ortoped adı verilmişdir.

Cəfər həkimin yüksək təşkilatçılıq qabiliyyətinə malik olması diqqətdən yayınmamış, ona etimad göstərilərək 1998-ci ildə Musa Nağıyev adına Bakı Şəhər Təcili Tibbi Yardım Klinik Xəstəxanasının baş həkimi vəzifəsinə irəli çəkilib. İşə başladığı ilk gündən səhiyyə intizamının möhkəmləndirilməsi, işçilərə qarşı tələbkarlığın artırılması, xəstəxananın dəhlizində, korpus və şöbələrində əsaslı təmir işlərinin aparılması istiqamətində məqsədyönlü fəaliyyət göstərib, kadrların seçilib yerləşdirilməsində Səhiyyə Nazirliyinin yeritdiyi siyasətin həyata keçirilməsində əlindən gələni əsirgəməyib.

Xəstələrə göstərilən yüksək ixtisaslı tibbi yardımın, eləcə də icra intizamının səmərəli təşkilinə görə Səhiyyə Nazirinin 46 K №-li əmri ilə 2000-ci ilin aprelində ona təşəkkür elan edilmişdir.

C. Məmmədov tələbkar rəhbər işçi olduğu kimi, gözəl ailə başçısı, mehriban atadır. Həyat yoldaşı Şölə xanım ixtisasca həkimdir. Hər ikisi Yazıçı Oqtay Salamzadənin «Sənin məhəbbətinlə» əsərini ürəkdən sevdikləri üçün yeganə oğluna Fərid adını qoyublar. Övladları Fərid fərəhlərinin, İlahə isə arzu-diləklərinin ilhamçısıdır.

## AZƏR FƏZİ OĞLU KƏRİMOV



Azər Fəzi oğlu Kərimov 1951-ci il 29 dekabrda Qarabağın tarixi ərazilərindən olan Bərdə rayonunun Yeni Daşkənd kəndində hörmətli el ağsaqqalı, Qarabağ torpaqlarının düşməndən azad edilməsi uğrunda istəkli oğlunu itirmiş şəhid atası, gələcək nəsillərə nümunə olan el şairi Fəzinin ailəsində anadan olmuşdur. Uşaqlıq və məktəb illərini burada keçirən, respublikanın tanınmış riyaziyyatçılarından Tanrrıverdi Hacıyevin yetirməsi kimi tay-tuşları arasında seçilən Azər Kərimov doğma kənddəki orta məktəbi əla qiymətlərlə bitirərək, elə həmin ildə Ç. İldırım adına Azərbaycan Politexnik İnstitutunun «Sənaye-mülki tikintinin iqtisadiyyatı» fakültəsinə qəbul olmuşdur. Seçdiyi ixtisasa olan marağı, çalışqanlığı, seminar məşğələlərində fərqləndiyi Azərə uğurlar qazandırmış, əlaçı tələbə kimi ictimai təşkilatların fəal üzvlərindən olmuş, institutu fərqlənmə diplomu ilə bitirərək Elmi Şuranın qərarı ilə oxuduğu ali məktəbdə müəllim saxlanılmışdı.

1973-75-ci illərdə Gəncədə yeni təşkil edilən Azərbaycan Texologiya İnstitutunda müəllim işləmiş, 1975-ci ildə müsabiqə yolu ilə Azərbaycan İnşaat Mühəndisləri İnstitutuna dəyişirilmiş, 1986-cı ilədək buradakı «İqtisadiyyat» kafedrasının dosenti olmuşdur.

Pedaqoji fəaliyyətlə yanaşı elmi tədqiqat işlərini də davam etdirmiş, texnika elmləri doktoru, professor Saleh Hüseynzadənin rəhbərliyi ilə 1983-cü ildə Moskva Texnologiya Elmi Tədqiqat İnstitutunda ***«Tikinti işlərinin texnodogiyası və təşkili***

***məsələlərində riyazi modellərin nəzəri və praktik tətbiqi»*** mövzusunda namizədlik dissertasçiyasını müdafiə edərək elmlər namizədi alimlik dərəcəsini almışdır. 1985-ci ildə isə elmi-tədqiqat sahəsində ali məktəb müəlimləri arasında keçirilən müsabiqənin qalibi kimi laureat adını olmuşdur. ***«İqtisadi cəhətdən əsaslandırılmış yeni texnologiyanın və əlverişli təşkilin nəzəri əsaslarının riyazi modellər əsasında hazırlanması»*** mövzusunu (1995) qlobal səviyyədə müdafiə edərək iddiaçısı olduğu elmlər doktoru adına layiq görülmüşdür.

Azər Kərimov yüksək ixtisaslı kadr kimi 1987-ci ildə Azərbaycan Respublikası Xarici işlər və Təhsil Nazirliklərinin zəmanəti ilə , həm dəmüsabiqə yolu ilə xaricə - Çexoslovakiya ölkəsinə müəllim göndərilib. Uzun müddətdir ki,burada çalışır, Moroviya Texnoloji Unversitetinin professorudur. O, poliqlot bir alim kimi alman, fransız, çex, polyak, türk dillərində mühazirələr oxuyur. Burada fəaliyyət göstərən dünya Azərbaycanlıları əlaqə şurasının üzvü, Çex – Azərbaycan diasporunun sədridir. Yüzdən çox elmi əsəri , dörd monoqrafiyası nəşr edilmişdir.

Azər Fəzi oğlu Kərimov respublikanın sayılan ziyalılarından biridir. O, dost xarici ölkədə xalqımızı ləyaqətlə təmsil edir. Tez – tez soydaşları qarşısında çıxış edir, bir qada olaraq hər il anadan olduğu günlə eyni vaxta təsadüf edən Dünya azərbaycanlılarınının həmrəylik günü ərəfəsində televiziyada, mətbuatda çıxışları ilə bu tarixi günün əhəmiyyətindən, xalqımızın daha da sıx birləşməsində əvəzsiz rol oynadığından maraqla söhbət açır. Azərbaycan televiziyasının birinci proqramında 2002-ci ilin 29 dekabrında efrə gedən çıxışı çoxmilyonlu dinləyici-tamaşaçılara Azər müəllimin bu sahədə apardığı işlərin uğurlarından xəbər verir.

Azər müəllimin ailə üzvləri: həyat yoldaşı Namizər Qəzənfər qızı riyaziyyaçıdır. Böyük oğlu Naqif hüquqşünas, Aqif iqtisadçıdır. Hər ikisi dörd mindən çox tələbəsi olan Çexiya Dövlət Universitetinin magistraturasında təhsillərini davam etdirir. Gələcəyin böyük, tanınan, xalqının adına şərəf və şöhrət gətirən ziyalılarından olacaqlar.

## TƏRCÜMƏÇİ, FİLOLOQ, ALİM



Bayramov Akif Əmirxan oğlu 1938-ci ildə sazlı-sözlü Oğuz ellərindən olan Qədim Borçalı mahalının Arxlı kəndində anadan olmuşdur. Doğma kənddəki məktəbdə orta təhsilini başa vurmuş, ali təhsilini davam etdirmək üçün Bakıya gəlmiş, Azərbaycan Dövlət Xarici Dillər İnstitutunun Alman dili fakultəsinə daxil olmuşdur. Buranı 1962-ci ildə bitirdikdən sonra təyinatla vətəni Borçalıya göndərilmiş, böyüyüb boya çatdığı Arxlı kəndindəki orta məktəbə Azərbaycan-alman dili müəllimi təyin edilmiş və eyni zamanda fəhlə-gənclər məktəbinin direktoru vəzifəsində işləmişdir.

İşgüzar, təşkilatçı, bacarıqlı bir gənc müəllim kimi ona yüksək etimad göstərilərək, 1964-cü ildə Bolnisi rayon Komsomol Komitəsinin 1-ci katibi vəzifəsinə irəli çəkilmişdir.

O, yaşayış yerini dəyişməsi ilə əlaqədar olaraq Bakıya köçmüş, bir müddət «Azərbaycan müəllimi» qəzetində xüsusi müxbir, sonralar Azərbaycan Respublika Komsomolunun Mərkəzi Komitəsində məsul təşkilatçı, Daxili İşlər Nazirliyində məsul vəzifələrdə işləmişdir. 1978-ci ildə Azərbaycan Elmlər Akademiyasının Nizami adına Ədəbiyyat İnstitutunda prof. Kamran Məmmədovun rəhbərliyi ilə «Mirzə Şəfi Vazehin ədəbi irsi: Sovet və Alman məxəzlərində müqayisəli tədqiqi» adlı namizədlik dissertasiyasını, 1989-cu ildə isə Azərbayjan Dövlət Universitetində «Klassik Azərbaycan ədəbiyyatı alman dilində» mövzusunda doktorluq dissertasiyasını müdafiə etmişdir. 1989-1993- cü illərədək S. Ağamalıoğlu adına Gəncə Kənd Təssərüfatı

Akademiyasında dosent, sonralar professor vəzifəsində çalışmışdır.

A.Bayramov 1993-cü ildən keçmiş BSİPİ- nın «Dillər» kafedrasında müdir və professor işləyib. 1999-cu ildən Azərbaycan Respublikasının Prezidenti yanında DİA-nın «Dillər» kafedrasının müdiri və professoru vəzifəsində işləyir.

A. Bayramov çoxsaylı elmi-publisist əsərlərin müəllifidir. «Klassik irsimizdən» (1975), «Mirzə Şəfi Vazehin ədəbi irsi» (1980), «Nizaminin Almaniyada böyük şöhrəti» (1987 rus-dilində), «Klassik Azərbaycan ədəbiyyatı alman dilində» (1992) monoqrafiyaları çap olunmuşdur.

Onun vaxtaşırı Azərbaycan mətbuatında elmi-publisist məqalələri çap edilmişdir. Fridrix Bodenştetin «Mirzə Şəfi haqqında xatirələr» kitabını alman dilindən Azərbaycan dilinə çevirmişdir. A. Bayramovun bədii yaradıcılığında bir sıra səhnə əsərlər də tamaşaçılar tərəfindən rəğbətlə qarşılanmışdır: 1981-ci ildə «Onun qaytarılmış məhəbbət» pyesi Gəncə Dövlət Dram Teatrında səhnəyə qoyulmuşdur. «Dost məhəbbəti», «Sevinc», «Mirzə Şəfi Vazeh», «Səni axtarıram» televiziya tamaşaları həmin illərdə respublika televiziyasında göstərilmişdir. Həmin əsərlər Respublikanın Əməkdar İncəsənət xadimi Ağakişi Kazımov tərəfindən tamaşaya qoyulmuşdur.

Akif müəllimin tanınmış ziyalılarla geniş dostluq əlaqələri vardır. Onun Hüseyn Arif, Əfrasiyab Bədəlbəyli, Mikayıl Mirzə, Lütvi Məmmədbəyli, Rəfiq Zəka, akademik Məmməd Cəfər, Əziz Mirəhmədov, Kamran Məmmədov və bu kimi görkəmli elm, incəsənət, mədəniyyət xadimləri ilə bağlı xoş xatirələrini dinləməkdən həmsöhbəti olanlar hədsiz zövq alır.

Amerikalı yazarlardan Barbara Şolin, Franses Manuşkinin rəhbərliyi ilə Sorosun MDB üzrə Moskvada keçirdiyi uşaq ədəbiyyatı üzrə «Ən yaxşı yazarlar» sorğu-müsabiqəsində A. Bayramov qalib sayılmış və müsabiqənin sertifikatını almışdır.

Akif müəllim gözəl ailə başçısıdır. Həyat yoldaşı T. Bayramova rus dili müəllimidir. 2 övladı var. Oğlu Faiq Bayramov özəl orqanlarında işləyir. 3 nəvəsi var.

**ŞAMİL** strukturlarda çalışır. Anar.Ba

**AĞABABA OĞLU QASIMLI**



Fəlsəfə elmləri doktoru, professor, Azərbaycan Respublikasının Prezidenti yanında DİA-nın «Kadrların ixtisasartırması və yenidən ixtisaslaşması» fakültəsinin dekanı Şamil Qasımlı 1941-ci il 16 sentyabrda Sabirabad rayonunda anadan olub. Buradakı rus orta məktəbi (1959) bitirib. M. F. Axundov adına Azərbaycan Pedaqoji Dillər İnstitutuna(1960) daxil olub, buranı 1965-ci ildə «Rus dili və ədəbiyyatı» ixtisası üzrə bitirərək təyinatla keçmiş Abşeron rayo-nunun Xızı qəsəbəsindəki səkkizilik məktəbə göndərilib. Bir il müəllim işləyib. 1966 –1991-cı illərdə Azərbaycan Dövlət İqtisad İnstitutunda çalışıb. Bir müddət tədris şöbəsində iaparıcı mütəxəssis, rektorun və elmi işlər üzrə prorektorun köməkçisi işləyib, 1971-ci ildən pedaqoji işə dəyişirilib. O, 1972-ci ildə professor Cəmil Əhmədlinin rəhbərliyi ilə «Əməyin növbələşməsi qanunu və onun sosial nəticələri» mövzusunda namizədlik dissertasiyasını müdafiə edərək fəlsəfə elmləri namizədi alimlik dərəcəsi almış, 1986-cı ildə doktorluq dissertasiyası üzərində işi tmamladığı üçün baş elmi əməkdaş vəzifəsinə dəyişdirilmiş və M.V. Lomonosov adına Moskva Dövlət Universitetinin fəlsəfə fakültəsinə ezam edilmişdir. 1989-cu ilin mayında MDU-nun «Fəlsəfə» fakültəsinin İxtisaslaşmış Elmi Şurasında «Şəxsiyyətin sosial fəallığı» mövzusunda doktorluq dissertasiyasını müvəffəqiyyətlə müdafiə etmişdir.

Prof. Ş. Qasımlı 1991-ci ildə BSİPİ-yə prorektor vəzifəsinə təyin olunmuşdur. Onun Azərbaycan ensiklopediyasının 1X- X cildlərində «Fərd», «Fəaliyyət», «Struktura», «Fərdiyyətçilik», «Şəxsiyyət», «Cəmiyyət» (1986-1987), «İnsan amilinin fəallaşdırılmasının yolları və mahiyyəti» mövzusunda monoqrafik yazıları və fəlsəfə tarixi məsələlərinə dair elmi məqalələri elmi əsərlərdə, jurnallarda dərc olunmuşdur. Ş. A. Qasımlı elm təşkilatçılarından biridir. Azərbaycan Respublikasının Prezidenti yanında DİA 1999-cu ildə yaradılanda əsas profil üzrə dekan



tivdə böyük nüfuzu vardır. Gözəl ailə iləsində elmə böyük maraq göstərilir. Əzizə xanım Azərbaycan Texniki ıüdiridir. Oğlu Fariz Dövlət İdarəçilik ınzibati idarəetmə» fakültəsinin Vərgiz orta məktəbdə oxuyur.

## AZAD FİRUDİN OĞLU ƏLİYEV

Sarıyaqub Göyçə mahalının ən qədim kəndlərindəndir. Bu kənd Göyçə silsilə dağlarına daxil olan Şivri dağının ətəyində yerləşir. XY əsrin sonu, XY1 əsrin 1 yarısında yaşamış məşhur dövlət xadimi, xalqın inandığı müqəddəs şəxsiyyət və Azərbaycan aşıq poeziyasının banilərindən biri sayılan Miskin Abdalın dünyaya göz açdığı bu kənddə zaman-zaman gözəl el şairləri, aşıqlar, sənətkarlar və alimlər yetişmişdir. Miskin Abdal şəcərəsindən olan Azad Firudin oğlu Əliyev 1959-cu ildə bu kənddə müəllim ailəsində anadan olmuşdur.

Azad Əliyevin uşaqlıq illəri doğma kənddə keçmiş, səkkizinci sinfi bitirdikdən sonra Qoşabulaq kənd orta məktəbində təhsilini 1976-cı ildə başa vurmuş, elə həmin il N. Nərimanov adına Azərbaycan Tibb İnstitutuna daxil olmuşdur. Oranı 1982-ci ildə fərqlənmə diplomu ilə bitirərək təyinatla Dağlıq Qarabağ Muxtar Vilayətinə göndərilmişdir. O, əvvəlcə Xocavənd (keçmiş Martuni) rayon SES-də həkim-bakterioloq, Ağdərə (keçmiş Mardakert) rayonunda entomoloq, 1983-cü ilin aprelindən 1989-cu ilin yanvarınadək Şuşa rayon SES-də sanitar həkimi işləmişdir.

A. Əliyev 1989-1990-cı illərdə N. Nərimanov adına ATU-nun "Sosial-gigiyena və səhiyyənin təşkili" kafedrasında kliniki ordinaturada təhsil almış, 1991-ci ilin mart ayından etibarən həmin kafedrada əvvəlcə baş laborant, 1992-ci ildən isə assistent kimi fəaliyyət göstərmişdir.

Tələbəlik illərindən elmi tədqiqata olan maraq və həvəsi Azad müəllimi daim narahat edirdi. Bu istəyinə çatmaq üçün o, pedaqoji fəaliyyətlə yanaşı, həm də elmi-tədqiqat işləri ilə məşğul oldu, araşdırmalar apardı. 1998-ci ildə Moskva şəhərindəki Rusiya Dövlət Tibb Universitetinin İxtisaslaşmış Elmi Şurasında gərgin zəhmətin bəhrəsi olan "Azərbaycanda kənd əhalisinin sağlamlıq vəziyyətinin regional xüsusiyyətləri" mövzusundakı namizədlik dissertasiyasını uğurla müdafiə edərək iddiaçısı olduğu alimlik dərəcəsini aldı. Gənc alim vaxt itirmədən dünya tibb elmi üçün öyrənilməsi önəmli hesab olunan vaxtından əvvəl ölümün ölkə miqyasında azaldılmasına xidmət edən "Azərbaycanda vaxtından əvvəl ölümün səviyyəsi və səbəblərinə görə strukturunun dinamikasının sosial-gigiyenik qiymətləndirilməsi və səhiyyə proritetlərinin əsaslandırılması" mövzusunda doktorluq dissertasiyası üzərində işləyərək elmi-tədqiqat işini başa çatdırıb, 2002-ci ilin sonunda uğurla müdafiə etmişdir. Onun indiyə qədər 62 elmi işi, o cümlədən praktik səhiyyə üçün 5 metodiki tövsiyəsi, tələbələr üçün bir tədris-metodiki vəsaiti və doktorluq dissertasiyasının mahiyyətinə uyğun bir monoqrafiyası nəşr olunmuşdur.

2002-ci ilin sentyabrından gənc alim A.F.Əliyevə Azərbaycan Respublikası Səhiyyə Nazirliyi və Azərbaycan Tibb Universitetinin rektorluğu tərəfindən etimad göstərilərək "Sosial-gigiyena və səhiyyənin təşkili" kafedrasının müdiri vəzifəsinə təyin olunmuşdur. Onun ölkə tibb ictimaiyyəti arasında böyük hörməti və nüfuzu vardır. O, Azərbaycan Respublikası Səhiyyə Nazirliyinin "Sosial-gigiyena və səhiyyənin təşkili" ixtisası üzrə Attestasiya Komissiyasının sədri və islahatlar üzrə fəaliyyətdə olan Dövlət Komissiyasının işçi qrupunun üzvüdür. Həmçinin

AAK-nın İxtisaslaşmış Elmi Şurasının  və ATU-nun və fakültə Elmi Şuralarının üzvüdür.

Ailəlidir, bir övladı vardır.



## ƏHMƏD HƏSƏN OĞLU HÜSEYNOV

1947-ci il martın 1-də Şərur - Dərələyəz mahalının Əmioğlu kəndində müəllim ailəsində anadan olub. Atası Həsən müəllim ixtisasını mükəmməl bilən, şifahi xalq yaradıcılığına dərindən bələd olan, gözəl təbiət mənzərələrinə həsr etdiyi rəsmləri ilə tanınan ədəbiyyatçı kimi camaat arasında hörmət və nüfuz qazanıbmış. Haqsızlığa qətiyyən dözməzmiş. Həmkəndliləri Əzizin ov üstündə erməni millətçiləri ilə arasında baş verən narazılığı aradan qaldırmaq üçün öz sədaqət və yoldaşlığını göstərən, rayon milis şöbəsində azərbaycanlılara qarşı edilən haqsızlıqdan təəssüblənərək əsəb gərginliyi keçirən Həsən müəllim istəkli balalarından çox vaxtsız ayrılmışdı. Onda Əhmədin on üç yaşı var idi. Altı bacının yeganə qardaşı olduğundan Bağdagül ana onu əsən küləkdən də qoruyub. Evin yararını, yağ-balını, əziz tikəsini Əhmədin dişinin altından keçirib. Səkkizillik təhsilini doğma kənddə başa vuran bu gənc Şərur rayonundakı Qarxun kənd orta məktəbində davam etdirib. Buranı müvəffəqiyyətlə bitirdikdən sonra ali məktəbə sənədlərini təqdim etmək üçün əmək stajı lazım olduğundan 1964-66-cı illərdə Gümüşlü mədənində fəhlə-yeraltı qazmaçı işləyib. 1966-cı ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna qəbul olunub və 1971-ci ildə həmin institutun tarix fakültəsini müvəffəqiyyətlə başa vurub. Təyinatla Sabirabad rayonuna göndərilib. Respublika üzrə keçirilən idman yarışlarında fərqlənən perspektivli kadr olduğu nəzərə alınaraq daxili işlər orqanlarında işə götürülüb. Sabunçu rayon daxili işlər idarəsində milis zabiti kimi əmək fəaliyyətinə başlayıb, az müddətdən sonra sahə müvəkkili təyin olunub, zaman

ötdükcə növbəti rütbələri alıb,. Hüququ mühafizə, asayişin qorunması sahəsində səriştəli, bacarıqlı, qanunun aliliyini hər şeydən üstün tutan ən bacarıqlı əməkdaş kimi SSRİ DİN Rostov şəhərindəki milis Akademiyasına tövsiyə edilib, 1985-ci ildə təhsilini uğurla başa vuraraq hüquqşünaslıq üzrə ikinci ali təhsil diplomu alıb, Xətai RDİŞ- ə əməliyyat işləri üzrə rəis müavini təyin edilib. Daha sonra Nəsimi, Xızı, Bakı şəhəri DİI-də məsul vəzifələrdə çalışıb. Qarabağın ağır günlərində Əhməd Hüseynov cəbhə bölgələrində gedən döyüşlərdə iştirak edib, Xızı rayonunun əhalisi tərəfindən döyüş zonasında vuruşan əsgərlərə göndərilən ərzaqı, geyimi və hərbi sursatı onlara vaxtında çatdırıb. 1999-cu ildə daxili işlər orqanlarından istefaya çıxıb.

1999-cu ildən sonra Səbail Bələdiyyəsinə üzv seçilmişdir. Hazırda rayon bələdiyyəsinin sədridir. İnzibati idarəçilk bacarığını siyasi idarəçiliklə üzvi şəkildə əlaqələndirməyi bacaran təşkilatçı, həm də olduqca tələbkar bir rəhbər işçidir. Bələdiyyələrə seçildiyi müddət ərzində rayonun sosial-iqtisadi həyatında müsbət dəyişikliklərin baş verdiyini inkar etmək olmaz, ilk növbədə parkların, meydanların, küçələrin asfaltlaşdırılması, yaşıllıqların qaydaya salınması bələdiyyənin yerləşdiyi inzibati binanın əsaslı təmir edilməsi sahəsində məqsədyönlü fəaliiyət göstərir. Görülən işlər barədə respublika televiziyasında vaxtaşırı məlumatlar verilir.

Ə. Hüseynov möhtərəm prezidentimiz H. Ə. Əliyev siyasətinin ardıcıllıqla həyata keçirilməsində var qüvvə ilə çalışır, fəal həyat mövqeyi ilə geniş ictimaiyyətin diqqətini cəlb edir. İctimaiyyət arasında Əhməd müəllimin böyük hörməti və nüfuzu vardır. Dostları, tanışları, bir sözlə onu yaxından tanıyanlar Əhmədin mənəvi keyfiyyətlərinə qibtə edirlər. Yaxşı qardaşdır. Bacıları Leyli, Vəzifə, Zərifə, Yəmən, İntizar və Fəridənin iman-güman yeri, qibləgahıdır. Onların övladlarının istəkli dayısı, arxaları, dayağı, yol göstərənləridir. Bütövlükdə isə böyük bir nəslin, həmçinin dost-tanışların ümid yeridir. İşi dara düşənlər mütləq Əhmədin kömək və qayğısı ilə vəziyyətdən çıxır.

Əhmədin dörd övladı var: üç oğul və bir qız atasıdır. Nofəl, Kamran, Həsən və qardaşlarının sevimlisi Afət. Nəvələri Cavid, Əhməd, Aqşin və Azərin xanım babalarını, nənələri Zübeydə xanımı sonsuz məhəbbətlə sevirlər. Bu sevgi onlara irsən keçən sevgidir.

Mən Əhməd Hüseynovla tələbə dostuyam. Eyni otağın tələbə sakinləri olmuşuq. Bakıxanov küçəsində yerləşən yataqxananın 225 sayli bu doğma otağından şair Alqayıd Xəlilov, publisist Tofiq, ədəbiyyatşünas alim Seyfəddin, şair Ələddin Eyvazov qardaşları, qabaqcıl maarif işçilərindən Aftandil Nəbiyev, Mübariz Hüseynov, Vaqif Ələkbərov, Səlim Yusifov, respublikanın əməkdar müəllimi Novruz Quliyev həyata atılmışlar… Respublikanın görkəmli elm, ictimai və dövlət xadimlərindən Nizami Xuduyev, Qərib Məmmədov, camaat arasında Dədə kimi tanınan Məmməd Əsgərov, Məhərrəm Cəfərov, Zəhmət Şahverdiyev və başqa müştərək dostlarımız tələbəlik illərinin ən müqəddəs ərmağanları siyahısının bəzəyidir. Müqəddəs və əziz sayılan tələbəlik illərinin yaddaqalan gözəl anlarının xoş xatirələri yada düşəndə adam özünü çox gümrah sayır.

Əhmədə mənim məhəbbətim vəzifəsinə görə deyil. Onun elə nadir, heç kəsdə olmayan elə mərdanə xüsusiyyətləri var ki, cavan olsa da, yaşı müdrikliyi haqlayan el ağsaqqallarımızı, dünyagörmüşlərimizi, əsl ər kişiləri, nər kişiləri andırır. Kəndlərinin yaşlı sakinləri söhbət düşəndə onun babasının el ağsaqqalı olduğunu, mahalda Ağ Hüseyn ləqəbi kimi tanındığını və Əhmədin hərəkətlərinin onun hərəkətlərinə bənzədiyini vurğulayırlar.

Əhmədin təbiətində kiməsə, nəyəsə gərək olmaq, əl tutmaq, qayğı göstərmək, ağzının loğmasını dost-tanışlarına yedizdirmək, yolundan azanlara istiqamət vermək kimi müqəddəs xüsusiyyətlər var… Bir də ikimiz də atasız olduğumuzdan eyni dərd , eyni kədər vaxtilə bizi bir-birimizə yaxınlaşdırıb, dost edib. Ailələrimiz arasında ünsiyyət yaranıb. Bacılarımızın- Qənirə və Zərifənin dostluq əlaqələri ailələrin dostluq tellərini daha da möhkəmləndirib. Analarımız da ikiləşib,



qardaş-bacıların sevgisi, məhəbbəti insanlıq naminə, dostluq və yoldaşlıq naminə, kəsilən duz-çörək, edilən xətir-hörmət naminə sınaqlardan keçə-keçə möhkəmlənib, müqəddəsləşib, ülviləşib.

Heç yadımdan çıxmır. Bir dəfə 1968-ci ilin yayında Əhmədlə Naxçıvan qatarı ilə onlara getmişdik. Adamları kimi mərd, məğrur Əmioğlu kəndinin dağların belinə dolanan yolların zirvədə yerləşən evlərinin damından bütün təbiəti seyr etmək, onun gözəlliklərini, əsrarəngizliyini duymaq olurdu. Kəndin gündoğan tərəfində göylərə baş çəkən sıra dağlardan, qartallı qayalardan, dillər əzbəri olan Haçalı Qayadan arabir ötüşən kəkliklər, dərənin dərinliklərində əsrlərdən bəri torpağın dərin qatlarına öz kökləri ilə pəncə atan nəhəng qoz və tut ağacları indi də gözlərimin önündən getmir. Bağdagül ananın, Əhmədin bibisi Zəhra xalanın həyat yoldaşı Oruc əminin burada, dərə çayının kənarında, açıq havada kəndin hörmətli adamlarından Puşkin Heydərov, İsa Əliyev, Məhərrəm Ələkbərov, Səməd Qəhrəmanov, Yasin Seyidov, Behbud Məmmədov, Sabir Tarverdiyev, Akif Mənsimov və başqalarının iştirakı ilə kəndin tələbə qonağının şərəfinə təşkil etdikləri ziyafət süfrəsinin bənzərsizliyi bizim çörək dostu, gərək dostu, görək dostu deyil, xüsusən ürək dostu olmağımızın rəmzi ifadəçisi olmuşdur. Əhmədlə, ailə üzvləri ilə, yaxın qohumlarından Fatma xalanın övladları ilə Şuşada da görüşlərimiz olub. Dostluğumuz həmişə bir-birimizi axtarmağa, aramağa məcbur edib…

Bu ailə kökəbağlı bir ailədir. Geridən bu ailəni seyr edənlər mütləq müsbət nümunə götürməklə onlara bənzəməyə çalışarlar.

## ALLAHVERDİ ŞƏMİSTAN OĞLU HACIYEV

O,1947-ci il aprelin 20-də Oğuz yurdu keçmiş Lori mahalının Allahverdi rayonunda anadan olub. Orta təhsilini başa vurduqdan sonra N. Tusi adına ADPU-nun filologiya fakültəsində təhsil alıb. Akademik Feyzulla Qasımzadə, akademiyanın müxbir üzvləri Əbdülləzəl Dəmirçizadə, Afat Qurbanov və başqalarının mühazirələri onun ixtisasına dərindən yiyələnməsinə, elmi dünyagörüşünün formalaşmasına öz əvəzsiz təsirini göstərib.

1971-1974-cü illərdə bitirdiyi ali məktəbin təyinatına əsasən Saatlı rayonundakı S.Vurğun adına şəhər məktəbində dil-ədəbiyyat müəllimi işləmişdir. Həmin illərdə Saatlı rayon məktəblərində dil-ədəbiyyat fənninin tədrisinin səviyyəsinin yüksəldilməsində, bu fənnin şagirdlər tərəfindən sevilməsində onun böyük əməyi olmuşdur. Təsadüfi deyil ki, xalq şairimiz Bəxtiyar Vahabzadə, mərhum xalq artistimiz Həsənağa Salayev bu məktəbdə olarkən Allahverdi müəllimin dərsini dinləmiş və oradan böyük razılıq hissilə ayrılmışlar. Öz təəssüratını B.Vahabzadə məktəb rəhbərliyi və kollektivi qarşısında belə ifadə etmişdir: *«Mən Allahverdi müəllimin dərsini dinlədikdən sonra belə nəticəyə gəldim ki, sinifdə heç bir texniki və əyani vasitə müəllimi əvəz edə bilməz. Allahverdi müəllimin ixtisasına dair zəngin biliyi və gözəl nitqi bu gün bunu sübut etdi. Siz xoşbəxtsiniz ki, məktəbinizdə belə bir müəllim balalarınıza bizim dilimizi və ədəbiyyatımızı tədris edir, öyrədir»*

A. Hacıyev 1975- ci ildən öz həyat və fəaliyyətini N. Tusi adına ADPU ilə bağlamışdır. O, əvvəlcə institutda metodist

vəzifəsində çalışmış, mərhum professor Əli Fərəcovun rəhbərliyi ilə institut «Elmi əsərləri»nin nəşri ilə məşğul olmuşdur.A. Hacıyev institutun əyani aspiranturasında oxumuş, nəşriyyat şöbəsinin müdiri vəzifəsində işləmişdir. O, 1990-cı ildən indiyədək Azərbaycan dilçiliyi kafedrasının dosentidir. Filologiya fakültəsinin dekan müavini işləmiş, 2001-2002-ci dərs ilindən **«İbtidai təhsil və məktəbəqədər tərbiyə»** fakültəsinin dekanıdır.

A. Hacıyev 1983-cü ildə «Azərbaycanın Şərq zonası rayonları (Sabirabad, Saatlı və İmişli) toponimlərinin linqvistik təhlili» mövzusunda namizədlik disertasiyası müdafiə etmişdir.

A. Hacıyev müəllimlik fəaliyyətinə başladığı dövrdən etibarən «Ümumi dilçilik», «Onomalogiya», «Nitq mədəniyyətinin əsasları», «Azərbaycan dilindən təcrübi məşğələ» fənləri üzrə mühazirə və seminar məşğələləri aparır. O, pedaqoji fəaliyyəti dövründə minlərlə yüksək ixtisaslı dil-ədəbiyyat müəlliminin yetişdirilməsində iştirak etmiş, tələbələrin ən sevimli müəllimlərindən biri kimi böyük nüfuz qazanmışdır.

Onun indiyədək Azərbaycan dilinin müxtəlif problemlərinə həsr olunmuş 60-dan artıq məqaləsi respublikanın bir çox nüfuzlu qəzet və jurnallarında dərc olunmuş, 1990-cı ildə «Azərbaycan dilinin onomastik sistemi» adlı monoqrafiyası çapdan çıxmışdır. Həmin monoqrafiyada ilk dəfə olaraq Azərbaycan dilinin onomastik sistemi anlayışının formalaşmasına səy göstərilmiş, bu sistemin tərkib hissəsi olan toponimlərin leksik-semantik və qrammatik xüsusiyyətləri zəngin dil faktları əsasında şərh olunmuşdur.

A. Ş. Hacıyevin elmi tədqiqatlarının əsas istiqamətini Azərbaycan onomastikası məsələləri təşkil edir. O bu tədqiqatlarında xüsusi adlar qrupuna daxil olan Azərbaycan toponimləri, antroponimləri, ktematonimlərinin bir çox nəzəri məsələlərini işıqlandırmağa nail olmuş, xüsusilə ktematonimlərə dair dünya dilçiliyi tarixində irəli sürülmüş linqvistik nəzəriyyələrin araşdırılması sahəsində sanballı tədqiqatlar

aparmışdır. İstedadlı alim elmi-pedaqoji fəaliyyəti ilə bərabər N.Tusi adına ADPU-nun və bütövlükdə Müstəqil Azərbaycan Respublikamızın ictimai-siyasi həyatında fəal iştirak edir. O, 1992-ci ilin oktyabrında Yeni Azərbaycan Partiyasına rəhbərlik etmək üçün zəmanəmizin böyük siyasətçisi Heydər Əliyevə müraciət edən 91 vətənpərvər ziyalıdan biri kimi respublikamızın müstəqilliyi uğrunda var qüvvəsini əsirgəməyərək, müxtəlif ictimai-siyasi proseslərdə fəal iştirak etmişdir.

Onun «Azad Azərbaycan» (iyul, 1996, № 210) və «Şərqin səsi» (fevral, 1997, № 11) qəzetlərində dərc olunmuş «XX əsrin böyük siyasətçisi» adlı müsahibəsi müdrik prezidentimiz cənab Heydər Əliyevin ictimai-siyasi fəaliyyətindən bəhs edir.

Allahverdi müəllim mehriban, qayğıkeş ata kimi xoşbəxt bir ailə həyatının dəyərli günləri və qayğıları ilə yaşayır. Ailənin sevincini və kədərini onunla bir bölən ömür-gün yoldaşı Raya müəllimə Yeni Günəşli qəsəbəsindəki 202 nömrəli uşaq bağçasında körpələrin tərbiyəsi ilə məşğul olur. İlk qızları İlhamə BDU-nun Şərqşünaslıq fakultəsini, həmçinin həmin ixtisas üzrə magistraturanı əla qiymətlərlə bitirmişdir. İkinci qızları Tamam N. Tusi adına Pedaqoji Universitetin Filologiya fakultəsini və ümumi dilçilik üzrə magisğraturasını fərqlənmə diplomu ilə, üçüncü qızları Könül ibtidai təhsil metodikası və pedaqogikası fakültəsini bitirmiş, hazırda psixologiya ixtisası üzrə magistraturanın ikinci kursunda oxuyur. Onun musiqiyə böyük həvəsi var, kamançada ən çətin mahnıları məharətlə ifa edir. Ailənin ən böyük sevinci olan Araz isə ADUPU-nun «İbtidai hərbi hazırlıq» fakültəsinin sonuncu kurs tələbəsidir



## NƏRİMAN HAQVERDİ OĞLU ƏLİYEV

1936-cı il iyun ayının birində Göyçə mahalının Kəsəmən kəndində kolxozçu ailəsində anadan olub. 1953-cü ildə Basarkeçər rayonundakı Şişqaya kənd orta məktəbini, 1959-cu ildə isə H. B. Zərdabi adına Gəncə Pedaqoji İnstitutunun «Fizika-riyaziyyat» fakültəsini bitirib. Təyinatla Astara rayonuna göndərilib, ucqar dağ kəndlərindən Asxanakaranda, Hamuşamda, Siyəküdə, Giləkaranda, daha sonra şəhər orta internat məktəbində əvvəlcə müəllim, sonra tədris işləri üzrə direktorun müavini işləyib. 1972-ci ildə Şuşaya dəyişirilib, buradakı Hüsü Hacıyev adına şəhər 4 saylı orta məktəbdə pedaqoji fəaliyyətini davam etdirib. 1976-cı ildə riyaziyyat təmayüllü 2 saylı orta-internat məktəbə direktorun tədris işləri üzrə müavini, 1981- 83-cü illərdə isə həmin məktəbin direktoru vəzifələrində işləyib. Səhhəti ilə əlaqədar baş tərbiyəçi vəzifəsinə dəyişirilib. Dağlıq Qarabağ hadisələrinin başlandığı ağır bir vaxtda - 1989-cu ilin 12 fevralında 53 yaşında qəflətən vəfat edib, Şuşanın «Mirzə Həsən» qəbristanlığında həyat yoldaşı Solmaz xanımla yanaşı dəfn edilib.

Nəriman müəllim öz ixtisasını mükəmməl bilən, daim ideya-siyasi savadının artırılması qayğısına qalan bir milli ziyalı idi. Onun yetirmələrinin sorağı Rusiyanın iri şəhərlərindəki ali təhsil ocaqlarından gəlirdi. Olduqca tələbkar, təşkilatçı bir pedaqoq idi. Dərs dediyi şagirdlər fizika və riyaziyyat üzrə keçirilən rayon, vilayət və respublika olimpiadalarının həmişə qalibi olardılar.

O həm də təvazökar, mehriban, adamlarla sadə davranan, yumşaq təbiətli bir müəllim idi. Şəhər sakinləri arasında nüfuz və hörməti vardı. Uşaqdan böyüyə hamı ona ehtiramla yanaşırdı.

Nəriman müəllimin üç övlad yadigarı var: Məhəbbət, Natiq və Natəvan. Hazırda Bakıda qoçqın kimi məskunlaşıblar. Şuşaya qayıdacaqları günün həsrətindədirlər…

## BŞEAQPL SZÜPKSKS CZIXK



Tepax mşxeş Ayzxbamöasls baxpl-bzğxzpk, axaspl-mampaqpl zxaykpzxksezs tpas, Rkppz Rşdasls qtvşəeşdş Krkəpk xamtsşşşs Zpşqşpşpax nzseksez qzekr tdşy çamcapaxlseas üamlpas, Ezez Qtxqşe Eaüçaspaxlsea ael gznkpzs, Bşeaqpl çamcaül jpez-tbaeanl shcşy vz ğuxrzçksz ouxz üjgkpkx. Bş çamcasls adüaqqapl Üzczxzpk nkək urxhshs-ohshshs züaü ğküüzüksk ***«Fzxk Glsqlpl», «Rşxaeçzfz», «Üaxl mjx», «Apaouppzx»*** nkrk ael ekppzx zybzxk mampaqpaxea njgkxrkə, ead ğavaül nkrk çzrky, bşpaq üşmş nkrk əzccac, eadpaxls uyh qzezx zyzrzçpk vz vhqaxpl aearpaxpa hsükmmzçez tpradl, üaya-üuyz üts ezxzöz apşez nzükpzs əzıükmmzçpzxezs tpşb. Tsşs Qzekr Oumgz rağaplsls rzəğşx üzszç aearpaxl kpz üzrkrk etüçpşq zpaqzpzxk, rjğxkbas rhsaükbzçpzxk ksek ez ekppzxez ozykx. Uy yaraslsea Aəlq Zpzüozxks, Aəlq Rşüasls, Aəlq Züzeks, Aəlq Szözcks njgkxekmk çtm rzöpküpzxsez kəçkxan jezx, aəlq rşükqküksks ksözpknpzxksk rşdarpaxlrlyea aıçaxax, mjsk akpz qşxas ozsöpzxks çtmşsea Oumgz aəlqpaxlsks kəçkxanlsl vaökb üamaxel… Aəlq üzszçk, tsşs ksöz, ğzyks rjptekmapaxl, ksüaspaxl etütpşda üzüpzmzs eaüças vz sadlppaxl nunph-bşeaqpl bş szüpks ğzx bkx hyvhshs qaslsa , öaslsa ğtfrşəeş.

Rzəğşx bkx ejmkr vax: “Açapaxls mtpş tdşppaxls mtpşeşx”. Nkgkn maəpaxlseas ğzmaçlsls zs ıtə ohspzxksk mampaqpaxea njgkxzs, üamüly-ğjüabüly aəlq rzöpküpzxksks kəçkxanglül vz ekspzmkökük tpas Ğaöapl zrk aça mtpş kpz ojçrzmk uyhsz rzszvk btxö üamel. Ğzx ezcz mampaqpaxa nug baəpamasea

üasnk urxşsz urhx öapaslx, mşxe mjxpzxksksz, etüç-çasləpaxa qtvşəraq ğzüxzçksks əkxkspknpzxksk maəamlx, ykxvzpzxk qaxpa uxçhph bş şpş, şöa eadpaxls, ap-zpvas ojmksrkə papzpk, szxokypk maraöpaxls qtmsşsea , bşy bşpaqpaxls əlxlpçlpaxlsls maxaçeldl ğzyks rjptekmapaxls ıtə tvqaçlsea mjsk əzspknpzxks njgkxkpzözmk çzzühxaçpaxl kpz maəamaxel. Oumgzeznk etüçpaxlsa qtsaq ojezözmksk, Eaənzseezs Aəlq Bamxarl, Aəlq Ğaölsl, Aəadl Ətxöaeas Aəlq Küparl, Qoşabulaqdan Aşıq Behpudu, Aşıq Rəcəbi mampaq çtmpaxlsa ezvzç jezözmksk, Üjmke Bamxar Adasls töadlsl ykmaxzç jezözmksk, bş töadls əakx çzbkzçpk uvpaepaxlseas tpas ozsö Apqamlels çzyz-çzyz mayeldl qtərapaxlsl ekspzmzözmksk, uvpaepaxlsl - Jpeaxl, Üzczxk, Üankçk, Yağkek, Füzulini, İlhamı açaülsls etüçpaxl kpz maılseas çaslə jezözmksk ızmaplsea etpaselxaxel.

Bşeaqpl çamcaülsls ekpksez Oumgz üuyh, Oumgz nzprzük gtı rhqzeezü kek. Üaya –üuyz badplplq tspaxls ıküpzçksez rhqzeezü bkx eşmdşma gjvxkprkəek. Üankç apk rznçzbz eaıkp tpasea Aəlq Ğaölsls tışeşdş rağslpax, üumpzekmk eaüçaspax rzöpkü kəçkxanglpaxlsls maeeaəlsea ükpksrzy çaxkık bkx ohsz gjvxkpek. Üankç uyhsz oumgzpk etüçpax axael, Baüaxnjgzxks Babacas nzseksezs Ğjmezx Bamxarpl kpz jmsk qxşfea tışeş, akpzvk ojç-ozp zpaqzpzxk maxasel, BEŞ-sşs çaxkı canhpçzüksk czxqpzsrz ekfptrş kpz bkçkxekpzx…

Üankç Ğaöapl tdpş Zpkmjv (Bşeaqpl) 1955-ök kpez Krkəpk xamtsşsşs Zpkqşpşpax nzseksez asaeas tpşb. 1978-ök kpez Ayzxbamöas Euvpzç Şskvjxükçjçksks Çaxkı canhpçzüksk bkçkxkb. 1978-1983-öh kppzxez Bjmpzqas (njgrkə İeastv) xamtsşsşs Üaxlüş nzse rznçzbksez çaxkı rhzppkrk, 1983-1985-ök kppzxez Ayzxbamöas Ksəaaç Rhğzseküpzx Ksüçkçşçşsşs “Czpüzcz” nacjexaülsea baə pabtxasç kəpzmkb. Həmin müddətdə görkəmli filosof prof. Ziyəddin Göyüşovun oxuduğu mühazirələrin seminar məşğələlərini aparıb. 1985-1988-ök kppzxez Ayzxbamöas ÜÜX Jprzpx Anaejrkmaülsls Czpüzcz vz Ğhqşq Ksüçkçşçşsşs “Çaxkık raçjxkapkyr vz ütükap

fükıtptokmasls czpüzck fxtbpjrpzxk” əubzüksks zmask aüfkxasçl tpşb. 1988-1992-ök kppzxez ğzrks əubzez jprk kəgk, 1992-1993-öh kppzxez Qzxb Şskvjxükçjçksks “Ütüktptokma” nacjexaülsea baə rhzppkr, 1993-1994-öh kppzxez Uyzp Ayzxbamöas Şskvjxükçjçksks “Bjmszpıapq rhsaükbzçpzx” canhpçzüksks ejnasl, 1994-1999-öş kppzxez Banl Ütükap Keaxzjçrz vz Ftpkçtptokma Ksüçkçşçşşs “Ütüktptokma” nacjexaülsls etüjsçk, 1999-2002-ök kppzxez Ayzxbamöas Xjüfşbpknaülsls Fxjykejsçk maslsea Euvpzç Keaxzgkpkn Anaejrkmaülsls “Czpüzcz vz ütükap fükıtptokma” nacjexaülsea etüjsç tprşəeşx. Ğap-ğaylxea Euvpzç Keaxzgkpkn Anaejrkmaülsea raoküçxaçşxa fakültəsinin dekanı vzykczüksez kəpzmkx.

Görkəmli Azərbaycan alimi, filosof Əmrəli İsmayılovun rəhbərliyi ilə (1991) “Fxançknk-ezmkəekxkök czapkmmzç vz ütükap çzxzqqksks ühxzçpzsekxkprzüksks ekapjnçknaül” ruvyşüşsea jprk kək rheackz jezxzn czpüzcz jprpzxk sarkyzek apkrpkn aelsl aprləelx. Czpüzczez ksüas fxtbpjrk, rkppk-rzszvk ezmzxpzx, vzçzseaə özrkmmzçk vz ğhqşqk euvpzçks bzxqzxax tpraül, keaxzjçrz rhsaükbzçpzxksks ejrtnxaçknpzəekxkprzük, ksüasls vz özrkmmzçks ezmkəekxkprzüksks czpüzck fxtbpjrpzxk II züx Ayzxbamöasls rkppk-ayaeplq ğzxznaçl çaxkık rzüzpzpzxk kpz badpl tpas elmi rzqapzpzxks rhzppkckekx. Ayzxbamöas Ütüktptik Aüütükaükmaülsls, Ayzxbamöasls bhçuvphmh şdxşsea özrkmmzçks, Bhçuv Ayzxbamöas umxzsrz rzxnzyksks çzükügkpzxksezs bkxk tpşb. “Üksjxojçkna” ütüktptik çzeqkqaçpax rzxnzyksez rzüpzğzçgkekx.

1988-1991-ök kppzx Ayzxbamöas rkppk-ayaeplq ğzxznaçlsls kəçkxanglül tpşb. 1988-1992-ök kppzxez AIÖ-sks hyvh, 1992-ök kpezs 1997-ök kpzezn Iapq Ayaeplq Faxçkmaülsls, 1997-ök kpezs 2002-ök kpzezn Rkppk Ntsqxjü Faxçkmaülsls üzex rhavksk tpşb. 2000-ök kpez Ayzxbamöas Xjüfşbpknaülsls Rkppk Rzöpküksz seçkilərdə ejfşçaçplda sarkyze nkrk kəçkxan jekb.Amalı yazıb yaratmaq, millətinə, dövlətinə xidmət etmək,

insanlara qayğı və xeyrxahlıq göstərməkdir. Arzusu Azərbaycanın bütövlüyünü, xalqının firavan və xoşbəxt yaşamasını görməkdir.Sakit Əliyev elmi-tədqiqatla müntəzəm məşğul olur. Onun Azərbaycan xalqının zülmkarlara qarşı azadlığı uğrunda şanlı mübarizəyə qoşulan görkəmli tarixi şəxsiyyətlər Səttar xan və Şeyx Məhəmməd Xiyabani barədə silsilə elmi-tədqiqat işləri maraq doğurur. Bu yazılarda Səttar xanın və Şeyx Məhəmməd Xiyabaninin mərd, mübariz, xalqının gələcəyini düşünən, xoşbəxt gələcəyə inam bəsləyən alovlu vətənpərvərlər olması barədə tarixi faktları araşdırmışdır. Səttar xanın və Şeyx Məhəmməd Xiyabaninin silahdaşlarının yüksək insani keyfiyyətlərə malik olması, onun rəşadəti, uzaqgörənliyi haqqında söhbət açılır.

Sakit Budaqlı Səttar xanın və Şeyx Məhəmməd Xiyabaninin Azərbaycanın azadlığı və xoşbəxt gələcəyi naminə bugünkü və gələcək nəsillərinizin mübarizlik simvoluna çevrildiyini bir daha elmi cəhətdən əsaslandırmışdır.



## FİKRƏT ƏHMƏD OĞLU RƏHİMLİ

O, 1954-cü ilin 6 yanvarında, uzun illər respublikanın partiya, sovet orqanlarında məsul işçi, müharibənin ağır illərində Şəkidə, sonra Bakıda, Xaçmazda rayon partiya komitələrinin birinci katibi, Maarif Nazirinin birinci müavini, Dövlət Nəzarət komitəsində şöbə müdiri, Bakı Yerli Sənaye Texnikumunun direktoru vəzifələrində işləmiş görkəmli ictimai -siyasi xadim, gözəl insan Əhməd Rəhimlinin ailəsində Bakı şəhərində anadan olub. Bakı şəhərindəki 1 saylı orta məktəbi(1971) bitirib. Müsabiqə yolu ilə həmin il M.V. Lomonosov adına Moskva Dövlət Universitetinin iqtisadiyyat fakültəsinə qəbul olub. Buranı müvəffəqiyyətlə bitirdikdən sonra 1976-cı ildə təyinatla Azərbaycan Respublikası Dövlət Plan Komitəsi yanında Elmi Tədqiqat İqtisadiyyat İnstitutunda elmi işçi vəzifəsində işləyib. 1978-ci ildə Moskva şəhərində SSRİ Dövlət Plan Komitəsinin İqtisadiyyat İnstitutunun aspiranturasının əyani şöbəsinə qəbul olunub və 1981-ci ildə iqtisad elmləri doktoru Aleksandr Nikolayeviç Sıqirkonun rəhbərliyi ilə ***«İntensivləşdirmə və istehsalın səmərəliliyinin artırılmasının planlaşdırılması»*** mövzusunda dissertasiyasını müdafiə edərək iqtisad elmləri namizədi alimlik dərəcəsini alıb. Gənc alim yenidən vətənə qayıdıb. Bakı şəhərinin iqtisadi və sosial inkişafı üzrə sahə elmi laboratoriyası sənaye şöbəsinin müdiri vəzifəsində çalışıb(1982-1986). 1986-cı ildə Bakı Ali Partiya Məktəbinin siyasi iqtisad kafedrasında müəllim, iki illik əyani bölmənin dekanı(1989-1991), 1991-ci ildən BSİPİ-nin

dekanı, tədris və elmi işlər üzrə prorektor vəzifələrində işləyib. Dos. F. Rəhimli 1999-cu ildən Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının «İnzibati idarəetmə» fakültəsinin dekanıdır.

Fikrət müəllim çoxsaylı elmi məqalələrin müəllifidir. Onun Azərbaycanda bazar iqtisadiyyatının formalaşması, xarici ticarətin liberallaşdırılması, keçid dövründə Azərbaycan iqtisadiyyatının dövlət tənzimlənməsi istiqamətləpi və məqsədləri, müstəqillik dövründə Azərbaycanın makroiqtisadi inkişafının təhlili, iqtisadi təhlükəsizlik strategiyasının formalaşması problemlərinə həsr olunmuş məqalələri DİA-nın nəşriyatında və başqa toplularda çap edilmişdir.

Fikrət müəllimin ailəsində hamı ali təhsillidir. Həyat yoldaşı Gülarə xanım görkəmli alim, texnika elmləri doktoru, akademiyanın həqiqi üzvü Kamil Sadıqovun qızıdır, kimya elmləri namizədidir, MEA-nın Kimya institutunda çalışır. Oğlu Kamran DİA-nın «Dövlət və bələdiyyə idarəçiliyi» ixtisası üzrə magistraturanın son kursunda, qızı Elnarə Azərbaycan Beynəlxalq Universitetinin «Maliyyə və kredit» fakültəsinin ikinci kurs tələbəsidir.



# ELDAR HƏSƏNXAN OĞLU AZADOV

Yzsokpas xamtsş Azərbaycan elminə, mədəniyyətinə və incəsənətinə bəxş etdiyi saysız-hesabsız görkəmli şəxsiyyətləri ilə seçilir. Bu rayonun adı çəkiləndə o saat xəyalımda burada dünyaya göz açan, xalqının layiqli övladları kimi vətənini şöhrətləndirən, səmimiliyi, müqəddəsliyi, qayğıkeşliyi ilə yaddaşıma həkk olunan insanlarından Qüdrət müəllimin, Məhəmməd Əsədovun xoş cöhrələri canlanır. Telman Kazımov və Vəli Quliyevlə birgə təhsil aldığım illər yada eüşür.

Zəngilanda adı böyük fəxrlə çəkilən çoxsaylı ziyalılar sırasında Azadovlar nəslinin ağsaqqalı, müharibə veteranı, Həsənxan müəllimin və ömür-gün yoldaşı mərhum Ziba xanımın həyatlarını gənc nəslin təlim-tərbiyəsinə sərf etmələri barə eşitdiyin xoş sözlərin təsirindən uzun müddət ayrıla bilmirsən… Ayaetv Jpeax Ğzüzsıas tdpş bu ailənin yetirməsidir. O, 1954-öh kp 15 kmşsea Yzsokpasea asaeas tprşədur. 1961-70-ök kppzxez Yzsokpas əzğzx txça rznçzbksez çzğükp aprlə, 1971-76-öl kppzxez Ayzxbamöas Euvpzç Şskvjxükçjçkskss çzçbkqk xkmaykmmaç canhpçzüksez çzğükpkrk eavar jçekxrkədir. Uskvjxükçjçk bkçkxeknezs ütsxa Ayzxbamöas Xjüfşbpknaül Jprpzx Anaejrkmaülsls Nkbjxsjçkna Isüçkçşçşsea zrzn czapkmmzçksz baəparlədır.

1978-79-öş kppzxez Pkçva Xjüfşbpknaülsls Euvpzç Fpas Ntrkçzüksks Kqçküaekmmaç Ksüçkçşsea üçainjgrz çzöxhbzüksez tprşə, bir müddət (1980-1983) Jprpzx Anaejrkmaülsls Nkbjxsjçkna Ksüçkçşçşşş, ütsxa küz Rtünva Keaxzjçrz Ksüçkçşçşşş aüfkxasçşxaülsea çzğükpknk eavar

jçekxrkədir. 1993--öh kpdz "Əzğzxks ütükap-kqçküaek ksnkəaclsls fxtqstypaəelxlpraül hghs krkçaükma mtejpksks ğaylxpasraül" ruvyşüşsea eküüjxçaükma kəksk rheackz jezxzn kqçküae jprpzxk sarkyzek apirlkk ezxzözüksz pamkq ouxhprhədür.

1984-88-ök kppzxez Ayzxbamöas Xjüfşbpknaül JA-sls AKÜ əubzüksez, 1998-91-ök kppzxez küz Banl Apk Faxçkma Mznçzbksez rhıçzpkc vzykczpzxez gaplərlədlr. 1991-96-öl kppzxez Banl Ütükap Keaxzjçrz vz Ftpkçtptokma İsüçkçşçşşş "Ütükap keaxzjçrz vz rjsjörjsç" nacjexaülsls zrzneaəl, 1997-99-öş kppzxez bş nacjexasls rhekxk vzykczüksez gaplərlədır. 1998-99-öş kppzxez BÜKFK-sks "Ütükap keaxzjçrz vz ütüktptokma" canhpçzüksks ejnasl vzykczüksk köxa jçrkədir. 1999-öş kpdzn mjsk maxaelprlə Ayzxbamöas Xjüfşbpknaülsls Fxjykejsçk maslsea Euvpzç Keaxzgkpkn Anaejrkmaülsls "Hrşrk vz ıhüşük rjsjörjsç" nacjexaülsls rhekxk vzykczüksez gapləlxar.

Kxk əzğzxpzxks ksnkəacl, xjoktsap keaxzjçrz vz xjoktsap ükmaüzç, xjüfşbpknarly hghs mjnk tpas bzpzekmmz keaxzgkpkmk, rhaükx rjsjörjsç, euvpzç keaxzgkpkmksks üzrzxzpkpkmk fxtbpjrpzxk kpz badpl bkx ülxa jprk çzeqkqaçpaxls rhzppkckdir. Bş üağzez çzeqkqaçpaxlnl eavar jçekxkx. Jvpkdir, həyat yoldaşı Gülşən xanım Azərbaycan dili və ədəbiyyatı müəllimidir. Uvpaelarl - oğlu Mehman DİA-nın magistri, qızı Mətanət BDU-nun «Kimya» fakültəsinin ikinci kurs tələbəsidix.



## ZPZEEKS NAYLR TDPŞ BZEZPTV

T, 1951-ök kp kmşs amlsls 17-ez Qzekr Btxgapl rağaplsls kseknk Ohxöhüças Xjüfşbpknaülsls chühsnax çzbkzrpk xamtspaxlseas üamlpas Qaxeabask əzğzxrsez rhzppkr akpzüksez asaeas tprşə, şəaqplq vz rznçzb kppzxksk bşxaea njgkxrkə, 1967-ök kpez 2-üampl Qaxeabask əzğzx txça rznçzbksk zpa qkmrzt-pzxpz bkrkxrkəekx.

1968-ök kpez Ü.R. Nkxtv aelsa Ayzxbamöas Euvpzç Şskvjxükçjçksks rjıaskna-xkmaykmmaç canhpçzüksz eaıkp tprşə vz 1973-öh kpez ğzrks şskvjxükçjçks “Çzçbkqk xkmaykmmaç“ canhpçzüksks kpn rzyşsş nkrk txasl zpa vz maıəl qkmrzçpzxpz baəa vşxrşədur. Şskvjxükçjçk bkçkxeknezs ütsxa çzmksaç hyxz Ayzxbamöas Xjüfşbpknaülsls Jprpzx Anaejrkmaülsls Nkbjxsjçkna Küçkçşçşsa kəz ousezxkprkədir.

1973-1991-ök kppzxez Jprpzx Anaejrkmaülsls Avçtraçpaəelxlprlə Keaxzjçrz Üküçjrpzxk əubzüksez jprk czapkmmzçz baəpamaxaq baə pabtxasç vzykczüksezs pabtxaçtxkma rhekxk vzykczüksz qzezx kxzpk gznkprkədir.

1975-ök kpez Nkbjxsjçkna Ksüçkçşçşsea “Kqçküaek-xkmayk hüşppax“ –08.00.13 kıçküaül hyxz, küçjğüapaçeas amxlpraeas, aüfkxasçşxama eaıkp tprşə vz 1981-ök kpez Nkbjxsjçkna Ksüçkçşçşsşs kıçküaüpaərlə Jprk Əşxaülsea kqçküae jprpzxk etnçtxş, fxtcjüütx Qtxıray Krastvşs xzğbzxpkmk kpz “Xjüfşbpknasls üzsamjüksks çzğpkpk vz fxtqstypaəelxraül hghs krkçaükma rtejppzxk üküçjrk“ ruvyşüşsea eküüjxçaükma kəksk rhvzcczqkmmzçpz rheackz jezxzn kqçküae jprpzxk sarkyzek, apkrpkn ezxzözük aprlədır.

1985-1990-ök kppzxez Nkbjxsjçkna Ksüçkçşçşsea, ütsxanl kppzxez küz Euvpzç Fpas Ntrkçzüksks szyekseznk Jprk-Tzeqkqaç Kqçküaekmmaç Ksüçkçşçşsea jprpzx sarkyzepzxksks rheackzük hghs “Kqçküaek-xkmayk hüşppax“ -08.00.13 kıçküaül hyxz maxaelprlə kıçküaüpaərlə əşxasls hyvh tprşəar.

1991-ök kpezs fjeaqtik czapkmmzçz baəpamaxaq Banl Ütükap Keaxzjçrz vz Ftpkçtptokma ksüçkçşçşsşs “Ütükap keaxzjçrz“ nacjexaülsea baə rhzppkr, ütsxa etüjsç vzykczüksez kəpzyib.

1994-öh kpez küz ğzrks ksüçkçşçea mjsk maxaelprlə “Çzçbkqk xkmaykmmaç vz ksctxraçkna“ nacjexaülsa rhekx üjgkprkb.

1999-öş kpez Ayzxbamöas Xjüfşbpknaülsls Fxjykejsçksks czxraslsa züaüzs Banl Ütükap Keaxzjçrz vz Ftpkçtptokma İsüçkçşçşsşs züaülsea Ayzxbamöas Xjüfşbpknaülsls Fxjykejsçk maslsea Euvpzç Keaxzgkpkn Anaejrkmaül maxaelpraül kpz zpaqzeax tpaxaq mjsk maxaelprlə Anaejrkmaea “Euvpzç keaxzgkpkmksez ntrfhçjx çjıstptokmapaxl “ nacjexaülsa rhekx çzmks jekpkb.

20-ezs gtı jprk züzxpzxks rhzppkckdir. 1995-1997-ök kpez apk rznçzb çzpzbzpzxk hghs “Tmşspax szyzxkmmzük“ nşxüşsşs ezxü vzüakçk vz çzexkü fxtqxarlsl, “Zrzpkmmaçpaxls çzeqkqk“ nşxüş hyxz rjçtekn vzüakç ğaylxpamlb szəx jçekxkb.

2002-ök kpezs Ayzxbamöas Euvpzç Kqçküae Şskvjükçjçksez czapkmmzç ouüçzxzs, Kqçküae jprpzxk sarkyzepzxksks rheackzük hghs maxaelprlə N.054.09.02 kıçküaüpaərlə Jprk Əşxasls hyvhdür. Ts sarkyzepkn eküüjxçaükmasının müdafiəsində tfftsjsçpkn jçrkədir.

Ğap-ğaylxea ütükap-kqçküaek fxtüjüpzxks keaxz jekprzüksez kqçküaek-xkmayk hüşppaxls çzçbkqk küçkqarzçksez jprk axaəelxrapax hzzrində çalışır.

Akpzpkdi, Hg uvpael vz Öavke aepl bkx szvzsi vax.

Ğzmaç mtpeaəl, Qlylpohp xanlm txça rznçzbez “Ötdxackma” czssk hyxz rhzppkrzekx.

Tdpş Asax Qzxb Şskvjxükçjçksks “Rhğzsekü kqçküaekmmaçl vz keaxzjçrz” kıçküaülsl bkçkxrkəekx.

Qlyl Amsşx Ayzxbamöas Xjüfşbpknaülsls Pxjykejsçk maslsea Euvpzç Keaxzgkpkn Anaejrkmaülsls maoküçxaçşxaülsls “Euvpzç vz Bzpzekmmz keaxzjçrzük” kıçküaülsl bkçkxrkəekx.

Kiçik qlyl Ohsam Ayzxbamöas Euvpzç Çkbb Şskvjxükçjçksks “Fjekaçxkma” canhpçzüksks V nşxüşsea çzğükpksk eavar jçekxkx.

## MUSA NİZAM OĞLU QULUZADƏ



Onun ***imzasına «Pioner», «Göyərçin», «Azərbaycan pioneri», «Ulduz»*** jurnallarında dərc olunan hekayə, povest və pyeslərindən tanısam. ***«Gənclik»*** və digər nəşriyyatlarda çapdan buraxılan ***«Püstə», «Onu hamı görmək istəyir», «Meşədən səs gəlir», «Ötən günlərin sorağında», «Mərhəmətli və şəfqətli qəlb», «Uzaqdan gələn səslər»*** hekayə və povestləri ni oxusam da, şəxsən manış deyildik. 1990-cı ilin ortalarında xidməti işlə əlaqədar olaraq Şuşadan Bakıya gəlmişdim. Arada vaxt tapıb Dövlət muzeyində çalışan dostum Qadir İsmayılzadənin görüşünə getdim. O, məni iş yoldaşlarına təqdim edib, əvvəlcə Qarabağdakı real vəziyyət barədə danışmağımı, sonra isə Alqayıddan şerlər söyləməyimi xahiş etdi. Vaxtilə rəhbər vəzifələrdə işləmiş bu adamların qarşısında danışmaq çətin gəlsə də, Aslan müəllimin təhriki ilə baş verən hadisələr haqqında yığcam danışdım, Ələsgərdən, Səməd Vurğundan, Növrəs İmandan, Bəhməndən və başqalarından şerlər söylədim. Axırda da Musa müəllim öz yaradıcılığından deyil, Mirzə Ələkbər Sabirin satiralarından bir neçə nümunəni dedi... Qadir müəllim həmin gün bizi şam yeməyinə dəvət etdi və gözləyəcəyəm, birdən gəməzsiniz,-dedi. O vaxtdan aramızda yaran səmimi münasibət zaman keçdikcə dostluqa çevrildi. Şuşa əhalisinin taleyinə köçkünlük «qismət» olanda BSİPİ-nin ozamanlar «Mədəniyyətşünaslıq» kafedrasının müdiri, hazırda DİA-nın prorektoru vəzifəsində işləyən professor Əlikram Abdullayev məni rus bölməsinin tələbələrinə Azərbaycan

dili fənni üzrə müəllim işləməyə dəvət etdi. İş elə gətirdi ki, Musa müəllimlə bir kollektivdə işləməli olduq…

Musa Quluzadə 1939-cu il mayın 20-də Masallı rayonunun Xıl kəndində anadan olmuşdur. Burada 7 illik məktəbi bitirdikdən sonra Lənkəran kənd təsərrüfatı texnikumunda təhsilini davm etdirib. Azərbaycan Dövlət Universitetinin iqtisad fakültəsini bitirib(1960-1966). Bakının Əzizbəyov rayonundakı kurort ticarəti idarəsində əmək fəaliyyətinə başlayıb(1966-1971). Mərkəzi Dövlət muzeyində direktorun elmi işlər üzrə müavini vəzifəsində çalışıb(1971-1991),eyni zamanda universitetdə tarixdən mühazirələr oxuyub. Görkəmli alim, professor S. Qəndilovun rəhbərliyi ilə 1978-ci ildə namizədlik dissertasiyası müdafiə edib, tarix elmləri namizədidir**.**

Musa müəllim hazırda Azərbaycan Respublikasının Prezidenti yanında DİA aspirantura-doktorantura şöbəsinin müdirdir. Kollektivdə, tələbələr arasında böyük hörmət və nüfuzu vardır. Akademiyanın ictimai həyatında fəal iştirak edir. Bədii yaradıcılıq və elmi tədqiqat sahəsində çoxsaylı yazıları jurnallarda, almanaxlarda, ayrıca monoqrafiya şəklində çap olunub. Onun son illərdə ***«Azərbaycanda dövlət və dir münasibətləri»*** kitabı**,** ***«Dünya yaxşılarındır***» povesti işıq üzü görmüş, oxucuların marağına səbəb olmuşdur.

**ORUC CƏMİL OĞLU MƏMMƏDOV**



Oruc Məmmədov 1971-ci il noyabr ayının 15-də Cəbrayıl rayonunun Qərar kəndində anadan olub. 1994-cü ildə N.Tusi adına Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarix(əlavə hüquq) fakültəsini bitirib.1994-96-cı illərdə Cəbrayıl rayon Məhkəməsində, Kürdəmir rayonundakı Carlı kənd orta məktəbində işləyib.

Oruc müəllim 1996-1997-ci illərdə respublikanın müxtəlif ali məktəblərində çalışıb. 1997-ci ilin sentiyabrından “Naxçıvan” Universitetinin “İctimai-siyasi və hüquq elmləri” kafedrasında dosent, tədris hissəsində baş inspektor, kimi fəaliyyət göstərib. 2000-ci ilin avqustundan Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasında tədris prosesinin təşkili və tənzimlənməsi üzrə baş mütəxəssis, “Azərbaycan Dövlətçiliyi və ictimai-siyasi hərəkatlar tarixi ” kafedrasında müəllim vəzifəsində çalışır. “Dövlət idarəçiliyinin hüquqi təminatı” kafedrasının dissertantıdır. Mətbuatda şer və publisistik yazıları dərc olunun, “Payız yelləri” şerlər kitabının müəllifidir.

## ƏDALƏT GÖYÇƏDƏ VƏ ŞUŞADA

Hələ orta məktəbdə oxuyurdum. Səs-soraq yayılmışdı ki, Azərbaycanın Gəncəbasar-Qazax zonalarının aşıqları Göyçə mahalında qastrol konsertləri ilə çıxış edəcəklər. Gözəl və bənzərsiz saz havaları ilə dinləyiciləri heyran edən Aşıq Ədalət Nəsibov da bu sənətkarlar arasındadır... Vaxt gəldi, vədə tamamlandı. Aşıq Ədalət öz sənət dostları və bir də sazı-sözü ilə kəndimiz Qoşabulağın əziz qonağı oldu. Kənd klubuna toplaşanların əksəriyyəti yaşlı nəslin nümayəndələri və sənətsevər ziyalılar idi. Həmyaşıdlarım aşıqların konsertini dinləmək arzusunda bulunsalar da, klubdakı tamaşaçı yerlərinin azlığı buna imkan vermirdi. Bir mədəniyyət işçisi olmaq e''tibarı ilə qardaşım Fəxrəddin mənim aşıq mahnılarına maraq göstərdiyimi, arada bir oxuduğumu, zümzümə etdiyimi bilirdi. Buna görə də içəri keçmək, Ədalətin çaldığı qənirsiz saz havalarını, oxuduğu məlahətli mahnıları dinləmək xoşbəxtliyi mənə nəsib oldu...

Uzun illər Ədalətin ölməz şairimiz Səməd Vurğunun kitablarda gördüyüm əksinə bənzəyən görkəmi gözlərimin önündən, ilk dəfə onun ifasında eşitdiyim "Kərəmi", "El havası" qulaqlarımdan getmədi. Bu təəssüratla radio dalğalarını, televiziya ekranlarını izlədim. Hədsiz heyranlıqla Ədalətin sazını dinləyə-dinləyə onun sənətinə də səcdə etdim, özünə də... Saz deyiləndə də, söz deyiləndə də gözlərimin önündə Ədalət canlandı. Ülvi, müqəddəs bir mə''nəvi qüvvəyə çevrildi istəyimdə, diləyimdə Ədalət!.. Tələbəlik həyatının ilk anlarından Aşıq Ədalətin iştirak etdiyi yubiley tədbirlərinə getməyə can atırdım. Bir dəfə tələbə dostlarımdan Tofiq Saleh, Alqayıd Xəlilov, Biləndər Hüseynov, Məhəbbət Qarabağlı, Şota Saleh, Tariyel Qəribli, Kazım Süleymanov, Sərhəd Bünyadov, Mübariz Hüseynov, Tofiq Eyvazov və Akif Qurbanovla birlikdə Elmlər

Akademiyasının əsas binasında Səməd Vurğunun 60 illik yubileyi münasibəti ilə keçirilən ədəbi-bədii gecənin iştirakçısı oldum. Tədbirin sonunda hamımız Ədalətlə görüşdük. Hər birimiz bu görüşdən məmnunluqla ondan ayrıldıq. Yolum Qazaxdan düşdükcə Aşıq Ədalətin şəhərin lap mərkəzində yerləşən əzəmətli evini avtobus gedə-gedə nəzərdən keçirərdim...

1982-ci ilin iyul ayının son günləri idi. Dağlar gözəli Şuşa bayram libasına bürünmüşdü. Şəhər sakinləri Vaqif poeziya bayramının iştirakçılarını, bu tədbirin keçirilməsinin təşəbbüskarını-Azərbaycan ədəbiyyatı və incəsənətinin qayğıkeşi H. Ə. Əliyev cənablarını, respublikanın müxtəlif bölgələrindən gəlmiş qonaqları, görkəmli sənət adamlarını ürəkdən salamlayır, duz-çörəklə qarşılayırdılar. Qazaxdan gələn nümayəndə heyətinin tərkibində Aşıq Ədalətin də olmasını təqdir edənlər Azərbaycan xalqının qəhrəmanlıq himni adlandırılan **”Kərəmi”**nin *«Cıdır düzü»*nə sözsüz yayılacağına ümidvar idilər.

M. P. Vaqifin məqbərəsi önündə poeziya bayramını Azərbaycan Yazıçılar İttifaqı İdarə Hey”ətinin birinci katibi İsmayıl Şıxlı açır, şairlərə növbə ilə söz verilir... Aşıq Ədalət təbii səhnədə görünür. Milli çalğımızın tellərindən qopan melodiyalar təntənəni rövnəqləndirir. Hamıda xoş əhval yaranır. Çalınan saz havalarında aləmə sığmayan başqa bir aləm adamı özünə cəzb edir. Bu havalarda doğma Oğuz yurdunun havası, təbiəti, gözəlliyi, təravəti duyulur. Saz dil açdıqca qönçələr elə bil ki, gül açır, çiçəkləyir. Quşlar göydə qanad saxlayır... Özü sazına, sazı özünə yaraşıq olan Ədalət alqışlar altında müqəddəs duyğuların tərənnümçüsü kimi tamaşaçılarını sevindirir. Vurduğu xallarla əlindəki mizrabı közə döndərə-döndərə dastanlardakı qəhrəmanların sazlı-sözlü dünyasını yaddaşların lent yazısından sanki ətrafa yayır...

Vaqif poeziya bayramını “Qarabağ” mehmanxanasının beşinci mərtəbəsində davam etdiririk. Ədalətin xahişi və sazının müşaiyəti ilə Hüseyn Arif “Yolda” poemasından “Vaqiflə söhbət” adlanan hissəni bu yığcam məclisə ərmağan edir:

*Aradım yaxını, gəzdim uzağı,*
*Yönüm gah arana, gah dağa düşdü.*
*Çiçək mövsümündə bir axşam çağı*
*Yolum Qarabağdan Qazağa düşdü.*

*Sabir küçəsiylə yuxarı qalxdım,*
*Nəsə,qulağıma deyirdi şəhər...*
*Qaşları çatılan Vaqifə baxdım,*
*Aldı qanadına məni fikirlər.*

*Canlı bir insan tək danışdı heykəl:*
*— Qaçma qabağından sual-sorğunun.*
*Vaqif xəbər aldı,hər şeydən əvvəl,*
*Bəs hanı dastanı Səməd Vurğunun...*

Əli Mahmud, Abbas Abdulla yeni yazdıqları şe''rləri ilə məclisi şənləndirirlər. Aşıq Ədalət isə öz aləmində, söz aləmindədir. Gah zildə, gah da bəmdə aşıq havalarının çələngini yaradır. Qazax rayon mədəniyyət şö''bəsinin müdiri Bayram Qurbanov Aşıq Ədalətin Vaqifə həsr etdiyi şe''rlərindən "Vaqifi" havası üstündə oxumasını xahiş edir. O, bir qədər əlini sazın şah pərdəsində saxlayaraq:

— Ayə, dərdin alım, dünəndən bəri hamı Vaqifdən oxumurmu?!.. İzdiham gözümün önündən bir an belə çəkilmir. Altmışıncı illərin axırlarında şairn qəbrini ziyarətə gəlmişdim. Şəhərin görməli yerləri ilə tanışlığım az da olsa var. Xeyli dəyişiklik hiss olunur. Vaqifin vaxti ilə yaşadığı evin yerində xatirə kompleksi yaradılıb, möhtəşəm türbəsi ucaldılıb. Vaqif ölməzdir, Vaqif həmişə yaşardır. Onun adı dan ulduzu kimi saz-söz, sənət zirvəsini tarixlər boyu şö''ləlləndirəcəkdir. M. P. Vaqifin dünya ədəbiyyatı xəzinəsinə verdiyi incilər bu gün də öz bədii dəyərini qoruyub saxlayır...

Hüseyin Arif Vaqifin məqbərəsinin tikintisinin plana salınması ilə bağlı maraqlı söhbət etdi və bu işdə tanınmış ictimai xadim Qəşəm Aslanovun göstərdiyi sə”yləri vurğuladı. Şuşada son illər aparılan quruculuq, abadlıq, yaşıllaşdırma işlərinin geniş vüs”ət alması nın ilk təşəbbüsçüsü olduğunu, ədəbiyyata, incəsənətə böyük qayğı göstərdiyini hədsiz fərəh hissi ilə danışdı və onun bu tədbirlərdə iştirak etmədiyinə təəssüfləndi... Gecə saat dörd idi. Aşıq Ədalət “Müxəmməs”lə məclisimizi yekunlaşdırdı... Ömrümün Ədalətlə keçirdiyim bir günü də beləcə unudulmaz oldu. Şair dostum Zəlimxan Yaqub demişkən, ”Bir məclisdə Ədaləti dinlədim!” Bu da böyük bir bayramdan yaddaqalan əvəzsiz xatirədir:

*...Söhbətini baxış dedi,göz dedi,*
*Tahir yenə Zöhrəsinə döz, dedi.*
*Vaqif coşdu,gözəllərə söz dedi.*
*Dönə-dönə məhəbbəti dinlədim,*
*Bir məclisdə Ədaləti dinlədim!*

*Zili,bəmi bir-birindən təzə-tər,*
*Səs-sorağı gəldi - Vaqif ,Ələsgər!*
*Min nəfərə layla çaldı bir nəfər,*
*Ölməz olan bir sənəti dinlədim,*
*Bir məclisdə Ədaləti dinlədim!..*

Aşıq Ədalətin sazı da, sözü də, özü də, xalqımıza əzizdir. Qoşma deyəndə M. P. Vaqif ..., saz deyəndə Ədalət Nəsibov yada düşür.

“Sazın Ədalət dünyası”, Bakı,Azərnəşr, 1999.

***"...Bütünlükdə ölkə, xalq miqyasında qaçqınlıq böyük dərddir. Köçkünlük,didərginlik milli müsibətdir. Amma daha böyük fəlakət onda baş verir ki, şəhidə və qurbana təbiət özü çevrilir, torpağın folklor qatı və örtüyü əsir düşür, talana və hərraca Qorqudun qopuzu, Ələsgərin qəbri, Vaqifin məqbərəsi mə"ruz qalır. Natəvanın qələmi Şuşadan, Şəmşirin sazı Kəlbəcərdən qaçaq düşür. Mərmi Füzulinin qəzəlinə, güllə Qarabağın şikəstəsinə dəyir"...***

*YAŞAR QARAYEV.*

Respublikamız öz müstəqilliyini möhkəmləndirdiyi son illər ərzində milli və mə"nəvi dəyərlərimizin toplanılıb xalqa kitablar, toplular şəklində ərmağan edilməsi sahəsində Azərbaycan Elmilər Akademiyası Nizami adına Ədəbiyyat İnstitutunun şö"bələrinin və Folklor Elmi-Mədəni Mərkəzinin yaradıcı əməkdaşları tərəfindən çox böyük, ardıcıl, sistemli və məqsədyönlü işlər görülür. İtirilmiş və hazıda düşmən tapdağında inləyən qədim oğuz ellərinin folklor nümunələrinin yaşlı nəslin yaddaşlarından yazıya alınıb, geniş oxucu kütləsinin mütaliəsinə təqdim edilməsi istiqamətidə atılan hər bir addım təqdirəlayiq hadisə kimi diqqəti özünə cəlb edir.

Türk dünyasının ən qədim saz-söz diyarlarından,şe"r-sənət ocaqlarından olan ulu Göyçənin poetik cəhətdən zəngin və təkrarsız folklor nümunələrinin bu yaxınlarda "Səda" nəşriyyatında çapdan buraxılan "Azərbaycan folkloru antologiyası"nın üçüncü kitabı Folklor Mərkəzinin 2000-ci ildə folklorsevərlərə yeni və ən gözəl bahar töhfələrindəndir.

Antologiyanı toplayıb, ərsəyə gətirən və ön sözün müəllifi tədqiqatçı alim Hüseyn İsmayılov, elmi redaktoru Azərbaycan Yazıçılar Birliyinin üzvü, Dövlət mükafatı laureatı,Əməkdar elm

xadimi,görkəmli tənqidçi-ədəbiyyatşünas, elm təşkilatçısı, Nizami adına Ədəbiyyat İnstitutunun direktoru, filologiya elmləri doktoru, professor Yaşar Qarayevdir. Rə”yçiləri isə tanınmış folklorşünas alimlər, filologiya elmləri doktorları, prof.Mürsəl Həkimov, prof. Qara Namazov və filologiya elmləri namizədi Oruc Əliyevdir. Nəşrə məs”ul isə filologiya elmləri namizədi Əziz Ələkbərlidir.

Redaktorun antologiyada “Göyçəyə qayıdan yol folklordan keçir...” başlığı altında oxuculara çatdırmaq istədiyi fikirləri, kitabın elmi-bədii, mə”nəvi dəyəri barədə gətirdiyi tarixi faktlar, son yüzilliklərdə milli inzibati ərazimizlə birlikdə folklor bölgələrimizin itirildiyini, hüquqi-siyasi xəritəmizdən kənarda qaldığını, lakin mədəniyyətimizin ayrılmaz tərkib hissəsi kimi həmişə diqqət mərkəzində olduğunu vurğulaması, “didərgin və qərib folklor” silsiləsindən çapa hazırlanan kitabların işıq üzü görməsi üçün imkanlı iş adamlarının milli vicdan, təəssübkeşlik baxımından görmək istəyəcəkləri işin “ciddi elmi-siyasi və sosial-vətəndaşlıq xidməti demək” olduğunu yada salması ziyalı, alim, tədqiqatçı, vətəndaş narahatçılığıdır.

“Göyçə folkloru” antologiyasında Göyçədə Oğuz Xaqanın Qopuzundan yayılan səsin Hüseyin İsmayılın kitaba köçürməsini, Orhunda Yoluq Tiqin Bilgə Xaqanın səsini kitabəyə köçürməsini eyni səciyyədə qiymətləndirən redaktor, qədimdəki bütün xeyirxah mifik qüvvələrin hamilik gücünü indiki köçkün göyçəlilərin xeyrinə səfərbər etməkdə Folklor Mərkəzinin rəhbərliyinin əvəzsiz xidmətlərini də yüksək dəyərləndirir.

Antologiyada 34 mifoloji nağıl və rəvayət, 5 mövsüm və mərasim nəğmələri, 35 əfsanə, 16 rəvayət, 18 nağıl, 4 dastan, 92 lətifə, 10 sicilləmə, 49 oyun, çoxsaylı alqış, xalq mahnıları, beşik nəğmələri, atalar sözü və məsəllər, türkəçarələr, bayatılar, ağılar, yanıltmacalar, cırnatmalar, uşaq folkloru və s. öz əksini tapmışdır. Kitabın sonunda bu şifahi xalq ədəbiyyatı — Göyçə folkloru nümunələrini yaddaşında saxlayan, həmçinin yazıya köçürülməsində vətəndaşlıq qayğısı göstərən ağsaqqalların,

ağbirçəklərin, sənçət adamlarının adları, soyadları ünvanları ilə birlikdə verilmişdir.

Tərtibçi bu antologiyada xalq ruhuna, adət-ən”ənələrimizə,bədii-poetik, sosial-psixoloji təfəkkürümüzün, tarixi inkişafımızın tələblərinə cavab verən əxlaq normaları dairəsində ictimai yaşayışımızı tənzimləyən səciyyəvi cəhətlərin ön plana çəkilməsini hər şeydən üstün tutmuşdur. Hafizələrdə yaşayan və əsirlərdən nəsillərə töhfə olan bədii nümunələr necə varsa, elə də verilmiş, hər elin, hər obanın, hər kəndin danışıq tərzi, dialekt və ləhcəsi, dil üslubu əsasən olduğu kimi saxlanılmış, həmçinin bütövləşən Azərbaycan dilinin ədəbi normaları, dilin birliyindən mə”nəvi birliyin, bütövlüyün formalaşdığı nəzərə alınmışdır.

Müəllifin özünün qeyd etdiyi kimi, “Çeşidli coğrafi bölgələrə səpələnmiş eyni köklü, qohum folklor örnəklərinin hamısını eyni vaxtda xas olan ortaq genetik kodun aşkarlanması üçün, onların poetikasının ümumtürk struktur və sisteminin bərpası üçün kitabda toplanmış mifoloji rəvayətlər, inam və görüşlər böyük mə”na və əhəmiyyət kəsb edir”. Antologiyada hami ruhlar, mifoloji varlıqlar haqqında söylənilən bə”zi inamların şamançılıq və tanrıçılıq görüşləri ilə üst-üstə düşdüyü, insanların “tale və bəxt tanrı”sına sığınaraq şər qüvvələrə qalib gəlməsi maraqlı bədii faktlarla əsaslandırılır. Mifik obraz və inamların, qədim folklor mədəniyyətimizin qaynaqları dini-fəlsəfi və elmi-fəlsəfi aspektdən dəyərləndirilir. Bu dəyərlərin mə”na və məzmunca islam aləmi üçün, o cümlədən Azərbaycan üçün, həmçinin onun ayrılmaz ərazilərinedən olan Oğuz yurdu Göyçə üçün də səciyyəviliyi bütün növdən olan folklor nümunələrində qeyd-şərtsiz özünü göstərir.

Göyçənin təbiətindən, flora faunasından, burada yaşayanların xarakterindən, adət-ən”ənələrindən, davranış və düşüncələrindən irəli gələn ümdə cəhətlər öz tə”sirini antologiyada cəmləşdirilən müxtəlif janrlı folklor nümunələrində həm tarixilik, həm də müasirlik baxımından əks etdirir.

Antologiyanın “Dastanlar” bölümünə daxil edilən ***“Misgin Abdal və Sənubər”, “Aşıq Ələsgərnən Mir Məcid Ağanın görüşü”, “Aşıq Alının Türkiyə səfəri”, “Aşıq Ələsgərin Qaraqoyunlu səfəri”*** geniş oxucu ictimaiyyəti üçün yenilikdir. Oxucular ***“Misgin Abdal və Sənubər”*** dastanını oxuyanda həyatı boyu vahid Azərbaycan ideyası ilə yaşayan və bu ideyaya sadiq qalan Misgin Abdal barədə dərin məlumatlanacaqlar: onun görkəmli dövlət xadimi, gözəl şair, xalqın iman gətirdiyi böyük şəxsiyyət olduğu, inanc yerinə çevrildiyi, xəstələrin şəfa, binəsiblərin pənah yeri olan, mö”cüzələri ilə səcdəgaha çevrilən ***“Misgin Abdal ocağı”*** və şəxsən onun özü barədə yaddaşlarda yaşayan rəvayətlərin, maraqlı hadisələrin, ozan sənətindən aşıq sənətinə keçidin ən böyük nümayəndəsi kimi Göyçədə aşıq yaradıcılığının inkişafındakı rolunun nədən ibarət olmasının elmi-bədii təhlilini verəcəklər... Aşıq Alı, Dədə Ələsgər və onların sonrakı davamçılarının dillərdə gəzən dastanlarının məzmunu, mahiyyəti və qayəsi barədə də oxucular,aşıqsevərlər öz fikirlərini söyləyəcəklər.

Ümumiyyətlə, “Göyçə folkloru”nda toplanan folklor nümunələrində ibrətli əxlaqi-mə”nəvi dəyərlərlə zəngin olan süjetlər, şər qüvvələrlə mübarizə aparanlara çətin anda arxa, kömək olan sehirli qüvvələr saysız-hesabsızdır. ***“İndi, çağdaş mə”nəvi, dini, qövmi, siyasi azmanla mübarizədə əsir və şəhid Göyçəyə təkcə göylərin yardımı çətin ki, yetərli olsun”...***

***Torpaqlarımızın erməni işğalında olduğu bir vaxtda aparılan diplomatik danışıqlar, dövlətlər səviyyəsində keçirilən ikitərəfli görüşlərə baxmayaraq, müxalifətə xidmət edən istər xarici və istərsə də daxili mətbuat kütlə arasında çaşqınlıq yaratmaq üçün dəridən-qabıqdan çıxır, hər cür uydurmalardan çəkinmir, respublikada daxili və xarici siyasət sahəsində görülən məqsədyönlü işlərin üstünə kölgə salır, əhalinin diqqətini problemlərin həllindən yayındırırlar. Doğma yurdunun, isti ocağının həsrətində olanlar real***

***imkanlardan deyil, fövqəltəbii qüvvələrdən aman diləyirlər. Ümid torpağın övladında, bahadır qarabağlının, kəlbəcərlinin, laçınlının,vedibasarlının, "göyçəlinin damarlarında axan qanda, ən qədim genetik iksirdədir". Böyük Atatürkün dediyi kimi, "aradığın qüvvət – damarından axan qandadır, damara söykənsən, keçmişi gələcəyə çevirmək bir xəyal olmaya da bilər..."***

Antologiya torpağının, vətəninin, el-obasının qədrini bilənlərin hər birinə ümdə duyğular aşılamaqda, cəsarət, düşmənə nifrət təlqin etməkdə əvəzsiz məxəzdir. Ondan folklorumuzu öyrənənlər bəhrələnməlidir. İtirilən torpaqlara sahib olmaq üçün vətəndaş qeyrəti, vətəndaş yanğısı lazımdır. Tarixi ərazilərimizin - Dərəçiçəyin, Ağababanın, İrəvanın, Zəngibasarın, Vedibasarın, Dərələyəzin, Dağ Borçalının, Qaraqoyunlunun, Zəngəzərun və bu kimi Azərbaycan dilinin leksikasında xüsusi qat təşkil edən toponimlərin, antropotoponimlərin, hidronimlərin, oronimlərin, etnonimlər, etnotoponimlər yaddaşlardan silinməməsi, daim gündəlik məişətimizdə yaşadılması təmin edilməlidir.Gənc nəsli həlli mümkün işlərə istiqamətləndirmək sahəsində ardıcıl, davamlı işlər aparılmalıdır.

«Ekspress» 16 sentyabr 2000-ci il

## «DÜNYA DÖVLƏTLƏRİNİN ƏSAS COĞRAFİ, SİYASİ VƏ İQTİSADİ GÖSTƏRİCİLƏRİ»

Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının faliyyətə başladığı gündən xeyli vaxt keçir. Bu müddətdə ali məktəb həyatının bütün sahələrini əhatə edən əsaslı məsələlərin həyata keçirilməsi istiqamətində nəzərdə tutulan işlərin təşkilinə göstərilən tələbkar və yaradıcı münasibətlər bəhrəsini verməkdədir.

Akademiyanın professor və müəllimlərinin xarici ölkələrdə ezamiyyətdə olması, dünyanın tanınmış ali təhsil ocaqlarının iş təcrübələrinin öyrənilməsi və ikitərəfli əməkdaşlıq səfərləri davam etdirilməkdədir. Həmçinin, idarəçilik məsələlərinin təkmilləşdirilməsi və daha da inkişafında mütərəqqi, həm də yeni sayılan səmərəli metod və iş üsullarının öyrənilməsi, pedaqoji prosesdə yaradıcılıqla tədbiq edilməsi diqqət mərkəzindədir. İşgüzar, elmi-metodik təcrübü mübadilələrinin ön plana çəkilməsi akademiyanın bütün strukturldarının yeni tələblər səviyyəsndə fəaliyyət dairələrnin canlandırılmasına geniş zəmin yaradır. Bu, təkcə tədrisin keyfiyyətinin yaxşılaşdırılması və kadr hazırlığına göstərilən tələbkarlıqla məhdudlaşmır. Kafedralarda müəllimlərin elmi-metodik, elmi-tədqiqat işlərinin köklü şəkldə yaxşılaşdırılması baxımından nəzərdə tutulan tədbirlərn əməli nəticələrinə xüsusi əhəmiyyət verilir. Yeni dərsliklərin , topluların, metodik vəsaitlərin hazırlanması üçün mövcud olan elmi-pedaqoji imkanlardan məqsədəuyğun şəkildə istifadənin zəruriliyi ön plana çəkilir.

Fərəhli haldır ki, son illər ərzində akademiyanın alimlərindən C. Məmmədovun «Mikrodövlətlər» , «Avrasiyanın İslam dövlətləri» (Bakı, 1999), Namiq Axundovun Musa Qasımovla birgə nəşr etdikləri «Azərbaycan və beynəlxalq parlament təşkilatları», C. Məmmədov və S.Rəhimovun « Turizm və onunla əlaqəli spahələrdə işlədilən termin və anlayışların izahlı lüğəti», Ə. İsmayılov və Q. Əlyevin «Heydər Əlyev və milli ləyaqət fəlsəfəsi»

( Bakı, 1998), T. Hüseynova və A. Naxçıvanlının «İctimai-siyasi leksika» və bu kimi kitablar nəşr olunmuşdur. Həmin nəşrlər sırasına akademiyanın «Beynəlxalq münasibətlər və xarici siyasət» kafedrasının professorları - N.A. Axundov və C.A. Məmmədovun «Çaşıoğlu» nəşriyyatında yenicə işıq üzü görmüş «Dünya dövlətlərinin əsas coğrafi, siyasi və iqtisadi göstəriciləri » (Avrasiya dövlətləri) kitabı da daxil olmuşdur.

Kitabın elmi redaktoru Bakı Dövlət Universitetinin «Avropa və Amerika ölkələrinin ən yeni tarixi» kafedrasının professoru, tarix elmləri doktoru M.C. Qasımov, rəyçiləri isə Azərbaycan Dövlət İqtisad Universitetinin professoru, iqtisad elmləri doktoru M.M. Fərzəliyev və H. Ə. Əliyev adına Coğrafiya İnstitutunun baş elmi işçisi E.Q. Mehrəliyevdir.

Kitab «Avropa dövlətləri», «Asiya dövlətləri», «Avrasiyada asılı şəkildə idarə olunan ərazilər», «Avrasiya dövlətlərinin iştirak etdikləri əsas beynəlxalq və regional təşkilatlar barədə qısa məlumat» adlı dörd fəslə ayrılmışdır.

Müstəqil Azərbaycan Respublikasında ilk dəfə işıq üzü görən bu kitab gərgin yaradıcı əməyin bəhrəsi kimi ərsəyə gətirilmişdir. Azərbaycanlı oxucular Avrasiyanın müstəqillik əldə etmiş doxsan dövlətinin hər birinin coğrafi, siyasi, iqtisadi və sosial sahədə ən yeni və mükəmməl informasiyasını birləşdirən 25 sualın yığcam cavabını çox vaxt sərf etmədən öyrənmək imkanına malik olacaqlar. Eyni zamanda, indiyədək nəşr olunan bütün sorğu kitablarından fərqli olaraq, bu dərs vəsaitində insan potensialının inkişafına dair rəqəmlərə xüsusi yer verilmişdir. Avrasiya dövlətlərinin iştirak etdiyi beynəlxalq və regional təşkilatlar, həmçinin onların asılı şəkildə idarə olunan əraziləri barədə həm ümumi. Həm də səciyyəvi məlumatların xarakterizə edilməsinə xüsusi fikir verilmişdir.

Müəlliflər respublikamızdan çox-çox uzaqlarda yerləşən dövlətlər barədə azərbaycanlı oxucuların bilgilərinin sistem şəklində olmadığını nəzərə almaqla, bu sahədəki boşluğun doldurulmasını təmin etmək üçün sorğu-informatik istiqamətli bu

kitabın hazırlanmasını olduqca vacib saymışlar. Azərbaycan vətəndaşlarının dünyanın bütün ölkələri barədə əldə etmək istədikləri ilkin məlumatların çoxsaylı mənbələrini gərgin zehni əmək hesabına vahid istiqamətdə təsbit etməklə beynəlxalq münasibətlər və xarici siyasət sahəsində səriştəli iş aparmaq istəyənlərin səmərəli fəaliyyəti üçün əməli əməli imkan yaratmışlar.

Kitabdan səmərəli istifadə edən hər kəs maraqlandığı dövlətin geosiyasi mövqeyi və qonşuları, əsas təbii sərvətləri, dövlətin rəsmi adı, paytaxtı, əhalisi, ərazisi, sayca böyük xalqları, iri şəhərləri, rəsmi dövlət dili, dindarları, pul vahidi, dövlət quruluşu və inzibati ərazi bölgüsü, dövlət başçısı, ali qanunverici və ali icraedici orqanları, əsas siyasi partiyaları, Azərbaycan Respublikası ilə diplomatik münasibətləri, beynəlxalq və regional təşkilatlarda iştirakı, əsas mətbuat və informasiya vasitələri, insan potensialının inkişaf indeksinə görə dünya dövlətləri arasında reytinqi, orta yaş həddi, yaşlı əhalinin savadlılıq səviyyəsi, daxili məcmu məhsulun real həcmi, ölkəyə qoyulmuş xarici investisiyanın məbləği barədə obyektiv məlumatları az vaxt ərzində müəyyənləşdirə bilər.

Geniş oxucu kütləsi ilə yanaşı, habelə dövlət məmurları, parlament üzvləri, biznesmenlər, beynəlxalq münasibətlər, tarix, iqtisadiyyat, politologiya, siyasi və inzibati idarəetmə fakültələrində təhsil alan bakalavr və magistrlar, həmin ixtisaslardan dərs deyən müəllimlər də istifadə edə bilərlər.

«Azad Azərbaycan» qəzeti 2 may 2001-ci il, № 33 (175)

## «GORANBOY»

.Goranboy sözü və adı mənim körpəlik çağımdan dilimdə əzbər olduğundan doğmadır, əzizdir… Bu sözü kimin dilindən eşidəndə mənim qəlbimdə ona qarşı bir doğmalıq hissi baş

qaldırır, kimliyini , nəçiliyini müəyyənləşdirmədən mehmannəvazlıq, səmimiyyət və hörmət göstərmək istəyirəm.

Goranboy tayı-bərabəri olmayan görkəmli şəxsiyyətlər, alimlər, dahilər, sərkərdələr, qarı düşməni yuvasından perik salan qartallar yurdudur. Bu yurd gözümün önündə yaxın qohumlarımın yaşadığı Dəliməmmədli, Baxçayurd, Ağamalıoğlu, Sarov, Azad, İrəvanlı kəndləri, bir də öz ailəmizin qırxıncı illərdən sonra müvəqqəti sakini olduğumuz Qızılhacılı və bu kəndin Şərqində yerləşən qoyunçuluq fermalarında saxlanılan hürküclü dəvələrdə «Sarı yer» , «Alagöllər» yaylaqlarına köç edən karvanlar canlanır. .. Yaylaqlarda keçirilən məclislərdə aşıqların söylədikləri nağıllar, dastanlar, xüsusən də «Aşıq Ələsgərnən Dəli Alı dastanı » və Dəli Alının şücaətləri barədə aşıqların fikirlərini tamamlayan yaşlıların xatiratları yada düşür. Göyçənin məşhur şəxsiyyətlərindən Məşədi İsanın Dəli Alı ilə dostluğu, erməni pristavının on iki strajniknən Alının yolunu kəsərək tutub Kəvər qalasına salması, İsanın köməyi ilə qaladan xilas olması, bu hadisədən sonra onun dağlara çəkilməsi, yerli hakimiyyət orqanlarına qarşı xalq uğrunda mübarizə aparması, ətrafına 2000 nəfər kənd dəliqanlısını cəmləməsi, uzun illər çar hökuməti ilə mücadilə etməsi,1905-ci il rus inqilabı dövründə dağlardan enməyərək, Gəncədə azərilərə qarşı ermənilərin törətdiyi qırğınların qarşısını alması, erməniləri və onlara havadarlıq edən yüzlərlə rus idarəçisini pələsəng etməsi tarixi fakt kimi adamı keçmişinə qaytarır. Dədə Ələsgərin «Gün kimi aləmi tutubdu adı, İgidlər sultanı, xanı, Dəli Alı!.. » misralarını xatırlayırsan.

Goranboy deyəndə keçmişdə də, indi də düşmənə aman verməyən igidlər, qalalar, qəsrlər, müdafiə istehkamları, türbələr, kurqanlar, məbədlər, mağaralar, çoxsaylı tarixi abidələr barədə tarix kitablarından oxuduqlarımız fikrən yaddaşımızda yeni düşüncə ilə canlanır… Goranboy barədə verilən hər bir məlumat, edilən qeyd və söhöət bu yurdun keçmişi, dünəni və bu günü barədə tarixi yaddaşdır. Bu deyilənlərlə 2000-ci ildə «İsmayıl»

Nəşriyyat – Poliqrafiya Müəssisəsində işıq üzü görən «Goranboy» ensiklopedik topluda daha yaxından tanış olmaq mümküdür. Son illərdə nəşr olunan kitablar içərisində həm tərtibatına, həm məzmununa, həm də mövzu rəngarəngliyinə görə bu kitab ən dəyərlisidir. Bu sanballı kitabın elmi redaktorları akademik B. Budaqov, tarix elmləri doktoru Q. Qeybullayev və S. Nəzərlidir.

Oxucular tərəfindən «Goranboy Ensiklopediyas»ı kimi qəbul olunan bu toplu elmi-bədii dəyərinə, yazılış üslubuna, struktur quruluşuna, anlaşıqlı dilinə və forma etibarı ilə yeniliyinə görə daha çox maraq doğurur. Bu kitaba respublikamızın görkəmli ziyalıları tərəfindən verilən rəylər, edilən məsləhətlər son dərəcədə zəngin, eyni zamanda əvəzsiz bir əsərin ərsəyə gəlməsinə mənəvi zəmin rolunu oynamışdı.

Toplunun müəllifi Azərbaycan Jurnalistlər Birliyinin üzvü, qənirsiz qələm sahibi Vəsimə İsmayılqızı doğma rayonu, Azərbaycanın qədim yaşayış məskənlərindən olan Goranboyun tarixi keçmişinə dair ayrı-ayrı müəlliflərin müxtəlif mənbəələrdə əksini tapan fikir və mülahizələrini elmi cəhətdən saf-çürük etmiş, özünün bütün şüurlu fəaliyyətini bu möhtəşəm işə həsr etməklə çoxsaylı üzvləri olan səlahiyyətli bir redaksiya heyətinin görə biləcəyi nəcib və vacib bir işin öhdəsindən təkbaşına gəlmişdi. Nəticədə Goranboyun tarixi, fiziki, iqtisadi və sosial coğrafiyası, yaşayış məntəqələri, toponimləri, qədim memarlıq abidələri, etnoqrafiyası, əlamətdar hadisələri, görkəmli şəxsiyyətləri barədə arxivlərdən, yaddaşlardan qələmə aldığı və kitab şəklində formalaşdırdığı esiklopedik toplunu Azərbaycan ictimaiyyətinə , həmçinin həmyerlilərinə və soydaşlarına ərmağan eyləmişdi.

Kitabın ön sözünün müəllifi hörmətli akademikimiz Budaq Budaqovun goranboyluların ünvanına yazdığı səmimi sözlər oxucu xəyalını tarixi keçmişimizi səhifələməyə, bir tərəfi Murovdağ yaylağından, Gülüsandan Arrana sarı süzülüb gələn təmiz hava mənbəyindən mənsəbinə doğru axaraq, çaylara qovuşan sısqa bulaqların şəffaf suyu, uzaqdan rəssam tablosu

kimi göz oxşayan ecazkar təbiət mənzərələri, əkilib-becərilən torpaqlarımızın təravəti sanki duyan könülləri vəcdə gəlməyə sövq edir. Göz önündə dayanan yaşıl yamaclara yayılıb otlayan qoyun sürüləri, kişnərtisindən min bir zövq alınan at ilxıları, bol bəhrəli meyvə bağları, tarlalarda əmək ahəngini saxlayan cüt-kotan səsi və bir də insanlığın təbii dəyərlərini özlərində ehtiva edən məsum, igid, mərd, cəsur, müdrik el ağsaqqalları, işgüzar, qonaqpərvər, adət-ənənələri əsirlərdən nəsillərə mənəvi sərvət kimi töhfə edərək qoruyub saxlayan zəhmət adamları səni salamlayır. İstər-istəməz tarixi keçmişimizin müxtəlif məqamlarında ictimai-siyasi səbəblərdən Azərbaycan dövlətinin uzaq və yaxın qonşularının onun əzəli torpaqlarının başına açdığı oyunlar, dədə-baba yurdumuzda böyük dövlətlərin yaranması, bu dövlətlərin zəiflədilərək xanlıqlara parçalanması, yüzilliklər ərzində baş verənləri bir an içərisində sinema pərdəsi kimi göz önündən keçirirsən. Kitab toplunun səhifələrindəki bir-birindən oxunaqlığı, elmi-tarixi nöqteyi-nəzərdən maraq doğuran faktların ardıcıllığını izləyirsən. « Buraya daxil olan materiallar zaman və məkan daxilində bu bərəkətli torpağa xışımlarla səpilmiş almaz danələridir. Həm torpağın altına (arxeoloji qazıntılar ) və həm də üstünə (tarixi materiallar) səpilmiş bu almaz danələrini bir-bir dənləyib, hər birini ayrı-ayrılıqda cilalayıb brilyanta çevirmək üçün dərin və universal biliklə yanaşı, çox böyük səbrə də malik olmaq lazımdı. Dolu səbr kasalı Vəsimə xanım doğulduğu torpağa sadiqdir, həmyerlilərinin sevinc və məhəbbəti onun ürəyinin başındadır. Ana torpağı ilə nəfəs alan bu gənc xanım doğma Azərbaycanımızın bir guşəsinə öz bilik və bacarığını sərf etmiş, nəticədə iri həcmli, dərin məzmunlu bir əsərin yaranmasına səbəb olub » - deyən ön söz müəllifinin bu kitabı «Goranboy ensiklopediyası» -- diyarşünaslıq adlandırması çox yerində işlədilmişdir.

Kitab-toplu beş fəsildən və on bölmədən ibarətdir. Birinci fəsil «Goranboy: tarixi-coğrafi , iqtisadi oçerk» adlanır. Burada adı çəkilən rayonun təbiəti, əhalisi, təsərrüfatı, mədəni quruculuğu və

bu sadalanan məsələlərlə bağlı görülən işlər öz əksini tapmışdı. «Yaşayış məskənləri» adlanan ikinci fəslində doxsan yaşayış məntəqəsi: kənd, şəhər tipli qəsəbə və şəhər haqqında məlumat verilmişdi. Üçüncü fəsil «Coğrafi adlar»a, dördüncü fəsil «Qədim abidələr və mühüm tarixi hadisələr»ə, beşinci fəsil «Görkəmli şəxsiyyətlər»ə həsr olunmuş və burada «Tanınmış nəsillər, bəylər, kəndli hərəkatı nümayəndələri», «Müharibə və əmək qəhrəmanları», «Dövlət xadimləri», «Ədəbiyyat və incəsənət xadimləri», «Maarif, səhiyyə və hüquq mühafizə işçiləri», «Müxtəlif sənət sahibləri», «Şəhidlər», «İtkinlər», «Əlillər» adlı on bölmə öz əksini tapmışdı.

Kitabın fəsilləri haqqında ayrılıqda izahat verilməsinə zərurət vardır. Lakin uzunçuluq da oxucu marağını azalda bilər. Bir oxucu kimi ürəyimdən keçəni qeyd etməyi zəruri sayıram: «Goranboy» ensiklopediyası bitkin bir elmi-tədqiqat əsəridir, bu əsər elmlər doktoru dissertasiyasına bərabər tutulan və ondan da üstün uğurlu bir elmi araşdırmadır. Azərbaycanın elm adamları, şübhəsiz ki, bu əsərə öz müsbət münasibətlərini bildirəcəklər.

«Ekspress» qəzeti , 5 fevral № 24(948) və «Azad Azərbayjan » qəzeti 6 fevral № 9 (251) 2002-ci il tarixli sayları.

.

## İNSANA ÜZ TUTANDA

Yazıçı-publisist, filologiya elmləri namizədi İsmayıl Vəliyevin keçən il “Günəş” nəşriyyatında çapdan buraxılmış Ədəbiyyatda insan konsepsiyası: tarixi təşəkkülü və inkişaf mərhələləri” monoqrafiyasında bədii ədəbiyyatda insan problemindən, insan həyatı ilə bağlı müxtəlif dövrlərdə, ayrı-ayrı tarixi mərhələlərdə formalaşan estetik-etik prinsiplərdən və müxtəlif konsepsiyalardan söhbət açılır. Müəllif apardığı elmi ümumiləşdirmələri zəngin bədii-tarixi materialları tədqiqata cəlb etməklə, insanın mahiyyəti, onun təbiəti və mövcudluğu haqqında fəlsəfi və bədii fikirlərdə öz əksini tapan konsepsiyalara nəzər

salır, insan probleminin təşəkkülü və inkişaf mərhələləri barədə oxucuda geniş təsəvvür yaratmağa nail olur. Həmçinin, Azərbaycan ədəbiyyatının bəşəri dəyərləri özündə ehtiva edən bədii əsərləri əsasında insan probleminin elmi-fəlsəfi analizini verir.

İnsanın və onun dünyada mövqeyinin anlaşılmasında tarixin müxtəlif dövrlərində mövcud olmuş dəyərlər sistemi və həyati mahiyyəti haqqında təsəvvürlər monoqrafiyada elmi-bədii cəhətdən öz əksini tapır. Burada insan amilinin təkamülünün izlənilməsi və konkret nəticələrə gəlinməsi, ictimai inkişafın gedişi, həyatın gündən-günə yeniləşməsi, iqtisadiyyatın elmi-texniki amillər hesabına sür'ətlə yenidən qurulması, bədii sənətin həyata nüfuzu, mə'nəvi mühitin zənginləşməsinin müasir məsələləri və problemləri diqqəti xüsusilə cəlb edir. Bu təsəvvürlərə görə insan təbiətə qarşı durur və onun vəzifəsi təbiəti dəyişdirmək, onu özünə tabe etməkdən ibarətdir. Ən'ənəvi cəmiyyətlərdə, əsasən, insanın mövcud olduğu şəraitə uyğunlaşması, təbiəti seyr etməsi təsəvvürü vardır. Bundan fərqli olaraq sənaye, xüsusən də informasiya cəmiyyətində insanın fəaliyyətinin əsas məqsədi obyektlərin dəyişdirilməsi və onların insanlara tabe edilməsinə yönəldilmiş bir proses kimi anlaşılmalıdır.

İnsan fəlsəfi fikrin və bədii yaradıcılığın əbədi mövzusudur. "Fəlsəfənin vəzifəsi insanı insan etməkdən ibarətdir" — deyən İmanuli Kantın fikri, fikrimizcə ədəbiyyata da aid edilə bilər. İ.Kant deyirdi ki, insan özünü dərk etmək üçün aşağıdakı üç suala cavab tapmalıdır: — "Mən nəyi bilə bilərəm?", "Mən nə edə bilərəm?", "Mən nəyə ümid edə bilərəm?" Ədəbiyyatda da, bədii yaradıcılıqda da sənətkarlar bu suallara cavab axtarışındadır.

Fəlsəfə və bədii yaradıcılıq təkcə kerçəkliyin inikasından ibarət olmayıb, yeni reallıqların, o cümlədən sosial reallıqların müxtəlif modellərini yaradır, ideal insan obrazları yaradır.

Məsələyə bu mövqedən yanaşan müəllif, kitabda Şərq və Qərb fəlsəfəsində insana yanaşmalardakı ümumi cəhətlərlə

bərabər, həm Şərqin, həm də Qərbin bu sahədəki spesifikliyini, özünəməxsusluğunu nəzərə almaqla Azərbaycan fəlsəfi fikrinin, bədii təfəkkürünün incəliklərinə diqqət yetirərək onların elmi təhlilini verir.

Monoqrafiyanın girişində müəllif oxucunun diqqətini müasir tarixi şəraitdə insanın həyatdakı fəaliyyəti, bədii obrazı, mürəkkəb və gözlənilməz hadisələrlə müşayiət olunan çağdaş gerçəklikdə insanın həyatla qarşılıqlı əlaqələri, insanın sənətə və sənətin insana münasibətlərinin araşdırılması, şəxsiyyətin təkamülü, ideoloji-tərbiyəvi prosesdə onun rolunun, habelə çoxsahəli tipoloji xüsusiyyətlərinin öyrənilməsi məsələlərinə yönəldilir. Sənətdə insan probleminin öyrəniləməsinin inkişafını cəmiyyətdə inkişaf prosesinin dini fəlsəfi görüşlərlə, ictimai quruluşların, siyasi-ideoloji baxışların bir-birinə zidd və oxşar cəhətləri baxımından insana münasibətlərin mürəkkəb və fərqli sisteminin formalaşdırıldığı barədə oxucuda aydın təsəvvür yaradır.

İnsanın fərdi və ictimai xüsusiyyətlərində tarixi ən’ənlərin, milli etnik düşüncənin, bədii təfəkkürün, obraz və tiplərin elmi-fəlsəfi cəhətdən səciyyələndirilməsi istiqamətində yürüdülən fikirlər, ümumiləşdirilən hadisələr elmi maraq doğurur. Azərbaycan ədəbiyyatşünaslığında, ədəbi-estetik fikrində insan problemi müxtəlif formalarda, ədəbi məktəb və cərəyanlarda, ədəbi metod, ayrı-ayrı sənətkarların üslub və fərdi yaradıcılığında təzahür edən səciyyəvi, elmi-bədii xüsusiyyətlər monoqrafiyada öz ifadəsini tapmışdır. Mifik təfəkkürümüzün formalaşmasında şifahi xalq ədəbiyyatının, xüsusən “Oğuznamə”lərin, “Bilqamis”, “Kitabi-Dədə Qorqud”, “Koroğlu” və bu qəbildən olan dastanların əvəzsiz rolu, onların düşüncəmizdə, adət-ən’ənələrimizdə, ədəbi idrakımızda formalaşdırdığı ideal obraz, surət və qəhrəmanlar bəşəri duyğuların coşub-çağlayan qaynaqlarına çevrilən elmi-fəlsəfi qənaətlərdə sistemləşdirilmişdir.

Monoqrafiyada diqqəti cəlb edən ümdə cəhətlər çoxdur. Müəllif tədqiqatçıların insan konsepsiyasına münasibətindəki fikir plüralizmini bu və ya digər cəhətdən şərh etməklə məsələyə elmi-

bədii, elmi-fəlsəfi, dini-estetik cəhətdən yanaşmağın mahiyyətini tarixi ümumiləşdirici, elmi-nəzəri və müqayisəli-tipoloji təhlil prosesləri əsasında xarakterizə edir. Bu sahədəki mövcud fikirlərin ümumiləşdirilməsinə, problemin tarixilik prinsipi ilə təhlilinə, bədii təsvir, üslüb, ideya və ideyalılıq məsələlərinin müasir elmi-nəzəri və poetik prinsiplər baxımından səciyyələndirilməsinə daha çox əhəmiyyət verir.

Müəllifin tədqiqatda gəldiyi elmi-tarixi qənaətlərin, yeniliyin nədən ibarət olduğunu Azərbaycanın qədim və erkən Orta əsrlər bədii əsərlərində insan tə’limi haqqında təsəvvür yaratmasında, onun fəlsəfi mahiyyətinin aşkarlamasında, dünya mistizmi və islam təsəvvüfü işığında insanın bəşəri-fəlsəfi cəhətdən dəyərləndirməsində, təsəvvüfün milli, bəşəri, dini və fəlsəfi xüsusiyyətlərinin klassiklərdən Xəqani, Nizami, Nəsimi, Füzuli və bu kimi sənətkarların bədii əsərlərindəki yerindən, N. Tusi, Sührəvərdi, Bəhmənyar kimi filosofların elmi-fəlsəfi tədqiqatlarında oynadığı rolundan da bilmək mümkündür.

Monoqrafiyada Azərbaycanda maarifçiliyin, romantizmin və realizmin tanınmış nümayəndələrinin ideoloji konsepsiyasında insan tə’liminin ümdə cəhətləri, milli, etnik, fərdi və şəxsi problemləri çox diqqətlə nəzərdən keçirilmişdir.

İstər “İnsan probleminin öyrənilməsi”, “Qədim Şərq bədii-fəlsəfi fikrində insan”, “Azərbaycan mifologiyasında, qədim və orta əsrlər ədəbiyyatında insan tə’limi” fəsillərində, istər “Şərq-türk bədii fəlsəfi fikrinin insan tə’limində irfan məsələsi”, istərsə də “Müasir ədəbi-estetik fikirdə və bədii ədəbiyyatda insan və şəxsiyyət problemi” fəsillərində verilən təhlil, irəli sürülən elmi tövsiyə və istilahlar öz aktuallığı, elmi-bədiiliyi, məzmun və mə’na çalarlığı ilə oxucu marağının mərkəzində dayanır.

İnsanın mə’nəvi azadlığa, müstəqilliyə can atması, asılı və tək yaşaması, cəmiyyətdə, ailədə, təsərrüfatda və Vətən müdafiəsində özünü necə aparması məsələləri ictimai həyata atıldığı ilk gündən yaşayıb fəaliyyət göstərdiyi cəmiyyətdəki əxlaq normalarının, adət-ən’ənələrin, folklorun, xüsusən də mövsüm və mərasim

nəğmələrinin etik baxımdan mənimsənilməsi ilə bağlı olduğunu müəllif nümunələr əsasında şərh edə-edə “kamil insan”, “müdrik insan”, “xeyirxah insan”, “yaxşı insan” anlayışlarının elmi-fəlsəfi, etik mahiyyətini açır. Eyni zamanda, insanın müsbət cəhətləri ilə yanaşı, mənfi xüsusiyyətlərinin, fiziki və əqli keyfiyyətlərinin yazılı və şifahi ədəbiyyatın nümunələri əsasında müqayisəsini verməklə, insanda formalaşan mə’nəvi dəyərlərin cəmiyyətdə, həyatda, dövlətçilikdə, ictimai və fərdi münasibətlərdə əməli nəticələrinin nədən ibarət olduğunu göstərir. Həmçinin bu nöqteyi-nəzərdən tarixi ən’ənələrin müasirliyə tə’sirini xüsusi olaraq vurğulayır.

Müəllifin özünün qeyd etdiyi kimi, insan problemini bir monoqrafiyada şərh etmək, təhlil etmək imkan xaricindədir. Lakin müəllif çoxsaylı ədəbiyyatdan yaradıcı istifadə etməklə problemin təhlilində öz qənaət və mühakimələrini elmi cəhətdən əsaslandırmış, araşdırdıqca problemə kifayət qədər aydınlıq gətirmişdir.

Heç şübhə yoxdur ki, bu əsər gələcəkdə tədqiqatçı alimlərin, ədəbiyyatşünas və filosofların bədii ədəbiyyatın estetik problemləri ilə bağlı aparacaqları elmi-tədqiqatlarında müsbət rol oynayacaqdır.

Müəllif tədqiqatında müasir ədəbi prosesə, bədii ədəbiyyatda yeni insan probleminə də xeyli yer ayırmışdır. Lakin bir əsərdə geniş ümumiləşdirmələr aparmağa imkan olmadığını da qeyd etmişdir. Bu da təbiidir. Çünki müasir dövrün ədəbi təəssüratında bu mühüm mövzunu tə’min etmək böyük və çoxsahəli bir işdir.

Baş verən proseslər insan nədir, onun mə’nəvi dəyərləri və idealları hansılardır? Müasir cəmiyyətdə insanın özgələşməsinin aradan qaldırılmasının yolları, mədəniyyət və sivilizasiya nədir? Kimi suallara cavab tapmaq zərurətini meydana atmışdır. Bu cavabı axtaranlar arasında milli filosoflar da, yazarlar da vardır.

Biz də bu qənaətdəyik ki, Azərbaycan ədəbiyyatının son mərhələsi, xüsusilə 60-cı illər nəsri Anar, Yusif Səmədoğlu, Elçin, S. Əhmədov, Ə. Əylisli, İ. Məlikzadə, V. Nəsib və b. nasirlərin əsərlərində insana yeni münasibəti, onun təklənməsi, cəmiyyətdə

“tənhalaşma”sı kimi keçid dövrünə xas olan xarakterik amillərin üzə çıxarılması, müasir ekzisensialist düşüncənin bədii təhkiyə və təsvirdə müvafiq əks-sədası və s. bu istiqamətdən daha geniş və əhatəli şəkildə müəllif tərəfindən təhlilə cəlb olunmalı idi.

Eyni zamanda, insanların özünüdərkində və milli mənlik şüurunun formalaşmasında xalq şairlərimizdən B.Vahabzadə, X.Rza, M.Araz, Ağa Laçınlı, Əli Mahmud, H.Arif və T.Bayramın yaradıcılığında sosial-siyasi, ictimai-mə’nəvi mühitin aktual problemlərini əks etdirən, xalqımızın mə’nəvi-psixoloji vəziyyəti barədə geniş təsəvvür yaradan poetik parçaların elmi-bədii təhlilə cəlb edilib dəyərləndirilməsinə də diqqət yetirilsəydi, şübhəsiz ki, oxucuların hədsiz marağına səbəb olardı. Müasir ədəbiyyatşünaslıqda nəsrin yeni, konseptual cəhətlərinin təhlili, universal və fərdi xarakterlərin, daxili psixoloji təsvirlərin öyrənilməsi baxımından buna böyük ehtiyac olduğu da aydın görünməkdədir. İ.Vəliyevin monoqrafiyası insan problemlərinin aktual məsələləri və tədqiqatın gələcək istiqamətləri barədə oxucuya dəyərli mə’lumatlar verir.

*Tofiq Rəsulov,Z. Məhərrəmov*

Məqalə, «Azərbaycan» jurnalının iyun 2001-ci il 6-cı sayında dərc olunmuşdur.

## DƏDƏ ƏLƏSGƏRİN «DAĞLAR» VƏ «DOLANIR» RƏDİFLİ QOŞMALARI

Göyçə aşıq məktəbinin ölməz sənətkarları barədə ağsaqqalların, ağbirçəklərin yaddaşlarında yatıb qalan çoxsaylı rəvayət və xatirələrin qələmə alınması, toplanılıb küll halında folklor arxivinə verilməsi gələcək nəsillər üçün əvəzsiz töhfədir. Bu iş indiki şəraitdə, Göyçə mahalının əhalisinin müxtəlif ərazilərə səpələndiyi və yaşlı adamların get-gedə dünyasını

dəyişdiyi bir zamanda olduqca vacib, son dərəcə gərəkli, həm də zəruridir.

Sazsevərlər, sözsevərlər məqam gələndə, yeri düşəndə ata-babalarından və ustad sənətkarlardan Aşıq Ələsgərlə bağlı eşitdikləri maraqlı əhvalatları danışmaqdan böyük məmnunluq duyurlar. Söhbətlərində danışdıqları əhvalatların nə zaman, harada və kimlərin məclisində baş verdiyini, bir çox qoşmaların hansı tarixi şəraitdə yazılmasına aydınlıq gətirmək istədiklərini vurğulayırlar.

Aşıq Ələsgərin anadan olmasının 175 illiyi münasibətilə onun küllüyatının tam şəkildə İslam Ələsgər tərəfindən nəşrə hazırlandığını və yaxın vaxtlarda isıq üzü görəcəyi barədə bir toy məclisində söhbət edirdilər… Əslən Göyçənin Pəmbək kəndindən olan, hazırda Bakı şəhərində məskunlaşan, ixtisasca filoloq Məzahim Bayramov Aşıq Ələsgərin «Dağlar» və «Dolanır» rədifli qoşmalarının yazılma tarixinin maraqlı əhvalatlarla bağlı olduğunu söyləməzdən əvvəl qeyd etdi ki, Dədə Ələsgərin ustadlıq etdiyi sənətkarlardan Zodlu Ağayar (Xəlilov Ağayar Xəlil oğlu, 1880-1978) onun yaradıcılığını hamıdan mükəmməl bilən aşıqlardan idi. Dəfələrlə onun apardığı məclislərin iştirakçısı olmuşam: güclü hafizəsi, dərin biliyi, qeyri-adi yaddaşı ilə el-obada şöhrət tapmışdı. Yaşlı nəslin nümayəndələrindən hansı göyçəlidən soruşsalar ki, Aşıq Ağayar necə sənətkar idi ?! … - Aşıq Ələsgərin yaradıcılığını və onunla bağlı əhvalatları hamıdan dəqiq bilən, məlahətlə oxuyan, şirin bir ləhcə ilə dastanlar danışan ən istedadlı ustad aşıqlardan biri Ağayardır,-deyərlər. El ədəbiyyatının, həmçinin Aşıq Ələsgərin həyat və yaradıcılığının öyrənilməsi məqsədilə Göyçə mahalında vaxtı ilə ekspedisiyada olan görkəmli alimlərdən H. Əlizadə, M. Təhmasib, Ə. Axundov, A. Nəbiyev, Q.Namazov, İ. Abbasov, S. Paşayev, M. Həkimov və onlarca başqaları bilavasitə Ələsgəri tanıyanlarla, onun ustadlıq etdiyi şagirdlərlə, o cümlədən də Aşıq Ağayarla görüşmüşlər. Bu tədqiqatçı alimlər, xüsusən də İslam Ələsgər Əsəd, Nəcəf, Talıb, Əli, Məhəmməd, Şükür, Behbud, Hümbət, Bayram, Hacı, İslam,

Rəcəb, Ağayar kimi tanınmış el sənətkarlarının söylədikləri rəvayət, əhvalat və şerləri yazıya alıb «Aşıq Ələsgər» kitabında nəşrini təmin etmişlər. Bu nəcib işdə Aşıq Ağayarın əməyi heç də az olmamışdı. Elə onun «Sinəmdə getdi» rədifli qoşması da Ələsgər yaradıcılığına dərindən bələdliyinə bir işarədir:

Aşıq Ələsgərin söz dəryasının
Ləl, gövhər qiyməti sinəmdə getdi.
Ölçüyə sığışmaz, çəkiyə gəlməz
Möhnəti, hikməti sinəmdə getdi.

Bir neçə aşığa mən oldum ustad,
Qəmli könülləri çox eylədim şad,
Görüm səni olnan, ay dünya, bərbad!
Elin məhəbbəti sinəmdə getdi.

Həmişə söylənir dillərdə adım,
Daha qocalmışam, yoxdu imdadım,
Mən ölsəm ağlayar qohumum, yadım,
Yurdumun ülfəti sinəmdə getdi.

Aşıq Ağayaram, mən sinədəfdər,
Ötmədi günlərim mənasız, hədər,
Növrəstə İmannan çox etdim səfər,
Onun sədaqəti sinəmdə getdi[2]

## AŞIQ AĞAYAR ƏMİRƏHMƏDLƏ DƏDƏ ƏLƏSGƏRİN ƏHVALATINI BELƏ SÖYLƏMİŞ…

Azərbaycanın şimal-qərbində Qabırrı çayının sağ sahilində yerləşən Eldar düzündəki obalardan olan ( indiki Samux

[2] Tərlan Göyçəli, Göyçə aşıq məktəbi. Bakı. Göytürk,1998, s., 107

rayonunun ərazisi) adlı-sanlı, cəngavər, səxavəti və igidliyi ilə tanınmış qaçaq Əmirəhməd hər il yaylaq vaxtı erkən Göyçənin Pəmbək kəndinin yaylaqlarında məskən salar, payızın sonuna qədər dağ havasından doyunca təmənnasını götürər, dağlarda ilk qar görünəndə Arana üz tutardı. Onun bina saldığı bu yaylaq yeri özündən sonra «Əmirəhmədin yurdu» kimi el arasında tanınmış və yaddaşlarda yaşamışdı.

Əmirəhməd Aşıq Ələsgərə sifariş göndərir ki, onun məskən saldığı yaylağa təşrif gətirsin. Ələsgər sifariş çatan kimi tədarük görür, səfərə çıxır, nəhayət, dağ aşırımlarından keçə-keçə Əmirəhmədin obasına varid olur. Aşıq dağların qoynunda bir zamanlar bir-birinin yaxınlığında qurulan çadırları, burada yaylayan elləri, qoyun sürülərini, naxırları görmək arzusu ilə ətrafı seyr edir. Baxdıqca qanı qaralır, halı pərişan olur, dağların, yaylaqların tənhalığından çox sıxılır. Əvvəllər gördüyü qurğu-büsatın olmadığından təsirlənir. Dağların zirvəsini tutan çən, yamaclarını bürüyən sis duman sanki sahibsizlikdən Aşıq Ələsgərə gileylənir, at kişnərtisinə, qoyun-quzu mələrtisinə, bulaq başına dəstə tutub gedən türfə gözəllərin şən qəhqəhələrinə, şaqraq gülüşlərinə ehtiyac duyulduğunu, həsrət qalındığını çox böyük ürək ağrısı ilə xatırlayır… Yaylaqlardakı bu kimsəsizlik aşığa bir dərd olur. Bu dərdin şer variantı qələmə alınmadan, yazıya köçürülmədən artıq onun yaddaşında faktların zənginliyi ilə həkk olunur. Fikirlər burulğanında çırpına-çırpına, ictimai şəraitin törətdiyi fəsadları ürəyində məzəmmətləyə-məzəmmətləyə xəyallar aləminin acılı-şirinli xatirələrindən bir anlığa ayrılmaq istədikdə gündoğan tərəfdən seyrələn bulud topaları arasından görünən, dağın yamacına sığınan çadırlara gözləri sataşır, gəlib çatdığını yəqinləşdirir… Bu o vaxtlar idi ki, əsrin başlanğıcında erməni millətçiləri türkləri öz tarixi torpaqlarından planlı surətdə çıxarmağa , qırmağa, milli soyqırıma başlamışdılar. 1905-ci il faciəsi baş vermiş, qorxu və həyəcandan Aran camaatı gəlməkdən ehtiyat etmiş, göyçəlilər isə bu qorxudan pərən-pərən düşmüşdü, dürüş gətirib qalanların bir

parasının da sabahkı günə inamı azalmışdı. Ayağı yer tutan şələbərxana gecəynən Gəncəbasara, Gədəbəyə, Qazağa və başqa yerlərə çıxıb gedir, qalanlar isə naümid vahimədə yaşayırdılar. Belə bir vəziyyətdə Göyçə mahalında qalan əhali əkin-biçinini davam etdirirdi. Adlı-sanlı igidləri, sənətkarları, üzdə olan başbilənləri camaatın qaçıb dağılmamasına hər vasitə ilə nail olurdular… Son illərin qanlı hadisələrini Aşıq Ələsgər yaradıcılıq təxəyyülündən keçirə-keçirə gələcəkdə nələrin baş verəcəyini düşünürdü… O, çəmənlikdə oynaşan uşaqlardan Əmirəhmədin çadırını soruşur. Uşaqlar bələdçilik etmək istəyəndə Ələsgər deyir ki, odur, Əmirəhməddir, özüm gedərəm, siz əziyyət çəkməyin.

Aşıq Ələsgərin gəldiyini görən Əmirəhməd, Dəli Alı və Məşədi Yolçu irəli yeriyib onu çox böyük mehmannəvazlıqla qarşılayırlar. Məclis qurulur, söhbət qızışır. Dünyanın, zamanın gedişindən hərə biliyi, dünyagörüşü dairəsində söhbət edir. Ələsgər danışıqdan anlayır ki, toy üçün çağırılmayıb… Əmirəhmədin Məşədiyolçunun doqquz əli silahlı adamla Motaluçanda Ələsgərlə Əsədin yolunü kəsib Dəli Alının [3] bacısı oğlu Zeynalabdının toyunun necə keçməsini tərif etməsini, Alı və Ələsgər əhvalatını xatırlatması Aşıq Ələsgərə bu dəvətinin məqsədini yəqinləşdirməyə bir eyham olur və deyir:

-Yaxşı iyidi vəsf edərlər. Dəli Alı cah-çalallı, şöhrət-şanlı adamdı. Düzünü deyirəm, həm də mərddir, səxavətlidir. Məşədi Yolçu toydan gətirdiyimiz qızılları alanda çox mətləbləri yada sala bilmədim. Canımın hayında idim, gözümə heç nə görükmürdu, ölümümdən də qorxmurdum. Məni ağrıdan o idi ki , məşhur bir iyidin toy məclisinə atlı gedib atsız qayıdasan, bundan, bu «şərəfdən» narahatçılıq keç irirdim…

Məşədi Yolçu gülümsünə-gülümsünə: - Sən allah, məni niyə utandırırsan, bir zarafat idi. O tərifləri toyda desəydin, bəlkə də

[3] XIX əsrin sonu XX əsrin əvvəllərində yaşamış məşhur Dəli Alı, əslən Goranboy rayonunun Qarasuçu kəndindəndir.

onun iştirakçılarından başqa heç kəs eşitməzdi. Bu əhvalat bütün hər yerdə söylənilir.

Söhbətdi da, edirik, deyə Aşıq Ələsgər dilləndi. Əmirəhməd dedi:

-Ay Aşıq Ələsgər, heç soruşmursan ki, səni nə üçün burya çağırtdırmışam?

- Nə üçününü deyərsən, hamımız bilərik.

- Bu yaylaqlara baxırsanmı, indi bomboşdu. Həmişə Eldarın camaatı burada yaylaqlayardı. Mənim zəhmimdən heç kim bu həndəvərə ayaq basa bilmir… Mənim də Ələsgər tərifinə ehtiyacım var..

Aşıq Ələsgər eşitdiyi sözlərdən bərk tutulur, sazı köynəyinə qoyur və deyir:

Ay Əmirəhməd, Eldar camaatı arasında sənin kimi qüdrətli, namuslu, qoçaq, iyid oğullur çox-çoxdur, onları təkcə sənin ayağına verməərəm.

- Mən sənlə razılaşmıram, bəs bu qoçaqlar nə üçün yaylağa çıxmırlar?!

Aşıq Ələsgər yaylaqların belə boş qalmasının səbəbini erməni-müsəlman savaşı ilə izah etdikdən sonra sazı yenidən köynəyindən çıxardıb fikrini bir daha on bəndlik «Dağlar» qoşmasında ifadə edir… Əmirəhmədin igidliyi yox, dağların vəziyyətinin tərənnümü Ələsgəri daha çox düşündürür. Əmirəhməd ha gözləyir ki, şəninə tariflər deyiləcək. Ələsgər isə özünü o yerə qoymur, söhbətin istiqamətini başqa səmtə yönəldir. Əmirəhməd bundan bərk inciyir… Ələsgər gecəni burada qalır, səhər tezdən durub getmək istəyəndə Dəli Alı Əmirəhmədin üzürxahlığını eyləyir.və getməməsini xahiş edir. Ələsgər isə inadından dönmür. Yaylağı duman-çiskin bürüməsinə baxmayaraq, o, obanı tərk edir. Bir xeyli getdikdən sonra yolun səmtini itirdiyini zənn edir, haraya gedəcəyini, nə edəcəyini bilmir. Elə hey gedir, yol tükənmək bilmir. Birdən qulaqlarına danışıq səsləri gəlir. Səs gələn tərəfə diqqətlə qulaq asır, səhəng çiynində

iki zənənin yavaş-yavaş adımladığını dumanın seyrələn yerindən görür. İrəli yeriyib mehribanlıqla soruşur:

-A qızım, yolu çaşmışam, dumandan, çəndən yerləri ayırd edə bilmirəm, bura haradır? Onlardan biri deyir ki, bura Şınıx mahalının yaylağıdır. Siz haradan gəlib, haraya gedirsiniz?! Cavabında Ələsgər:

-Dağlıq Qaraqoyunlu Xudaverdiyəm, bə siz kimsiniz?

Hər ikimiz Kərbəlayi Sarının gəliniyik. Qaynatamızın aşıq dostları çoxdur, bəlkə sizi də tanıyır, gedəyin qonağımız olun… Obanın birinci muxuru (çadırı) bizimkidir.

Siz gedin, bir azdan mən özüm gələrəm, -deyir. Aşıq Ələsgər bir az ayaq saxlayıb yubanır, sonra isnad verilən maxura tərəf addımlayır.Çatanda görür ki, Kərbəlayi Sarı namaz qılır, namazdan fariq olandan sonra ona yaxınlaşıb salam verir.

-Əleyküm salam, ay Aşıq Ələsgər, deyərək çox səmimi görüşürlər.Yaxşı, mən soruşdum deyə tanıdım, bə mənim Ələsgər olmağımı haradan bildiniz?!

-Mən Sizin ucaboylu, enli kürəkli, iri gövdəli bir şəxs olduğunuzu çox adamdan eşitmişəm…

Hər ikisi muxura daxil olur. Çay-çörəkdən sonra olub-keçənlərdən söhbət edirlər. Axşam obanın camaatı böyüklü-kiçikli Aşıq Ələsgərin başına yığışır. Məclis qurulur. Saz havaları, dastanlardan oxunan şerlər bir-birini əvəz edir… Gecə yarıdan keçdiyindən məclisdəkilər dağılışır. Amma bunların çoxu Ələsgər olduğuna inanmır. Kərbəlayi Sarı onlara deyir ki, zəndiniz sizi aldatmasın, Aşıq Ələsgərin özüdür, sazı da sol əllə çalır…

Aşıq Ələsgər neçə günün yol yornuğu idi. Gün çeştə çıxana kimi yatır, oyananda K. Sarı onu bulaq başına aparır və təbəssümlə deyir:

-Ay Aşıq Ələsgər, məni bağışla, axşamkı adamların çoxusu Sizin Aşıq Ələsgər olduğunuza inanmır.

-Kərbəlayi, mən bunu axşamdan duymuşam. İndiki elədi, icazənizlə Ələsgər olduğumu sübuta yetirim. Birdən sazıma «müştəri» düşən olar…

Aşıq Ələsgər bədahətən «Dolanır» rədifli qoşmasını deyir və bu yaddaşlara həkk olunur…

Aşıq Ələsgər bir neçə gün bu obanın əziz qonağı olur. Onu böyük məhəbbətlə doğma mahalına yola salırlar

---

Beş bənddən ibarət olan «Dolanır» şeri Ələsgərin müxtəlif illərdə nəşr olunan kitablarının hamısına daxil edilmiş, ilk dəfə Murov yaylağında deyilməsi faktı Azərbaycan Elmlər Akademiyasının 1963-cü ildə çapdan buraxdığı «Aşıq Ələsgər» kitabının izahatlar bölməsində göstərilmişdir. Həmin qoşma kitabın 36-cı səhifəsində ayrıca, 178-ci səhifəsində «Şair Vəli ilə deyişmə» şəklində verilmişdi. Aşıq Ağayar bu qoşmanın:

Gördüm igidləri mərdü mərdana,
Vəsfini birbəbir saldım dastana.
Gözəllər şövqündən dəli, divana,
Məcnun kimi ğiyabanlar dolanır.

Bu bəndinin indiyədək heç bir nəşrdə verilmədiyini söyləmişdi. Oxucular, aşıq yaradıcılığı ilə maraqlananlar üçün bu fakt bir yenilikdir.

ADPU,«Filologiya məsələlərinə dair tematik toplu» № 1,
Bakı, 2000, səhifə76-84.

## DƏDƏ ƏLƏSGƏRİN ƏN SEVİMLİ ŞƏYİRDLƏRİNDƏN BİRİ…

«Ələsgər ocağı»nın tanınmış sənətkarlarından Qurban, Talıb və Ağayar tez-tez Qarabağda, Cavanşir mahalında keçirilən toy məclislərinə dəvət olunarmışlar. Bir dəfə Kəlbəcərin Qamışlı kəndində Zal adlı hörmətli, el arasında böyük nüfuzu olan müdrik kişinin qonağı imişlər… Məclis qurulur, söhbət get-gedə şirinləşir. Aşıqlar məclis əhlinin könlünə yatan əhvalatlardan,

deyişmələrdən söz salıb çalıb oxuyurlar. Heyranlıqla aşıqların oxuduğu saz havalarına saymazyana kənardan qulaq asan bir gözəl qız nəzərlərini aşıqlardan çəkmir. Qurbanın arabir muğam üstə oxuması onun canına elə bil yağ kimi yayılır, aldığı mənəvi qidadan sanki sehirlənir. Baxışlarındakı qeyri adi məsumluq Aşıq Qurbanın diqqətindən yayınmır, ürəyindən keçənləri qıza çatdırmaq üçün dərdini Aşıq Ağayara açır, ondan xahiş edir ki, elçim ol və bu barədə Talıba bir kəlmə də olsun söz sızdırma.

Məclis dağılır, səhər açılır. Ağayar fürsət tapıb qızla görüşür, get-gəldən, Kəlbəcərlə Göyçənin doğmalığında, bir çox ailələrin qohumluğundan, bir-birinə qız verib qız almasından söhbət edirlər. Nəhayət, Ağayar mətləb üstə gəlir, Qurbanın ona vurulduğunu söyləyir. Qız isə Qurbanın ondan yaşda böyük olduğunu və bu sevdanın baş tutmayacağını bildirir. Ağayar vəziyyəti Qurbana nağıllayır. Lakin Qurban inadından dönmür. Ağayardan xahiş edir ki, bir də ərzi-bəndəliyini əsirgəməsin və «Qurban üçün» rədifli qoşmasını dilcavabı da olsa, qıza çatdırsın… Aşıq Ağayar deyilən kımi də edir:

*Sahibi səltənət, şirin tərəccəm*[4]
*Bir qədər qayğıya qal Qurban üçün!*
*Dost gərək dostunun cəfasın çəksin,*
*Özünü zəhmətə sal Qurban üçün !*

*Dost dostu görəndə ehtiram çəkər,*
*Zatı olmayan pünhan ötər, yan çəkər.*
*Dar günündə kara gələn qan çəkər,*
*Ərkinən yazıram, al Qurban üçün !*

*Canım azardadı, ürəyim üzgün,*
*Bir günüm min ildi, dəqiqəm yüz gün.*
*Ağıldan cəm ola, kamaldan düzgün,*

[4] Tərəccəm – umma, arzulama, rica etmə.

*Qismətmidir, açdır fal* Qurban *üçün !*

*Bir sümükdən xırda, sarğıdan qalın,*
*Əmən cavanlaşar ləbinin balın.*
*Bu xəstə canımın bilə əhvalın,*
*Dillənəndə deyə çal* Qurban *üçün !*

Söhbəti uzatmağa dəyməz, dünənnən mən sözümü demişəm, ay Aşıq Ağayar, - deyə Gözəl xanım öz etirazını bildirir… Lakin Ağayar ondan xudafizləşib ayrılıb gedəndən sonra fikirlərə dalır, qəlbinin dərinliklərindən bir peşimançılıq hissinin baş qaldırdığını özü də gizlədə bilmir, ürəyində məhəbbət duyğularının yarandığından da çox mütəəsir olur…

Yenə növbəti məclis qurulur, aşıqlar dövran edir, Aşıq Qurban olmuşlara cavab əlaməti kimi «Ağarıb» müxəmməsini söyləyir:

*Yoxsa, mən qocalmışam,*
*Xəddim olub çal, ağarıb?!*
*Bilmirəm bığa nə olub,*
*Hələ saqqal ağarıb.*
*Əzəldən dən düşmüşdü,*
*İndi tamam sal ağarıb.*
*Gizlətməyə yoxdu əlac*
*Eşidib mahal, ağarıb,*
*Hardan alım hər sabahlar,*
*Yaxım buna bal, ağarıb.*

*Yağılan məsləhətə*
*Şərmi həya, ar üzümə,*
*Qalmayıb bir qara tük,*
*Sən də bax, axtar, üzümə.*
*Ağlamaqdan eynim yaşı*
*Sel olub axar üzümə.*
*Yoxsa ki qırov düşüb,*

Bəlkə yağıb qar üzümə?!
Elə bil ki, dağlar başı
Olub o misal çal, ağarıb!

Xəyalım aş istəyir,
Meylim qəndi, çayı deyir,
Xudanın kərəmindən
Bol veribdi payı deyir.
Bozbaşı, ağ lavaşı,
Belə haqqı, sayı deyir.
Bu beymürvət qıza bax,
Əmi deyir, dayı deyir.
Bu dərdi çəkəmmərəm,
Edəm yüz xəyal ağarıb!

Bu çərxi-gərdişdə varmış
Yüz əlli cür oyun, kələk.
Süleymanı yola salıb
Bu zülümkar çərxi-fələk.
Arif özü mətləb qanar,
Aşkar nə lazımdı demək
Neynirəm mən gözəli,
İstər olsun huri-mələk.
Mayənər meyl eyləməz
Görsə ki qanqal ağarıb!

Qeyrətə xələl verib,
Gətirir töhmət qocalıq!
Bir ayrılıq, bir də ölüm
Çox artırır dərd qocalıq.
Mərd igidi, şux gözəli
Edib bimürvət qocalıq.
Qurban deyər aman, aman,
Aman bimürvət qocalıq.

*Göz batıb, zülf dağılıb*
*Versə yüz sığal, ağarıb!*

Aşıq Qurban möhür bəndini tamamlayır. Gözlərində parlayan sevgi-məhəbbət qığılcımlarından Gözəl xanımın razılığını yəqinləşdirir… Bir-birinə vurulurlar. Aralarında əhdi-peyman edirlər. Qurban elçi göndərəcəyinə söz verir və Göyçə mahalına qayıdırlar… Gələndə atası Məşədi Salehdən Məkkə ziyarətinə hazırlaşdığını eşidir. Ağayardan təvəqqə edir ki, mənim başıma gələnləri atam səfərə çıxmamış bildir, qəti fikrimi söylə.

Ağayar nə qədər özünü cəmləşdirirsə də, utandığından Qurbanın eşq sevdasına düşdüyünü, əhdi-peyman bağladığını deməkdə çətinlik çəkir… Axırda Qurban özü məcbur olub dərdini atasına danışır. Atası deyir ki, oğul, sənin eşqə düşdüyünü eldə-obada bilsələr, hamı bizi qınayar. Axı sən ailəlisən… Aşıq el arasında ən hörmətlə qarşılanan, sevilən, ehtiram göstərilən şəxsdir. İnnən belə səni qabaqda saysız-hesabsız məclislər gözləyir. Hər məclisdə bir gözələ vurulsan, daha onda nə olar?!.. Belə fikirlərdən daşın…

Qurban atasının sözlərinə cavab olaraq «Getməsəm olmaz» rədifli qoşmasını bədahətən deyir:

*Ata, vallah, bu dərd məni yandırır,*
*Verdiyim ilqara getməsəm olmaz.*
*Seyraqublar gedər yaman yandırar,*
*Ollam üzü qara, getməsəm olmaz.*

*Huri-qılman olmaz yarın təhrində,*
*Mən yanıram qəm odunun qəhrində.*
*Əgər Mansır kimi Hələb şəhrində*
*Çəksələr də dara, getməsəm olmaz.*

*Sən ol Xoca Əziz, mən olum Məsim,*
*Vəfalı meylimi bəs necə kəsim,*

*Badi-səba kimi gərək tünd əsim,*
*Məcnun kimi dağı gəzməsəm olmaz.*[5]

*Mən Qurbanam,öz canımdan doymuşam,*
*Xəncər alıb bağrım başın oymuşam.*
*Öz dilimlə doğru ilqar qoymuşam,*
*Həsrət, intizara getməsəm olmaz.*

Atasının narazılığından həya edən və ümidini itirən Qurban bu sevgini nə ürəyindən çıxara bilir, nə də unuda bilir. Qəlbi qubar eyləyir. Gözəl xanımın məhəbbəti onun üzərində sanki bir kölgə kimi gəzir, onu elə bil təqib edir… Dərdə-qəmə tab gətirə bilmir, eşqin fərağından bir müddətdən sonra dünyasını dəyişir. Qurbanın ölüm xəbəri Gözələ çatır, o, qaralar geyinir, əsil məhəbbətin acısını dadır, üzü gülmür, özünü həyatda kimsəsiz sanır, xəstəlik tapır, ürəyindəki məhəbbətini özü ilə birlikdə qəbr evinə aparır…

***

Bu əhvalat barədə yekun olaraq nə demək olar? Aşıq Qurban Dədə Ələsgərin qardaşı Məşədi Salehin böyük oğludur. Onun doğum tarixi məlum olmasa da, çox gənc vaxtlarında, həyatının çiçəkləndiyi bir zamanda, 1915-ci ildə kəndi Ağkilsədə vəfat etmişdi. Aşıq Talıbın və başqa qohumlarının söyləməsinə görə Qurban simaca yaraşıqlı, mərifət-qanacağı ilə xalq içində hörmət qazanmış yaxşı bir aşıq olmuşdu. Gözəl səsi, bədahətən şer demək, muğam havalarını çox məlahətlə ifa etmək qabiliyyəti varmış… Qurban Aşıq Ələsgərin ən sevimli şəyirdi imiş, onun vaxtsız vəfatı ustadını məyus etmiş, bu hadisədən sonra Aşıq Ələsgər bir daha əlinə saz almamışdır.[6]

---

[5] Şeirin bu bəndi ilk dəfə çap olunur.
[6] İslam Ələsgər. «Ələsgər ocağı», Bakı, «Yazıçı», 1991,səh..290.

Aşıq Qurbanın şerlərinin əksəriyyəti unudulmuş, yalnız bir neçə şeri «Ələsgər ocağı» toplusuna daxil edulmişdir. Qurban ilə Gözəl xanım arasında baş verən bu uğursuz məhəbbətin əhvalat şəklində mərhum Aşıq Ağayarın yaddaşından qələmə alınması təxminən 70-ci illərin əvvəllərinə aiddir. Onda nə Aşıq Ağayar, nə də heç kim Göyçə mahalının bir vaxtlar dağılacağını, əhalisinin qaçqın-köçkün olacağını, onun sənət həyatının pələsəng düşəcəyini ağlına belə gətirməzdi. Ağıla gəlməyən başa gələr,- deyiblər…

**Folklor məsələlərinə dair tematik toplu,№ 3 , Bakı, 1999, səh.32-37.**

## GÖYÇƏ AŞIQ ŞERİNDƏ XALQ DANIŞIQ DİLİ

Göyçə aşıq mühitinin əsasını təşkil edən cəhətlərdən biri də xalq danışıq dilindən, onun məna çalarlarından lazımınca bəhrələnmədir. Ölməz şairimiz Səməd Vurğun bu baxımdan söhbət açarkən Aşıq Ələsgər yaradıcılığının sənəkarlığından öyrənməyin gərəkliyini qeyd etmiş və onun «Azərnəşr» tərəfindən çapdan buraxılan şerlərini misal çəkmşdir: «Xalis Azərbaycan turkcəsi ilə bədii surətdə yazılmış olan bu şerlərdə bir açıqlıq, saflfq və təbiilik, milli ifadə formaları, milli obrazlar çoxdur. Bunlardan istifadə ilə biz yalnız Aşıq Ələsgərə qayıtmamaq şərtilə bugünkü şerimizdə bu günün saflığını, təmiz və səmimi lirikasını, geniş xalqın zövqlərini tərənnüm etməliyik. Əks təqdirdə, bizim şerimiz geniş kütlənin malı ola bilməz»[7]. Bədiilik sənətdə təsirlilik və poetiklik deməkdir. Onun gücü isə heç nə ilə müqayisə olunmur. Göyçə ədəbi mühitində isə şerin təsir gücü daha çox nəzərə çarpandı. Əsrimizin 20-50-ci illərində bu təsirliliyin mövcudluğunun müxtəlif səbəbləri vardı, onlardan da ən başlıcası Aşıq Alı və Aşıq Ələsgər çuxasından çıxma məsələsi idi. Bu ustad sənətkarların nailiyyətləri və müvəffəqiyyətlərinin başlıca səbəbi kimi sözə olan tələbkarlığın əsasında sonrakı nəsil formalaşırdı . Bədiiliyi şərtləndirən məhz onun struktur amilləri, şerin formal cəhətləri ən birinci vasitə hesab ediləcək sözdür. Sənətkarın hər hansı bir həyat hadisəsini qələmə alıb bədii boyalarla nə dərəcədə cilalaması onun qüdrətini göstərir. Həyatı dərk etmək, onun dərinliklərinə qədər bələd olmaq üçün zəngin həyat təcrübəsi lazımdır. Bu təcrübə isə yaradıcı şəxsə öz fikrini, duyğu və düşüncələrini obrazlı şəkildə vermək üçün geniş imkanlar yaradır. Göyçə ədəbi mühitində bədiilik və dünyagörüş məsələsi paralel görünür. Burada mühitin zaman-zaman hər iki sahədə uğurlarının yeni gələn yaradıcıda novatorluqla təkrarı vardır. Məhz ona görə də bu mühit bədiilik məqamında mövcud dövrdə digər mühitlərlə

---

[7] S.Vurğun. Əsərləri, 5-ci cild. Bakı, Elm, 1972, s. 26.

müqayisədə daha çox seçilir və aşıq yaradıcılığında xəlqiliyin xeyli dərəcədə güclənməsi ilə xarakterizə olunur. Bunun əsasında isə, dediyimiz kimi, söz sənətini duymaq, onun əzabını hiss etmək məsələsi dayanır.

Göyçə aşıqlarının yaradıcılığında tez-tez təsadüf olunan məcaz növlərindən biri *metaforadır.* Bu , Azərbaycan ədəbiyyatşünaslığında, eləcə də bir sıra Şərq xalqlarının ədəbiyyatında *istiarə* sözü ilə də ifadə olunur. Metafora köçürmə mənasını bildirir:

*Gah qartal tək göydə süzür,*
*Gah səyyah tək ellər gəzir,*
*Gah girir dərində üzür,*
*Gah da çıxır üzə könlüm.* [8]

Yuxarıdakı bənddə lirik mənin eşqin ucbatından çətinliyə düşdüyü, əzablara düçar olduğu təsvir edilir. Məlum olduğu kimi, səmada süzmək, uçmaq quşlara, dəryada üzmək isə insana və suda yaşayan canlılara məxsus əlamətlərdir, ancaq aşıq bu xüsusiyyəti insanın məhəbbət duyğularının, zahiri gözəlliyinin üzərinə köçürməklə maraqlı bir metafora yaradır. Beləliklə, aşıq dilin bu imkanlarından yüksək ustalıqla istifadə etməklə, şerin bədii siqlətini, poetik pafosunu xeyli dərəcədə artırmışdı.

Metafora müqayisə, oxşatma əlamətinə görə təşbehə bənzəyir. Lakin metafora təşbehə nisbətən daha mürəkkəb məcaz növüdür. Bu mürəkkəblik ondakı mücərrədlikdən, qarşılaşdırılan tərəflərdən birinin iştirak etməsindən irəli gəlir. Yenə fikrimizə aydınlıq üçün Növrəs İmanın şerlərindən bir nümunəyə diqqət yetirək:

*Qəmərüz qadanı bu canım alsın,*
*Sallanıb gələndə otağa bir-bir.*

[8] Telli saz ustadları. Azərnəşr, 1964, s.,132.

*Camalının şöləsinə dolansın,*
*Olsun pərvanələr sadağa bir-bir.*[9]

Növrəs İman yaradıcılığı baxımından özünəməxsusluqla səciyyələnən sənətkardır, elə taleyi də bənzərsizliklə nəzərə çarpır. Onun şerlərində olan məcazlıq (daha çox bunu qapalı məcaz kimi başa düşmək lazım gəlir) olduqca güclü düşündürücülüklə nəzərə çarpır və bir növ elmiliklə xarakterizə olunur. Məhz folklorşünas Qara Namazov Növrəs İmandakı bu özünəməxsusluğu belə izah edir: «Növrəs İman şair-aşıq olmaqla yanaşı, həm də inqilabdan sonra müəyyən təhsil almış ziyalı idi».[10] Lakin bu məsələlərdə təhsilalma problemi həll etmir, məhz müəllifin Növrəs İmanı şair-aşıq olmaqla yanaşı, təşsil, özü də mükəmməl təhsil almaqla (bu Növrəs İmanın bütün yaradıcılığı boyu nəzərə çarpır) birgə götürməsi məsələnin çox doğru həllidi. Ona görə də onun yaradıcılığı aydın, sadə deyimlərlə yanaşı, eyni zamanda, bir düşündürücülüklə də izah olunur. Məhz istər ifadə və ideya istiqamətindən, istərsə də bədiilik baxımından Göyçə aşıq mühitini araşdırarkən Növrəs İman yaradıcılığındakı bu özünəsəxsusluğu açmaq lazım gəlir. Onu da qeyd edək ki, Növrəs İmandakı bu özünəməxsusluq həmin mühitdə bədiilik, eləcə də mövzu baxımından zənginləşmə ilə izah oluna bilər və həm də fərdiyyətçilik səciyyəsi daşıyır. Bu sənətkar həqiqi mənada istedad sahibi idi (biz bu mühitdə başqalarının istedadına şəkk gətirmirik) və Ələsgər kimi bir qüdrətli sənətkarın mövcudluğu şəraitində belə bir özünəməxsusluqla nəzərə çarpma və mühitdə nisbətən fərqləndirici dəstxətlə görünmə hər istedad sahibinin işi deyildi. Ona görə də İman yaradıcılığı ayrıca bir problem kimi ciddi araşdırmalar tələb edir və belə olarsa bu nakam ömrün sonrakı davamında *əbədiyaşarlılıq* durduğu aydınlaşır. Yuxarıda göstərdiyimiz nümunədə sənətkar camalın şöləsinə dolanıb,

[9] Ələsgər ocağı. İslam Ələsgər. Bakı, Yazıçı,1991, səh., 131.
[10] Q.Namazov. Azərbaycan Aşıq sənəti. Yazıçı 1984, s., 125.

pərvanələrin sadağası olmasını metaforik bir şəkildə ifadə edir. Əslində camalın şöləsi yoxdur, işığa, oda, günəşə məxsusdur və pərvanənin yanması da camalın şöləsində yox, işığın şöləsində olur. Müəllif Şərq poeziyasındakı bu məşhur deyimi çox özünəməxsusluqla ifadə edir. Bunun əsasında dayanan isə şəxsdir, yəni gözəlin oduna yanan, onu sevən lirik mənlərdir ki, gəlib bir-bir pərvanə oda yanan tək sadağa olur. Məhz bu cür deyimlərlə sənət və sənətkar qazanır. Növrəs İman yaradıcılığındakı bu çalarlığın sonrakı davamı Göyçə aşıq mühitində nisbətən Xəstə Bayraməlidə görünür. Xəstə Bayraməli bir el şairi kimi mühitdə həm xalq şeri üslubunda, həm də klassik üslubda şerlər yazıb yaratmışdır. Onun şerlərindəki poetik fikrin çalarlığı, məna aydınlığı, hadisənin mahiyyətinin açılması meyli daha çox diqqəti cəlb edir və Növrəs İman xəttinin nisbətən yumşaq, mülayim forması səciyyəsi daşıyır. Bununla Növrəs İman yaradıcılığının təsirini məhdudlaşdırmaq fikrində də deyilik. Geniş mənada Növrəs İman yaradıcılığının Göyçə ədəbi mühitinə təsiri az da deyildir və bunun bir problem kimi öyrənilməsi diqqət doğuran məsələdir. Təkcə onu demək istəyirik ki, Növrəs İman aşıq poeziyasında, eləcə də Göyçə aşıq mühitində fitri istedad, nakamlıq simvolu kimi xatırlanır. Burada isə biz ancaq şerin poetikasını ümumi səviyyədə (mühit səviyyəsində) araşdırdığımız üçün məhz ona da bu böyük problemin bir hissəsi kimi baxırıq və fikrimizi Aşıq Bəhmən Göyçəlinin «Getdi» şerilə yekunlaşdırmaq istəyirik. Burada ustad, Şərqin böyük zəka sahiblərinin, şairlərinin, hökmdarlarının adını çəkmr və təəssüf hissilə dünyanın faniliyini vurğulayır. Növrəs İman da məhz belə sıralanmada xatırlanır:

*Yenə yada düşür biçarə İman,*
*Az gəlibdi onun kimi pürkaman.*
*Dərdi həddən aşdı, eylədi tügyan,*

*Dünyanın qəmini bir aldı getdi.*[11]

Ayrı-ayrı nümunələrdə sözün çəkisi və fikrin obrazlılığı baxımından Növrəs İmanın şerlərindən nümunələr verib təhlilə cəlb etmişik, lakin maraqlı olan məsələ, dediyimiz kimi, Növrəs İmanın yaradıcılığındakı deyim özünəməxsusluğunun sonrakı dövr və eləcə də yaşadığı zamanda mühitə təsiridir. Bu təsir, göründüyü kimi, Aşıq Bəhmən Göyçəlidə özünəməxsusluqla əksini tapır və bir zəka sahibi kimi xatırlanır. Çünki Növrəs İmandakı deyim və fikrin poetikası mühitə, təbii ki, təsirsiz qalmaya bilməzdi. Ondakı bədahətən söz demək və sözün ustad kimi çəkisini bilmək keyfiyyəti şerə olan tələbkarlıqda da özünü göstərir. Yəni o, «söz əzabını»(A. Tolstoy) dərindən dərk edən ustaddır. Məhz ona görə də onun şerlərindəki obrazlılıq, yüksək ideyalılıq həmişə həm şer yazarları, həm də aşıq yaradıcılığı tədqiqatçıları tərəfindən uca tutulub, çox zaman Aşıq Ələsgərlə eyni xətdə səciyyələndirilib:

*Mən ncə eyləyim güman, Ələsgər,*
*Bir də yetirərmi zaman – Ələsgər,*
*Qərib elli Növrəs İman, Ələsgər,*
*Xalqımın şöhrəti yadıma düşdü.*[12]

Göründüyü kimi, böyük yanğı ilə səciyyələnən bu xatırlama sənətə və sənətkara vurğunluqdan başqa bir şey deyildir. Növrəs İman yaradıcı fəaliyyəti etibarı ilə iki istiqamətdə maraq doğurur: birincisi, O, aşıq yaradıcılığının qüdrətli nümayəndəsi kimi, ikincisi, bir sırf el şairi kimi və hər iki xətdə (əslində bu bölgü arasında elə bir sədd də yoxdur, nədənsə, Növrəs İmanda buna ehtiyac duyulur) araşdırma ehtiyacı hiss olunur. Nəticə etibarı ilə bu iki istiqamət qovuşur və onun aşıq yaradıcılığındakı ykrini

[11] Bəhmən Göyəli. Vətən, küsmə məndən. Elm,1994, s.12
[12] Xəstə Bayraməli. Mənim Göyçəm. Yazıçı. 1987, s. 52

müəyyənləşdirir.Növrəs İmandakı sözün çəkisi, bədii deyimin aydınlığı ilə ümumi məzmunun tarazlığı xüsusi maraq doğurandı. Və nədənsə bir el şairi kimi bu ustaddan söhbəi açanda Xəstə Bayraməlinin xatırlanmasına ehtiyac duyulur, eyni zamanda bu iki sənətkarın el şairi kimi yaxınlığı (ideya, fikir və onun poetik deyimi) görünür. Məhz yuxarıda verdiyimiz nümunə də elə həmin fikir yaxınlığının bir hissəsi kimi görünür. M. Cəfərov şerin poetikasını «hər şeydən əvvəl onun məzmununda və daha canlı xalq dilinin təbiətində, qrammatik quruluşunda, dilin fonetik xüsusiyyətində, ritmində, melodiyalarında axtarmaq lazımdı» deyə vurğulayır. Göstərilən bu fikirdə şerin bütün struktur xüsusiyyətləri əhatə olunur və ümumilikdə şerin poetikası şərh edilir.

Dil məsələlərinə dair tematik toplu, № 1, Bakı,1997, s., 99-104.

## «XX ƏSR GÖYÇƏ AŞIQ MÜHİTİ»

***Qurban Bayramov,***
***filologiya elmləri namizədi***

Azərbaycan folklorşünaslığının mühüm sahələrindən biri də aşıq yaradıcılığı və onun tədqiqi məsələləridir. Folklorumuzun bu qolu olduqca zəngindir və durmadan inkişaf edir. Azərbaycan milli aşıq yaradıcılığı istər üslubuna, istərsə də mahiyyətinə görə regional qruplara bölünür və hər regional qrup özünəməxsus, orijinal xüsusiyyətləri ilə fərqlənir.

Bu cəhətdən Göyçə ədəbi mühiti daha çox maraq doğurur və Göyçə aşıq mühitinin yetirdiyi Aşıq Alının və Aşıq Ələsgərin adını çəkmək bizcə kifayətdir. Amma Ab Aşıqdan tutmuş, Ozan Heydərdən üzü bəri , Misgin Abdaldan ötən, Aşıq Ələsgərdə dünya şöhrəti qazanan və XX əsri haqlayan, yüzdən çox ustad aşıq yetişdirən Göyçə aşıq mühitini tədqiq etmək, öyrənmək, elmi

prinsiplərlə şərh etmək olduqca aktual bir məsələdir. Bu baxımdan Ziyəddin Məhərrəmovun «Azərbaycan Ensiklopediyası» NPB-də çapdan çıxmış «XX əsr Göyçə aşıq mühiti» kitabı diqqəti cəlb edir.

Kitab giriş sözündən və üç fəsildən ibarətdir. Əvvələn, «Göyçənin saz-söz ustadlarının həyat və yaradıcılıq yolu» araşdırılır, bu mühitin yaratdığı görkəmli sənət adamlarının şəxsiyyəti, yaradıcılığı barəsində yığcam tarixi məlumat verilir. Seçilən tədqiq metodu və üslubu bir az sadə görünsə də, bu fəsildə yerinə düşür, nəzəriyyəçilikdən çox, mühitin təsviri ön plana çəkilir, hər bir sənətkar haqqında yığcam məlumatlar bir-biri ilə əlaqədar şəkildə öyrənilir, xronoloji cəhətdən sistemləşdirilir, mühitin hüdudları haqqında tam təsəvvür yaradılır. Bu, elə məlumatlar və faktlardır ki, qətrə-qətrə toplanıb bir yerə yığılıbdır. Təkcə Dədə Ələsgərin şagirdləri və şagirdlərinin yetirmələrinin siyahısı az qala yuzə yaxınlaşır.

Sonrakı fəsildə müəllif Göyçə aşıq mühitinin ideya-estetik, mövzu xəttinə toxunur, xüsusən aşıq şerində əks olunan ictimai-siyasi və bəşəri motivləri tədqiq edir, ciddi şəkildə araşdırır, bu motivlərin sənətkardan-sənətkara keçid yollarının öyrənilməsini, mühitin təkcə regional deyil, ədəbi-bədii zənginləşmə istiqamətlərini müəyyənləşdirir. Göyçə aşıq mühiti ilə digər aşıq mühitləri arasında paralellər aparır, oxşar və fərqli cəhətləri göstərir, transformasiya , regenerasiya xətləri öyrənilir, ədəbi mühitin formalaşmasında genoloji balansın xüsusiyyətləri faktlarla, müqayisəli metodla, sadə bir dillə aşkarlanır...

Müəllifin mövzuya bələdliyi, regional mühitin psixoloji ruhi incəliklərini bilməsi, Göyçə mahalının başına gətirilən fəlakətlərin aşıq yaradıcılığına, xalq təfəkkürünə təsirini hərtərəfli səciyyələndirməyə imkan yaratmışdır.

Kitabın üçüncü fəslində, əsasən, sənətkarlıq məsələləri, Göyçə aşıq mühitinin sənət və sənətkarlıq baxımından özünəməxsusluğu araşdırılır.

Kitabda aşıq şer şəkilləri ilə aşıq havalarının müqayisəli təhlili, qarşılıqlı izahı və zənginliyini aşkarlayan hissələr xüsusi maraq doğurur. Müəllif aşıq şerinin bütün forma və şəkillərinə toxunur, əlbəttə, bu ümumi bir çətinlik , ağırlıq yaratsa da, forma, şəkil rəngarəngliyini təsəvvürə gətirir. Geniş oxucu kütləsi üçün nəzərdə tutulmuş bu kitabdan filologiya fakültəsinin tələbələri, ədəbiyyat müəllimləri və aşıq yaradıcılığı ilə maraqlananlar faydalana bilərlər.

**«Azərbaycan» qəzeti, 24 iyul 1997-ci il, №155(1676).**

## VƏTƏN İNTİZARINA HƏSR OLUNAN TOPLU

Qədim Azərbaycan xanlıqlarından olan İrəvanın birləşdirdiyi mahallardan biri Göyçədə yaşayan azəri türklərinin sonuncu yüzillikdə başına gətirilən fəlakətləri geniş ictimaiyyətə çatdırmaq, edilən qəddarlıq, qanunsuzluq, qansızlıq, qırğın və vəhşilikləri dünyaya bəyan etmək sahəsində son illər bir sıra tədbirlər həyata keçirilir. Tarixi-coğrafi, ictimai-siyasi, elmi-bədii faktları,epik-lirik lövhələri özündə əks etdirən çoxsaylı kitablar nəşr olunur. Bu sırada "Ermənistan azərbaycanlılarının tarixi coğrafiyası", "Göyçənin qisası qalır","Vətən, küsmə məndən", "Dünya susur, tarix susmur", "Burulğanlar içində", "Qara gündəlik", "Ulu Göyçə", "Aqilim, sərrafım qaldı Göyçədə","Göyçə mənim Ələsgərim,Alımdır","XX əsr Göyçə aşıq mühiti","Göyçə gözüm işığı","Ağlama, bülbül, ağlama!", "Məğlub ölüm" kimi digər dəyərli toplular maraq doğurur. Bu kitabların siyahısına son günlər biri də— Abbas Vəfadağlının «Gənclik» nəşriyyatında çapdan buraxılan "Göyçə kimi intizarda elim var" şerlər və publisistik düşüncələr toplusu əlavə olunub. Kitabın redaktoru və ön sözün müəllifi Zülfüqar Şahsevənlidir. O, Abbas Vəfadağlının təcümeyi-halı, ailə həyatı, şerə, sənətə bağlı ömür yolu, ictimai-siyasi fəaliyyəti barədə yığcam məlumat verir. "Müqəddəs ocağın

işığı”ndan nəsillərə qismət olacaq qeyrət payından, min illər boyu igidlərin at oynatdığı, qılınc çaldığı,söz qoşduğu, saz çaldığı bu oğuz eli Göyçənin təbii gözəlliklərindən, onun ədəbi mühitinin görkəmli nümayəndələrinin sənət dünyasında özünəməxsus yeri və üslubu olan Əli Mazanoğlunun bizə ərmağan qalan unudulmaz nəğmələri,qoşma və müxəmməslərindən söhbət açır... Abbas Vəfadağlını atası Əli Mazanoğlunun ənənələrinə sadiq qalan, saz-söz üstə köklənən, yaratmaq və yaşatmaq eşqi ilə zirvələr qoynundan Göyçə gölünün maviliklərinə heyran kəsilmiş doğma kəndi Cilin adını dünyanın məşhur ünvanlarından birinə çevirmək istəyən vətəndaş şair, ictimai xadim olduğunu açıqlayır.

Oxuculara toplunun məzmunu və ideyası barədə məlumat verməzdən əvvəl Abbas Mazanovla vaxtilə birgə maraq göstərdiyimiz bir epizodu xatırlamağı zəruri sayıram:

Dağlıq Qarabağ hadisələri hələ başlamamışdı. Zori Balayanın «Ocaq» kitabında tarixi faktlarının saxtalaşdırılmasına dair Azərbaycan ziyalılarının etirazları yalnız söz-söhbət olaraq ağızlarda gəzirdi. Burada Azərbaycan əleyhinə yazılan ağ yalanlar, yaşayış məntəqələrimizin, yer adlarımızın erməniləşdirilməsi barədəki yazılan uydurmalar hamıda qəzəb doğursa da, İttifaqın və respublikanın əlaqədar orqanlarına sızdırmaq cəhdlərinə baxmayaraq, rəsmi qaydada məlumat verməyə heç kəs cəsarət etmirdi. Ermənistanda ideya-tərbiyə işlərinin təşkilində yol verilən nöqsanlar haqqında Sov. İKP MK-nın qəbul etdiyi qərarla əlaqədar azərbaycan ziyalıları güman edirdilər ki, vəziyyətlə bağlı kitabın müəllifinə də qulaqburması veriləcəkdir. Amma belə olmadı.

Dağlıq Qarabağda mitinqlər tüğyan etdiyi bütün ölkədə əks-səda yaratmışdı. Hamı bu münaqişə ocağının tezliklə söndürüləcəyinə böyük ümid bəsləyirdi. Vəziyətin getdikcə ermənilərin xeyrinə istiqamətləndiyini yəqinləşdirən Azərbaycan zəhmətkeşləri kütləvi mitinqlərə başladılar, bundan sonra Qərbi Azərbaycanın ayrı-ayrı rayonlarında yaşayan yerli azəri türklərinin ermənilərin iddialarının əksinə olaraq 1988-ci ilin 20 iyununda

**«Qarabağ Azərbaycanın ayrılmaz tərkib hissəsidir»** şüarları altında etiraz nümayişləri keçirildi.

Uzun illər Ermənistanda müxtəlif rəhbər vəzifələrdə işləyən, seçkili orqanlarda təmsil olunan, əslən Göyçənin Cil kəndindən olan, ölkənin ictimai-siyasi həyatında fəal iştirak edən, özünün halallığı və saflığı ilə böyük nüfuz qazanan, öz dəsti-xətti ilə şair-publisist, yaradıcı ziyalı kimi tanınan el ağsaqqalı Abbas Əli oğlu Mazanovla görüşəndə ümumi vəziyyətlə bağlı söhbət zamanı daşnaqların mitinqlərdən sonra yaman fəallaşdığını söylədi. Atası Əli Mazanolğlunun xatiratlarından birini olduğu kimi danışdı: **«1918-ci ilin payızında erməni quldurları Basarkeçərdə cəmləşərək Güney Göyçəyə hücuma hazır vəziyyətindəydilər. Bu xəbər bütün kəndlərə çatır. Əli silah tutanlar səfərbər olunur, onlar döyüş üçün Abutalıb oğlu Cavadın başçılığı ilə Basarkeçər tərəfə yeridilir. Böyük Məzrədə bu döyüşçüləri Məşədi İsə və digər qabaqcıl adamlar qarşılayırlar. Cavad Məşədi İsaya bildirir ki, bu gecə Daşkəndə çatmalıyıq. Səhər allahqoysa Qoşabulaqla Basarkeçər arasında döyüş xəttində olacayıq. Siz də adamlarınızla ora gələrsiniz. Belə də oldu. Döyüş qızğın getməsə də ara-sıra atışma olurdu. Cavad bildirdi ki, ermənilər görünür ehtiyat edir, qüvvələrin sayını artırırlar. Hücuma biz keçməliyik. Bu qəti fikir idi. Yeməyimiz tükənmişdi, ac qalırdıq. Tezdəndən qoşabulaqlı Kalvayı Mövlə oğlu Şəmil gilə getdim. Hamı dağ damına getmişdi. Evdə oğlu Xalıqverdi idi. Döyüşə gəldiyimizi bildirdim, o mənə dedi ki, Əli əmi, otur, kasıbın olanından…, anam iki təhnə çörək bişirib qoyub, yaxşı da motal pendirimiz var. Bilirəm, indi dəstənizdə çörəyə ehtiyacı olanlar var. Oturmağa vaxt yoxdur,- dedim, çörəyin birini paralayıb yavan-yavan yedim, 3-4 çörək də götürüb pencəyimin astarına qoydum. Atasını soruşanda erməninin qabağına çıxdıqlarını söylədi.**

**Evdən çıxanda tovləyə bağladığımız atlara baş çəkmək fikrinə düşdüm. İçəri girəndə gördüm ki, toğlucalı Mir**

**İsmayıl Ağa, cilli Məşədi Seyid Əli Ağa və Cavad axurun qabağında quru çörək çeynəyirlər. Zarafatyana dedim ki, bu nədir yeyirsiniz. Patron verin, çörək verim. Cavad gülümsəyib dedi: - Ayə, kimdi Sizdən patron əsirgəyən. Təki Sizin qeyrətiniz olsun, patron işlədin…Mən çörəkləri onlara verib ön xəttə getdim. Hadisələrin necə olacağını, Cavadın əmrini gözləyirdik. Dedilər ki, gecə səngər tapşırılan adam buranı sahibsiz qoyduğu üçün ona cəza verəcəklər…**

**Bir qədər aralıda dayanan Şəmilə gözüm sataşdı. Dağ əzəmətli Şəmil gözümə çox sınqın göründü. Görüşdük… O, məni kənara çəkib dedi: - Əli, bu gecə səngəri sahibsiz qoyan bizim qohumlardandır, anlamayıb, bunlar özbaşına öyrəniblər, heç ağıla da gəlməzdi ki, belə hadisə baş verər. Cavad onu camaatın qarşısında güllələməyə gətirdib. Gör, nə imkanın var…**

**Mən əvvəlcə başçıya bildirməyə cəsarət etmədim, sonra xəlvətyana Cavada çatdırdım və bu dəfə bağışlamağını xahiş etdim. O, çox zəhmlə üzümə baxdı və qəzəblə bildirdi ki, yaxın gəl, kimdir o, tanıyırsan ?!.. Çox narahat halda dedim: -- O çörəkləri onlardan gətirmişdim. Cavad bir an dayanıb dedi:**

**_ Camaat, mənbu Bayramı sağ saymıram, görürəm, Siz də bunun ölümünə razı deyilsiniz, verirəm Sizə…**

**Daşnaqlarla vuruşma başlandı. Bayram çox cəsarət nümayiş etdirdi. Adı çıxan daşnaq «ordusu» kəndli döyüşçülərin qabağında tab gətirə bilmədi. Darmadağın edilib Qaranlığın (Martuninin) ərazisindən o tərəfə geri oturduldu. Qışın başlanması və hər şeyin bitməsi kimi görünən döyüşü dayandırıb kəndlərimizə qayıtdıq. Sonrakı döyüşlər Güney Göyçə üçün çox dəhşətli olsa da, daşnaqlara layiqincə dərsləri verildi…»**

Atasından eşitdiyi bu bir neçə cümləni deyəndən sonra bildirdi ki, ermənilər müvəqqəti uğur qazana bilərlər. Lakin onlar Azərbaycanı birdəfəlik itirəcəklər…

Azərbaycanın ağır günlərində Abbas vəfadatlının «Göyçə kimi intizarda elim var» toplusu müasir həyatımızın bizi üzləşdirdiyi hadisələri ilə səsləşdiyindən olduqca dəyərlidir.Kitabdakı şerlər o qədər kövrək hisslərlə qələmə alınıb ki, onları oxuyan daş ürəkli adamlarda belə, dərin təəssürat oyadır, qəlbindən bir gizilti keçir, gözləri istər-istəməz yaşla dolur. Bu poetik misralar qüvvətli düşmən tərəfindən atəşə tutulmuş, güllə-boran edilmiş, xəsarət və ağır bədən yarası almış sıravi əsgərin, dəstə, bölük və alay komandirlərinin, yurd-yuvasının fikrindən ömrünün son illərini yaşayan ağsaqqalların, ağbirçəklərin, Vətən torpağının səmalarında qanad çalmağa həsrət qalan durnaların fəryadına, harayına bənzəyir.

*...Göyçətək Göyçəsiz qalan Abbasam,*
*Məni bu çöllərə salanım , haray.*

_ deyən şair elini-gününü cihada, imdada, yağı üzərinə hayqırmağa çağırır. “Dünyanın işi” adlı şerində cəmiyyətdəki deformasiyaları, haqq-ədalət istədiyini, haqq deyə-dəyə haqqının tapdanmasını, əqlin, zəkanın satıldığını “Xəbər ver” (1992) qoşmasında torpaqların işğalı ilə namusun getdiyini, arın tapdandığını, adın batdığını, Azərbaycanın hərraca qoyulduğunu, Vətənin qovğaya düşdüyünü aləmə car edir. Gözəgörünməz və ilahi qüvvələri, səcdəgahları, pirləri, övliyaları... Heydər oğlu Xətaini, Xan Eyvazı, Qoç Koroğlunu, İsrafil Ağanı, Qaçaq Kərəmi, Qandal Nağını, Dəli Alını, Cəmşid bəyi, Şadlinskini... haraya çağırır, bütün Azərbaycanı vahid bir orqanizm kimi ayağa qaldırmağın vaxtı çatdığını —

*...Hərə bir dəst qoşun qurub özünə,*
*Millət düşüb nadanlığın nazına,*
*Vəfadağlı, baxma gəda sözünə,*
*Əlirza oğlu Heydər bəyə xəbər ver.* -- misraları ilə ürəyindən keçənləri xüsusi olaraq vurğulayır.

“Oyan, xan Eyvaz, oyan” şerində zülmün asimana dayandığını, gədaların tülkü kimi quyruq bulayıb meydan suladığını, Şuşada çaqqal uladığını..., sanki bu məhrumiyyətlərdən agah olan

Xətainin fikirlərə daldığını, Koroğlunun meydanda təkləndiyini xalqa çatdırır, ər igidləri qisasa, qana qan almağa, müzəffər döyüşə, sarsıdıcı savaşa çağırır. Əzabın ərşə dayandığına, qarşıdurmanın get-gedə rəvac aldığına daha dözə bilməyən A. Vəfadağlı "Oyan, sazım, qılıncım, şöhrətim, şanım, oyan, oyan, ana torpağım. Oyan, odlar diyarı Azərbaycanım, oyan" deyir. Bütün türk dünyasını, tərəqqipərvər bəşəriyyəti köməyə, arxa, dayaq olmağa səsləyir:

*Oyan, ey qoca Şərqim,*
*Oyan Əfqanım, oyan.*
*Qəflətlərə qapılan*
*Oyan, Təbrizim, oyan,*
*Oyan, Altay, Tyanşan,*
*Oyan, Turanım, oyan.*
*Oyan, qoca Türküstan,*
*Yurdum, məkanım, oyan.*
*Parça-parça edilmiş*
*Azərbaycanım, oyan* — deyə-deyə Mili, muğanı, Lənkəranı, Vedibasarı, Naxçıvanı, Göyçəni, Ağababanı, qədim İrəvanı, qoca Zəngəzuru qılıncla, qalxanla, top-tüfənglə əldən gedən nəsillərin, tapdalanan namus və qeyrətin, Qarabağın, Laçın, Şuşa, və Kəlbəcərin xilasına çağırır...

A.Vəfadağlının bu kitabında toplanmış şerlərdəki kədər həm milli, həm də bəşəridir. Laqeydliyi, saymamazlığı, manqurtluğu lənətləyən bu müqəddəs kədərin arxasında çağırış gözləyən, əmr gözləyən fövqəladə bir qəhrəmanlıq, düşmənə aman verməyəcək bir cəsarət, bir məharət dayanır. Bu şerlərin mayası Vətən məhəbbətindən yoğrulduğundan kədəri də, qəmi də, sevinci də, fərəhi də əzizdir, doğmadır, müqəddəsdir. "Göyçə kimi intizarda elim var" deyən şairin sabaha inamı da böyükdür. O, Azərbaycan uğrunda mübarizəyə çağırışın ilk sarsıdıcı döyüş zərbələrini düşmənin Göyçədən, işğalda olan ərazilərdən, onların yurdsevər övladlarından alacaqlarına, torpaqlarımızın yağılardan tezliklə təmizlənəcəyinə, həsrət çəkən səngimiş ocaqlarımızın doğma

sakinlərini öz hərarəti ilə yenidən ağuşunda isidəcəyinə inanır. İnanır ki, bu lirik parçalar oxucuların ürəyinə yol tapacaq, həsrət vüsalı, kədər sevinci əvəz edəcək. Eşqinin başı, şahbazı, ömrünün baharı, yazı olan Vətəninin şəninə yeni-yeni nəğmələr qoşulacaq...

**“ EKSPRESS” qəzeti, 16 iyul 1999-cu il**

**DƏDƏ QORQUD—1300**

## “KİTABİ--DƏDƏ QORQUD” ƏN”ƏNƏLƏRİ AZƏRBAYCAN DASTAN SƏNƏTİNDƏ

Dastan yaradıcılığı dünya ədəbiyyatında ayrı-ayrı xalqların müxtəlif tarixi dövrlərdə ədəbi-bədii, ictimai-siyasi düşüncəsini əks etdirən şifahi yaradıcılıq sahələrindən biridir. Xalqımızın həyatını,məişətini,adət və ən”ənələrini özündə əks etdirən, türk dünyasının qədim mədəniyyət abidələrindən,bədii və fəlsəfi təfəkkürümüzün ən nadir incilərindən sayılan “Kitabi-Dədə Qorqud” xüsusi maraq doğurur.

“Kitabi-Dədə Qorqud” boylarının qəhrəmanlıq dastanlarının struktur cəhətdən formalaşmasında tə”siri aydın görünür. “Koroğlu” dastanında təsvir olunan bu və ya digər əhvalatlar “Dədə Qorqud” boylarından götürüldüyündən xəbər verir.Dədə Qorqud dastanın bütün boylarında iştirak etdiyi kimi,Koroğlu da dastanın bütün qollarında iştirak edir,”dəlilər” dara düşəndə onların harayına çatır,düşmən əhatəsindən xilas edir. Dədə Qorqud isə çətinliyə düşənlərə məsləhət verir,yol göstərir,ozan kimi ağsaqqallıq edir.

“Dədə Qorqud” boylarındakı Bamsı, Buğac, Dəli Domrul, Səgrək və digər qəhrəmanlar şücaət göstərdikdən, düşmən öldürdükdən, el içində məşhurlaşdıqdan sonra adlar aldıqları halda, “Koroğlu” dastanında təsvir olunan “dəlilər” göstərdikləri qəhrəmanlıqların səciyyəsinə görə Dəli Həsən, Dəmirçioğlu, Tanrıtanımaz, Halaypozan, Topdağıdan və b. adlanırlar.

"Dədə Qorqud" boyları xalq romanlarımızın formalaşmasında da əvəzsiz rol oynamışdır.***"Aşıq Qərib və Şahsənəm", "Şah İsmayıl və Gülzar","Alı Xan və Pəri","Novruz və Qəndab", "Abbas və Gülgəz","Tahir və Zöhrə", «Məhəmməd və Güləndam», "Kərim və Süsən" və*** bu kimi dastanların süjeti, qəhrəmanlarının taleyi baxımından bə"zi fərqləri nəzərə almasaq, forma və məzmun cəhətdən sanki "Bamsı Beyrək" boyuna oxşadıqları aydınca hiss olunur.

"Dədə Qorqud" boylarının sonunda Qorqud Dədə qopuz çalır, ad qoyur, xeyirxah məsləhətçi kimi diqqəti cəlb edir, xalq romanlarında isə uzaq səfərdən sevgilisi ilə qayıdan qəhrəmanların keçirdiyi toy şənliyinin sonunda aşıq tərəfindən söylənilən duvaqqapma ilə dastan yekunlaşdırılır.

"Dədə Qorqud" boyları özündən sonra yaranan klassik dastanlarla yanaşı, müasir dastanların formalaşmasında da əvəzsiz rol oynamışdır. Kökünü əsasən klassik dastanlardan alan müasir dastanlar folklora xas olan şifahi yolla yaranma ənənəsini əsrin əvvəllərində mühafizə etmiş, yeni yaranan dastanlar özünə yaşadığımız zəmanədə də maraq doğurmuşdu. Əsasını yazılı mənbələrdən alan, real tarixi hadisələrlə səsləşən və müasir həyatın tərənnümünə həsr olunan yeni dastanlar məlum müəlliflər tərəfindən yaradılmışdır. "Dədə Qorqud" ənənələrindən bəhrələnən bütün aşıq mühitlərində, o cümlədən "Göyçə aşıq mühiti"ndə də tükənməz aşıq dastanları meydana gəlmişdir. Aşıq Ələsgərin ***"Aşıq Ələsgərlə Dəli Alı", "Aşıq Əsədin "Nizami",*** Aşıq Bəhmənin ***"Əfqan və Tufan", "Bəşmən və Humay"***, şair Kazımın ***"Kazım və Nazlı xanım"*** dastanlarını və başqalarını göstərmək olar. Bu dastanlar folklora xas olan qədim ənənələri mühafizə edib saxlamasına, klassik dastanlara oxşayan cəhətləri olmasına baxmayaraq bir çox fərqli cəhətləri ilə diqqəti cəlb edir.

Müasir dastanlar aşıq-saz yaradıcılığının və dastan irsimizin sonrakı dövrlərdə yaradılan nümunələri kimi, əsasən aşıq məclislərində geniş yayılmışdır. Dədə sənətkarların yaratdığı

dastanlar istisna olmaqla, məhəlli səciyyə daşıyan bu dastanları yaradan müəlliflərdən başqa çox az adam bilir, çünki onlar müəllif-aşıqların özlərinin ifasında yaşadıqları ərazilərin məclislərində söylənildiyindən kütləvi surətdə yayılmır. ***"Dədə Qorqud", "Koroğlu", "Aşıq Qərib və Şahsənəm"*** dastanlarını bilməyən elə bir ustad aşığa təsadüf etməzsən, bu dastanlar, hətta, türkdilli xalqlar arasında da məşhurdur, lakin yeni dastanların kütləviliyi təmin olunmadığına görə, əksər aşıqların onlar barədə məlumatları ya səthi olur, ya da heç olmur.

"Dədə Qorqud" ənənələrindən bəhrələnən sənətkarlarımız öz yaradıcılıqlarında həmişə Dədə Qorqud adını müqəddəslik rəmzi kimi çəkmişlər. Könül rübabının incə telindən "Saz" şerində söhbət açan Hüseyn Arif loğman kamallı müdrik insanı yad edir:

*Saz dedim, söz dedim, Dədə Qorqudun*
*Möhtəşəm görkəmi yadıma düşdü.*
*Gəldi Ozan baba dili nəğməli,*
*Mübarək qədəmi yadıma düşdü.*

"Sinəm sözlə dolarmı heç?! Qorqud Dədəm, Ozan babam!"-- deyən sinədəftər şair Zəlimxan Yaqub, Dədə sözünün mahiyyətini vurğulayır:

*...Hünər göstərənə kim ad verəcək,*
*Bir də yetirməsə vədə Qorqudu.*
*Ağsaqqal qədrini ağsaqqal bilər,*
*Başa tac bilərmi gədə Qorqudu?!...*

"Dədə Qorqud" və digər qəhrəmanlıq dastanlarında diqqəti cəlb edən insan və təbiət, yad ölkələrə səfər, qardaş məhəbbəti, qardaş sədaqəti, oğulun ata-ana uğrunda fədakarlığı, oğul və ana həyəcanı, digər bu kimi psixoloji-dramatik hallar bizim hər birimizdə onların qəhrəmanlarının fəaliyyət dairəsi, mənəvi aləmi barədə bütöv bir dünyagörüşü yaradır. Bu göstərilən cəhətlər "Dədə Qorqud" ənənələrini özündə yaşadan klassik və müasir dastanlarımız üçün də səciyyəvidir.

Təqdirəlayiq haldır ki, "Kitabi-Dədə Qorqud"un 1300 illiyinin keçirilməsi barədə Azərbaycan Respublikası Prezidenti Heydər

Əliyevin müvafiq sərəncamına uyğun olaraq, rektorumuz, görkəmli elm təşkilatçısı, professor Seyfəddin Qəndilovun bilavasitə rəhbərliyi ilə Dövlət İdarəçilik Akademiyasıda həyata keçirilən çoxsaylı tədbirlər hazırkı şəraitdə gənclərimizin Vətənə, torpağa, xalqa bağlılığını "Dədə Qorqud" boylarında təsvir edilən qəhrəmanlıq motivləri baxımından qiymətləndirməyə zərurət yaradır. Bu sərəncamdan irəli gələn vəzifələrin yerinə yetirilməsində hər kəsin vətəndaşlıq payı olmalıdır.

"Dədə Qorqud" dastanı nəsillərə mənəvi töhfədir. Onu oxuyub mənasını dərk edən vətən övladlarına obanın obaya, tayfanın tayfaya, nəslin nəslə sığınaraq Oğuz elinin, Oğuz cəmiyyətinin, Oğuz dövlətinin birliyini qorumaq kimi ülvi duyğuları, müqəddəs hissləri təlqin etmək son dərəcə gərəklidir, zəruridir. Odur ki, keçirilən hər bir tədbirin leytimotivini indiki şəraitdə vətən torpaqlarının işğalçı ermənilərdən azad edilməsində bir yumruq kimi birləşməyə, düşmən qarşısında əyilməyən ulu əcdadlarımızın, ata-babalarımızın yenilməz igidlikləri timsalında şücaət göstərməyə ruhlandırmağın rəhni olmalıdır.

**"Respublika" qəzetinin 30 aprel və "Azərbaycan" qəzetinin 1 may 1999-cu il tarixli sayları.**

## "ELKÖÇDÜ"

Ömrümə bəzək, taleyimə yaraşıq bir məhəbbət istəyirəm mən... Bəli, məhəbbət!.. Sizə yazıram bu e"tirafı. Sizə söyləyirəm ürəyimdəkiləri... Uşaqlıqdan xoşladığım bir saz havası var..."Elköçdü" havası... Bu havanın e"cazkar səsi, onsuz da kövrək olan könlümü daha kövrək, daha dözümsüz edib. Onun ürək yandıran sədaları mənə sevgi kimi nəcib bir hissi aşıladı. İlk məhəbbətimi tapdım bu havada... Qəlbimdəki bütün arzuları yaz

gülləri kimi ətirli, təravətli və gözəl sandım. Özümü dağlardan da uca sandım ülvi məhəbbətimlə... Həyata da sevgilimin gözləri ilə baxdım, gözəllikləri də onun gözləri ilə duydum...

Ulu Göyçəmin çəmənliklərində bitən yaz güllərinin və çiçəklərinin ətrindən rayihələnə-rayihələnə gəncliyimdə keçirdiyim günlərin, xoş anların şirinini, acısını səninlə tamamladım, ”Elköçdü”!

Vüsala çatmaq, məhəbbətinə , sevginə qovuşmaq hələ hər şey demək deyilmiş...Başımıza nələr gətirildi, nələrə mə”ruz qaldıq, nələri və kimləri itirdik, nəyə görə itirdik?!... Soruşmağa da dəyməz. Ata yurdunda arzuladığım zirvələr çıxılmaz oldu. Lakin məhəbbətim məni ictimai uğursuzluqlardan xilas etdi. Məhəbbətimin ilk nübarı olan Namiqimin süd qoxulu nəfəsi həm ata ocağımı bəzədi, həm də ruh düşgünlüyündən xilas etdi. İlk dəfə ata adı ilə çağırılanda da sən çalındın, “Elköçdü”!.. Sənin həzin melodiyaların altında Namiqimdən sonra dünyaya göz açan İlhaməm, Ruhiyyəm,Vüsaləm, Orxanım sevgi və məhəbbət payımdan ömrümə yaraşıq, bəxtimə düşən Günəşim, Ayım , həyatımda ən istəkli payım oldular…

Ata çağıranlarla yanaşı, indi baba çağıranların da səsinin müqəddəsliyindən sonsuz həzz alıram. Nəvələrimin ağız dolusu «baba» deyə müraciət etmələri dünyanın hər nemətindən mənə əzizdir. İndi həyatda ən çox sevdiyim insanların sırasına iki ad da qoşulub: Leyla, Fidan… Bu sıra getdikcə sıxlaşacaqdır. O sıranın önündə Leyla dayanacaq…

Qaçqınlıq, köçkünlük həyatı yaşayanlar, dədə-baba yurdunın həsrətində olanlar bir gün taleyin qisməti, Tanrının köməyi ilə «Elköçdü»nün həzin melodiyaları altında öz doğma ocaqlarına qayıdarlar. Ailəmiz də nağıllaşan doğma Göyçəsinə, dastanlaşan müqəddəs Şuşasına qovuşar…

**Şuşa, F.Köçərli 6-a, mən. 5, 1977-1991. Bakı, Azadlıq prospekti,**
**30, mənzil 3, 2002**

## MƏNƏVİ DƏYƏRLƏRİ YAŞADANLAR

Görkəmli filosoflar insan həyatının, insan mənəviyyatının özözlüyündə ən böyük sərvət olduğunu, insanın qalan sərvətlərini də müəyyənləşdirdiyini, başqa canlılardan fərqli olaraq, öz ömrünü uzatmaq uğrunda daima mübarizə aparan ictimai varlıq olduğunu, yalnız kor-koranə yaşamayıb, həm də şüurlu surətdə öz həyatının mənası üzərində düşündüyünü, cansağlığını, fiziki sağlamlığını qoruduğunu , öz səhhəti qeydinə qaldığını etik baxımdın səciyyələndirmişlər. Eyni zamanda, insanın yaşadığı cəmiyyətdəki, fəaliyyət göstərdiyi mühitdəki və yaşadığı ailədəki rolunu müstəsna dərəcədə dəyərləndirmişlər.

İnsan həyatını mənəvi dəyərlərlə zənginləşdirən, onu mənalandıran əxlaq normalarının yerinə yetirilməsinə xüsusi əhəmiyyət verən, yaşayıb-yaratdığı cəmiyyətin mütərəqqi inkişafını təmin edən, xalqının adət-ənənələrini əsirlərdən nəsillərə yaradıcılıqla ötürən, ömrünü-gününü vətəninin çiçəklənməsi və tərəqqisi işinə xidmət etməkdə görən hər bir kəs özünü xoşbəxt sanmaqda mənəvi cəhətdən haqlıdır. Bu mənəvi keyfiyyətlərdən söhbət düşəndə, ilk növbədə, hansı ərazidə yaşamasından asılı olmayaraq, nümunəvi azərbaycanlı ailələri və bu ailələrə başçılıq edən , daha doğrusu, kənardan barmaqla göstərilən ağsaqqallarımız, ağbirçəklərimiz - müdriklərimiz göz önündə canlanır. Belə insanları biz müqəddəsləşdirir və «büllur ailələr»in başçısı timsalında qiymətləndirir, hörmətini saxlayır, yaxın münasibətimiz olmasa da, onlara kənardan qibtə edir və sonsuz ehtiramımızı bildiririk.

Yüksək , son dərəcə əzəmi keyfiyyətləri ilə seçilən çoxsaylı ailələrlə ünsiyyətdə olmuş və çoxları barədə yaxın dostlarımdan eşitmişəm. Saxladığım sıx əlaqələr və müşahidələrim bu ailələrin mənəvi cəhətdən kamilliyi, ictimai amallara üstünlük verdikləri , başqalarının sevincini və səadətini özününkü saydıqları, bəşəri duyğularla yaşadıqları məni heyran edib. Onların yalnız yaxşılıq

etmək, imdada gəlmək, ölüm ayağında olanların həyatını xilas etməkdən başqa ayrı düşüncələri olmadığının canlı şahidinə çevrilmişəm. Belə ailələrdən söhbət düşəndə yaddaşımda daha tez canlananlar sırasında keçmiş müəllimim, əslən Masallıdan olan görkəmli pedaqoq-alim Əhməd Əhmədovun, tanınmış orqan işçisi mərhum Akif İsmayılovun, tələbə dostum, pedaqoji elmlər doktoru, professor Fərahim Sadıqovun, həmkarım, tarix elmləri doktoru Musa Quluzadə və həmin rayonun Aqaşbəyli kəndində barmaqla göstərilən İbrahim müəllimin ailələri xoş xatirələri çözələyir… Bu yazıda kənd müəllimi kimi əmək fəaliyyətinə başlayan və doğma rayonunda rəhbər vəzifələrdə çalışan, onun sosial-iqtisadi inkişafında əvəzsiz xidmətləri ilə seçilən İbrahim əminin kökəbağlı, Ulu Tanrının dərgahına sığınan, nəciblikdə və munislikdə tayı-bərabəri çox az olan ailəsindən söhbət açmaq bir publisist kimi mənim üçün daha xoşdur. Çünki qeydlərimin əvvəlində insan və onun mənəvi dəyərləri barədəki ifadələr sözün əsl mənasında, bu ailənin səciyyəvi xüsusiyyətləri ilə bilavasitə üzvü surətdə bağlıdır, daha dəqiq desək , bu ailəyə daha çox aiddir. Köklü-budaqlı , respublikamızın hüdudlarından uzaqlarda da tanınan bu ailənin özü kimi , hər bir üzvü də insani keyfiyyətlərin əsas meyarlarının nikbin daşıyıcıları olduqlarına və fəal həyat mövqelərinə görə sonsuz məhəbbətə, hədsiz ehtirama layiqdirlər, elin-obanın, daha geniş mənada xalqının fəxrli övladları kimi ünvan qazanmaqda mənəvi haqları vardır.

İbrahim İsmayılov ömrünün bu ixtiyar çağında yola saldığı illərin axarında həyatının ən dəyərli, ən yaddaqalan, əlsiz-ayaqsızlara göstərdiyi qayğı və köməkliyin xoş anlarını bir sinema pərdəsi kimi gözü önündən keçirir. İmkanı daxilində elədiklərini və imkanı xaricində olduğundan eləyə bilmədiklərini yada salanda həm böyük qürur hissi keçirir, həm də təəssüflənir. Amma özünün həyata keçirə bilmədiyi istək və arzularının övladları tərəfindən daha mükəmməl şəkildə yerinə yetirildiyini görəndə fərəhi yerə-göyə sığmır , köksünün altında döyünən ürəyi övladlarının ünvanına edilən təriflərdən təsəlli tapır. Övladları

barədə eşitdiyi hərbir xoş söz ata qəlbinin dərinliklərində baş qaldıran duyğuların ilhamçısına çevrilir. Yeddi övlad böyüdüb-başa çatdıran ömür-gün yoldaşı Vəcihə xanım İsmayılovanın yuxusuz gecələrinin, narahatçılıqlarının bar-bəhrə verdiyini böyük məmnunluqla təsəvvüründə canlandırır. Ömrünün çiçəkləndiyi bir vaxtında avtomobil qəzasından dünyasını dəyişən gözünün ilki, məhəbbətinin ilk yadigarı , ciyərparası İsmayılın Odessada Gəmiçilik İnstitutuna qəbul olduğu , buranı müvəffəqiyyətlə başa vurduğu günlərin acılı-şirinli xatirələrini qəlbində yaşada-yaşada atalıq qürurunun əzəməti qarşısında olub-keçənləri Allahtala tərəfindən qismət olan alın yazısı adlandırır. Təsəllisini iqtisadçı oğlu İsrayılın, Ə.Əliyev adına Respublika Həkimləri Təkmilləşdirmə İnstitutunun stamotologiya kafedrasının dosenti, tibb elmləri namizədi Məzahirin, «Medikal serviz» Özəl Tibb Mərkəzinin direktor müavini və buradakı «Hemodializ bölməsi»nin müdiri Hikmətin, Nəsimi rayonundakı 3 saylı şəhər poliklinikasında diş həkimi işləyən yeganə qızı Nüşabənin…, diş texniki işləyən kiçik oğlu Raufun , Qarabağ müharibəsinin veteranı olan oğlu Yelmarın Azərbaycan cəmiyyətində baş verən müsbət dəyişiklərin keçid mərhələsində ailələrinin tərbiyəsinə uyğun özlərinə hörmət, izzət, şan-şöhrət qazanmalarını ata-ana sevincinin meyarı , çəkilən zəhmətin, sərf olunan əməyin bəhrəsi kimi qiymətləndirir. Övladlarının hər biri haqqında eşitdiyi xoş sözləri, valideynlərinə edilən təşəkkürləri həyatında ən böyük mükafat, əvəzsiz dövlət təltifi sayır.

İbrahim əminin ailə tərcümeyi-halından yığcam məlumatla qənaətlənmək də olardı. Burada son vaxtlar yaxından təmasda olduğum, adamlara göstərdiyi diqqət və qayğısından olmazın qədər razı qaldığım, ülvi insanlıq duyğularını yaşatmağı hər cür maddi imkandan daha üstün tutan, işlədiyi özəl tibb ocağına müalicəyə gələnlərə munis rəftarı ilə şəfqət bəxş edən, xəstələr tərəfindən adı ağızdolusu çəkilən Hikmət həkim haqqında qəlbimdən keçənləri publika vasitəsilə Hikmətsevərlərə çatdırmaq imkanından istifadə etməsəm, laqeyd bir adam kimi özümü

bağışlamaram: *Hikmət İbrahim oğlu İsmayılov 1982-ci ildə N.Nərimanov adına Azərbaycan Tibb İnstitutunun «Müalicə-profilaktika» fakültəsini bitirib. Təyinatını Mingəçevir MŞX-na alıb, bir müddət burada çalışıb, Dnepropetrovsk şəhərində ordu sıralarında həkim kimi xidmətdə olub , hərbi hissədə tibbi xidmət rəisi vəzifəsində çalışıb. 1987-ci ildən 1990-cı ilədək Bakı Şəhər Mərkəzi Təcili Tibbi Yardım Stansıyasında , 1990-1992-ci illərdə Ə.Əliyev adına Həkimləri Təkmilləşdirmə İnstitutunun nefrologiya kafedrasının klinik ordinaturasında aparıcı həkim işləyib. 1992-2000-ci illərdə Mir Qasımov adına Respublika Klinik Xəstəxanasının «Reanimasiya və intensiv terapiya» şöbəsində hemodializ üzrə bölməyə rəhbərlik edib. İndi respublikada yeganə olan özəl tibb mərkəzinin aparıcı rəhbərlərindən ən birincisidir... O, bir çox xarici ölkələrdə olub. Həkim kimi zəlzələdən ziyan çəkənlərə tibbi yardım göstərmək üçün 1990-cı ildə İranda , 1999-cu ildə Türkiyədə olub. Almaniyada, Rusiyada, Türkiyədə və İranda ixtisasartırma kurslarında təhsilini artırıb. Ailəlidir , Həyat yoldaşı Natəvan* xanım *ixtisasca həkimdir. Azər və Toğrul adlı iki oğlu var.*

Hikmət həkimi Azərbaycanın səhiyyə sistemində, demək olar ki, hamı tanıyır. Onun xarakterindəki səmimilik, bütövlük, adamlara yüz ilin tanışı kimi yanaşması ailədə aldığı tərbiyənin mükəmməlliyini, köklü-budaqlı bir nəslin dədə-babadan qoruyub-saxladığı milli dəyərlərin yeni tarixi şəraitdə insanlara gərəkli olmağının nə demək olduğunu təlqin edir. Yaşamağın daha da şirinləşdiyini, bu işıqlı dünyanın gözəlliklərindən doymayan və çətinliklərindən ləzzət ala-ala hər cür məşəqqətlərə sinə gərən insanların keçirdiyi hislər bu böyük ürək sahibini müəyyən məqamlarda həm düşündürür, həm də narahat edir. Ətrafında həyəcan keçirənlərin sosial tərkibi, ictimai mövqeyi barədə düşünməyə ehtiyacın olmadığını hərəkətlərində, verdiyi məsləhətlərində, tövsiyələrində, saymazyana göstərdiyi qayğısında hiss etdirir , yalnız bəşəri dəyərləri yaşatmaq zərurətinə üstünlük verməyin insanlıq , həmvətənlilik naminə

milli, həm də sosial-psixoloji aspektlərini nəzərdə saxlayır… Onunla daimi təmasda olan , həyatla ölüm arasında çırpınanları mübtəla olduğu ağır xəstəlikdən xilas etmək üçün Akad. M. Topçubaşev ad.Elmi Tədqiqat Klinik Təbabət İnstitutunun direktoru akad. B. Ağayev, baş həkim Mehman Əliyev və dializ şöbəsinin müdiri Xanbaba Hüseynov, M. Qasımov adına Respublika Klinik Xəstəxananın baş həkimi Vaqif Cəfərov və bu xəstəxananın tanınmış cərrahlarından tibb elmləri namizədi, dosent Telman Rzayev, nefrolqlarından Vaqif Müseyibov, Darvin Qələndərli, reanimotoloqlarından Ülfət Rzayev, Etibar Əlləzov, həkimlərdən Şahin Qədimov, Vidadi Həsənov, Qabil Bayramov, Rəhim Babayev, tibb bacılarından Təranə Kərimova, Bəsti Əzizova, Məlahət Xudaverdiyeva və Bəyim Əlizadənin Hikmət İsmayılov barədəki xoş sözlərini eşitdikcə, adam özündə bir mənəvi rahatlıq duyur. Söylənilən bu yüksək insani keyfiyyətlərin təkcə bir neçə şəxsə deyil, adı çəkilən sağlamlıq keşikçilərinin hamısına aid olduğunu vurğulamaya bilmirsən. Onların şəfalı əllərinin, həkim qayğısının əməli nəticələrini öz ailələrində sevincini duyanların ürək sözlərini , təşəkkürlərini açıqlamalı olursan…

Hikmət həkimin müalicə etdiyi xəstələrdən Bakı şəhər sakinləri Məmmədova Sədaiqət İslam qızı, Babayev Etibar Hümmətalı oğlu və başqalarının dilində dolaşan xoş sözlərin təsirindən ayrıla bilmədiyimdən bu qeydləri etməyi özümə vətəndaşlıq börcu saydım. «Ekspress» qəzetinin oxucularına mənəvi dəyərlərimizi yaşadanların bir dəstəsi barədə qəlbimdən keçənləri Hikmət həkimin şəxsində çatdırmaq istədim.

Bir haşiyə: Respublikanın Səhiyyə Naziri Ə.İnsanov cənablarının rəhbərliyi və şəxsi təşəbbüsü ilə son illər respublikamızda səhiyyə ocaqlarının şəbəkəsinin genişləndirilməsi, müasir dövrün tələblərinə cavab verən medikal mərkəzlərin yaradılması istiqamətində çox böyük işlər görülmüşdür. Bu iş indi də davam etdirilir. Lakin yaradılan medikal mərkəzlərdən əhalinin bütün təbəqələrinin istifadə etmək

imkanlarını nəzərə almaq, xüsusən dializə olunanların donorlarının, cərrahi əməliyyatlarının respublikada aparılmasını təmin etməyə bu gün böyük ehtiyac vardır. Xeyli vaxtdır ki, yaxın qohumum dializə mərkəzinin xidmətindən istifadə edir. Burada müalicə olunanların yaxınları ilə söhbətlərimiz, dərdləşmələrimiz , daha doğrusu, dərdimizin eyniliyi bizi birləşdirib. Bu adamların içərisində elələri var ki, körpə uşaqlarının gələcəyinin necə olacağını düşünmədən istəkli ərini, həyat yoldaşını, oğlunu, qızını yaşatmaq üçün evini satıb ödənişli dializ seanslarına gətirməkdə davam edirlər, ayrı bir əlacları da yoxdur. Onların əksəriyyətinin arzusu və tələbi odur ki, Səhiyyə Nazirliyinin strukturunda özəl deyil, böyrək xəstəliklərindən əzab çəkən xəstələr üçün dövlətin tabeliyində olan , eyni zamanda güzəştli kompleks müalicə və əməliyyat aparılan «Dializ mərkəzi» açılsın. Dializə olunan xəstələrə maddi köməklik məqsədilə bankda fond yaratmaq və hesab açmaq üçün Respublika Ədliyyə Nazirliyinə vətəndaşlar tərəfindən təqdim olunmuş sənədlər qeydiyyatdan keçirilsin. Xəstələrin və onların yaxınlarının arzu və istəkləri çoxdur, xarici ölkələrdə dializ olunan xəstələrə pulsuz və ya güzəştli xüsusi xidmət göstərildiyi halda, bizdə belə xəstələr qeydiyyata və növbəyə götürülür, növbəsi çatanda güzəştli göndəriş verilir.

Həkimlik çətin olduğu qədər də şərəflidir. Bu şərəfli işdə xalqının sağlamlığı naminə əlindən gələni əsirgəməyən Hikmət həkimə çoxsaylı ailələr adından, şəxsən Kərimovlar adından minnətdarıq edir və müqəddəs işində uğurlar arzulayıram.

**«Ekspress» qəzesti № 91(1015) 16 may, «Xalq qəzetinin» 13 iyun 2002-ci il tarixli sayları.**

Ali məktəblərdə Azərbaycan dilinin tədrisi bu fənnin orta məktəb həcminin davamı olub, bir tərəfdən Azərbaycan dilinin elmi-nəzəri əsaslarının daha dərindən öyrənilməsinə, digər tərəfdən tələbələrin yazılı və şifahi rabitəli nitqinin daha yüksək səviyyədə inkişaf etdirilməsinə, onlarda bu dilə olan marağın dərinləşməsinə xidmət edir.

Tələbələrin Azərbaycan dilini dərindən mənimsəməsində şifahi xalq ədəbiyyatı nümunələrindən istifadə, dilin folklorla bağlı tədrisi çox təsirli və əvəzedilməz vasitədir. Ona görə də Azərbaycan dilinin tə'limində şifahi xalq ədəbiyyatı nümunələrindən didaktik vasitə kimi istifadə edilməsinə və bu iki sahənin əlaqəli tədrisinə xüsusi diqqət yetirilməlidir. Azərbaycan dilinin tədrisində «Fonetika» bəhsindən başlamış «Sintaksis»in sonuna qədər bütün dərslərdə şifahi xalq ədəbiyyatı nümunələrindən istifadə etmək və tə'limin intensivləşməsi və mənimsənilməsi üçün optimal şərait yaradılmasına nail olmaq mümkündür. Lakin bu zaman təlimi elə qurmaq, istifadə üçün elə materiallardan bəhrələnmək lazımdır ki, bu nümunələr həm didaktik məqsədə xidmət göstərə bilsin, həm də Azərbaycan dilinin işlənmə dairəsi, bu dilin qüdrəti, gözəlliyi haqqında tələbələrdə dərin təsəvvür yaratmağa köməklik göstərsin. Bu yazıda Azərbaycan dilinini təlimində bəzi mövzuların tədrisi zamanı şifahi xalq ədəbiyyatı nümunələrindən necə istifadə etmək imkanlarını əks etdirmək qarşıya məqsəd qoyulmuşdur. Bu işdə həm də lazım ola biləcək didaktik materiallar verilmiş, mövzu ilə əlaqəli nümunələr qeyd edilmişdir.

«Fonetika»nın tədrisi danışıq səslərinin öyrənilməsi ilə başlayır. Müəllim tələbələrə ümumi səs anlayışı haqqında məlumat verərək bildirir ki, səs anlayışı geniş məfhumdur. Bizi əhatə edən ətraf aləm bütünlüklə səslərdən ibarətdir: suyun şırıltısı, küləyin vıyıltısı, göyün gurultusu, çayın qıjıltısı və s. Lakin «Fonetika»da bütün səslər deyil, yalnız danışıq səsləri öyrənilir. Danışıq səsləri isə insan orqanizminin tərkib hissələri olan danışıq üzvlərinin

vasitəsilə formalaşır. Belə ki, danışıq üzvlərindən hər biri ayrı-ayrı danışıq səslərinin düzgün tələffüzündə çox fəal iştirak edir. Bunu aşağıdakı tapmacalar üzərində iş aparmaqla aydınlaşdırmaq mümkündür:

*Dəy, dəy deyərəm, dəyməz,*
*Dəymə, dəymə deyərəm, dəyər.* (Dodaq)

*Atada dəyməz,*
*Babada dəyər.*
*Xalada dəyməz,*
*Əmidə dəyər.*(Dodaq)

*Dəyərə dəyməz,*
*Dəyməzə dəyər.* (Dodaq)[13]

Tələbələrə xatırladılmalıdır ki, bu tapmacalarda biz «b» və «m» səslərini dodaqların fəal iştirakı ilə tələffüz edirik. Biz tərkibində «b» və «m» səsləri olan dəymə, baba, əmi, kəlmə, dəyməz sözlərini tələffüz edərkən dodaqlar bir-birinə toxunur. Elə buna görə də verilmiş tapmacaların üçünün də cavabı «dodaq» hesab olunur.

Məlum olduğu üzrə, dodaq samitlərinin, yəni b, p və m samitlərinin iştirak etmədiyi xüsusi şer növü vardır ki, aşıq yaradıcılığında buna «dodaqdəyməz» deyilir. Bu şer növündə dodaq samitləri işlədilmir və şeri oxuyarkən heç bir sözdə dodaqlar bir-birinə toxunmur. Nümunə üçün Aşıq Ələsgərin «Nə dadı» dodaqdəyməzindən istifadə etmək olar:

*Təriqətnən həqiqəti qananlar,*[14]
*Həqiqətin təriqətdən nədadı?* [15]

---

[13] Azərbaycan folkloru antologiyası. Birinci kitab. Bakı, 1968, səh. 208-210.
[14] Aşıq Ələsgər. Bakı, 1963, səh.222

*Hansı şah haqqınan ilqar eylədi,*
*Nə incidi, nə ah çəkdi, nə dadı?* [16]

*İstəyirsən seyr edəsən Sinanı*[17]*,*
*Şər işlərdən sağın saxla sinanı*[18]
*Sədət gətdi sin içində se nanı*[19]*,*
*Dildə qaldı nə ləzzəti, nə dadı*

*Ələsgər də eşq içində qaladı*
*Şirin canın atəşinə qaladı;*
*Ər igidin canı getsə qaladı* [20]*,*
*Nakəslərin dəhr içində nə dadı*[21]*.*

Verilmiş şeri müəllim özü və ya tələbələrdən biri oxuduqdan sonra onların arzusu ilə hər hansı iki bəndi yazı taxtasında yazıb, tələbələrə oxutdurmaq olar. Bu zaman onlara tapşırmaq lazımdır ki, şeri oxuyarkən öz tələffüzlərinə fikir versinlər. Beləliklə, onlar öz tələffüzləri üzərində müşahidələr aparır və aydınlaşdırırlar ki, doğrudan da ayrı-ayrı danışıq səslərinin əmələ gəlməsində danışıq üzvlərindən bəzilərinin daha fəal iştirakı açıq-aydın hiss olunur.

Məşğələni bu cür qurarkən tələbələrə izah edilməlidir ki, aşıq şeri şifahi xalq ədəbiyyatı nümunəsi olduğundan burada canlı xalq danışıq dilindən daha çox istifadə edilir, həm də bu şerlər müəyyən dövrlərdə yarandığına görə burada arxaik sözlərdən istifadə edilmişdir. Verilmiş şerdəki arxaik sözlərin mənasını ya lüğət şəklində yazmaq, ya da aşağıdakı kimi «Çata-çat»

---

[15] Нядир ады? Нядир фярги?
3 Нядир ады? Нядир фярги?
[16] Ня дад чякди.
[17] Сина даьыны.
[18] Синяни
[19] Цч чюряйи
[20] Галар ады.
[21] Нядир ады ?

qoşmasındakı ərəb-fars mənşəli sözlərin mənasını izah etmək lazımdır:

Çək əstərin, çal çatığın çata-çat! – misrası «atını çəkib lazım olana çat» mənasında işlənmişdir. Buradakı əs sözü fars dilindəki «əsb» sözündən olub, « at » mənasını ifadə edir.[22]

Hərcayı - fars dilindəki hərcayi sözünün dəyşilmiş şəkli olub, « avara , sərgərdan, veyl gəzən, evi, yurdu olmayan » mənalarını ifadə edir. (2)

*Dəst -fars dilində «əl» mənasını bildirir.(3)*
*Çal–«pis, əyri-üyrü mənasında işlənmişdir.*

Bu izahatdan aydın olur ki, aşıq şerində arxaik sözlərlə yanaşı, həmin dövr üçün işlək olan alınma (fars mənşəli) sözlərdən, loru sözlərdən istifadə edilmişdir.

Danıışıq səslərinin formalaşmasında danışıq üzvlərinin fəal iştirakını aydınlaşdırmaqdan ötrü tələbələri aşağıdakı çalışma tapmacalar üzərində də işlətmək olar:

*Otuz iki qılınclı qoşunun*
*Bir at sərkərdəsi var. (Dişlər və dil)*

*Qırmızı divar,*
*Ağ fərələr. (Ağız və dişlər)*

Tələbələr ayrı-ayrı səslərin tələffüz qaydalarını öyrənmək yolu ilə müəyyənləşdrirlər ki, birinci tapmacanın cavabı «dişlər və dil» ikinci tapmacanın cavabı «ağız və dişlər»dir.

Sait və samit səsləri, onların hər birinin növlərini tədris edərkən şifahi xalq ədəbiyyatı nümunələrindən didaktik material kimi istifadə etmək olar. Dərsin bu cür qurulması həm canlanma yaranmasına, həm də dərsin daha maraqlı keçməsinə səbəb olur. Nümunə üçün biz aşağıdakı çalışmaları təqdim edə bilərik:

---

[22] Азярбайъанклассик ядябиййатында ишлядилян яряб вя фарс сюзляри лцьяти. Бакы 1966, сящ. 62, 201, 45

Çalışma 1. Verilmiş atalar sözlərində sait səsləri tapıb altından xətt çəkin.

*Ağac bar gətirəndə başını aşağı əyər.*

*El gücü,*
*Sel gücü.*

*Dost dosta tən gərək,*
*Tən olmasa gen gərək.*

*Bağa baxarsan bağ olar,*
*Baxmazsan dağ olar.*

*Cəfa çəkməsən,*
*Səfa görməzsən.*[23]

Çalışma 2. Verilmiş layla və atalar sözlərini oxuyun. Altından xətt çəkilmiş sözləri mənaca bir-birindən fərqləndirən səsləri göstərin.

*Laylay dedim yatınca,*
*Gözlərəm ay batınca*
*Canım cəzana gəldi*
*Sən hasilə çatınca.*

*Kasıbın sözü,*
*Palıdın közü.*

*Palaza bürün,*
*El ilə sürün.*

[23] Азярбайъан фолклору антолоэийасы. Биринъи китаб. Бакы 1968

Çalışma 3. Verlmiş yanıltmacları köçürüb, cingiltili samitlərin altından xətt çəkin. Sonra onların kar qarşılığını tapıb deyin.

*Bu mis nə pis mis imiş, bu mis kaşan mis imiş.*
*Ay qılquyruq qırqovul, gəl bu kola gir,*
*Ay qılquyruq qırqovul.*
*Ağ balqabaq, boz balqabaq, ağ balqabaq.*

*Bazarda nə ucuz? Mis ucuz, duz ucuz, küncüt ucuz.*

Çalışma 4. Verilmiş nəsihətləri köçürün. Kar samitləri tapıb onların cingiltili qarşılığını göstərin. Hansı kar samitin cingiltili qarşılığı olmadığını söyləyin.

*Ağıl və kamal dövlətdən yüksəkdir.*

*Xoş danışsan, xoş cavab eşidərsən.*

*Rahatlıq zəhmətdədir.*

*Xalqa sədaqətli ol ki, xalq da səni tərifləsin.*

*Xoş söz ilanı yuvasından çıxardar.*

Bayatı, gəraylı, qoşma üzərində işin təşkili onunla əhəmiyyətlidir ki, tələbələr bu zaman həm heca üzrə biliklərini dərinləşdirir, həm də xalqının nəğmə çalarlı, musiqi ruhlu sənət nümunələri ilə tanış olur, həm də ədəbiyyat nəzəriyyəsi üzrə biliklərini mükəmməlləşdirirlər. Onlar müstəqil araşdırma nəticəsində bir daha aydınlaşdırırlar ki, şifahi xalq ədəbiyyatı növlərindən bayatıda hər misra yeddi hecadan, gəraylıda hər misra səkkiz hecadan, qoşmada isə hər misra on bir hecadan ibarətdir.

Şifahi xalq yaradıcılığı nümunələrindən istifadə etməklə yanaşı, tələbələri axtarışa meyl etdirmək, onları şifahi xalq ədəbiyyatı nümunələrini toplamaq işinə istiqamətləndirmək də olar. Məsələn, tələbələrə tapşırmaq olar ki, öz yaşayış zonaları üçün xarakterik olan şifahi xalq ədəbiyyatı növlərindən –nəğmələrdən, bayatılardan, sanamalardan, oxşamalardan və s. nümunələr toplasınlar.

«Leksika» bəhsinin tədrisi zamanı da müəyyən mövzuların təlimində şifahi xalq ədəbiyyatı nümunələrindən istifadə etmək olar. Omonim, sinonim və antonimləri keçərkən nəzəri biliyi tələbələrə çatdırdıqdan sonra aşağıdakı çalışmalar üzrə verilmiş bilikləri möhkəmləndirmək olar:

Çalışma 1 . Varxiyanlı Aşıq Məhəmmədin «Ya dala» təcnisindən verilmiş parçada omonim sözləri tapıb ifadə məfhumunu aydınlaşdırın.

*Kamandarın oxu dər yaya düşdü,*
*Qışın çilləsində dər yaya düşdü.*
*Dəli könlüm yenə dəryaya düşdü,*
*İstəyir ki, qəvvas kimi ya dala.*[24]

Bu çalışma ilə əlaqədar bir cəhəti qeyd etmək lazımdır ki, Azərbaycan leksikası üzrə ilkin tədqiqatlarda omonim sözlərlə aşıq poeziyasındakı cinaslar – eyni oxunuşa malik qafiyə sözlər eyniləşdirilmiş, cinaslar omonim sözlər kimi təqdim olunmuşdur.[25]

Lakin Ə. Dəmirçizadə bu fikrə qarşı çıxaraq cinasları omonim sözlərdən fərqləndirmiş, onların hər birinin sərhəddini müəyyənləşdir-mişdir. [26] Bu baxımdan verilmiş bəndin ilk üç

[24] Азярбайъан ашыглары вя ел шаирляри. Биринъи ъилд. Бакы 1983, сящ. 167.

[25] Ядябиййат нязярийyясиня эириш. Бакы, 1958

[26] Я. Дямрчизадя. Азярбайъан дилинин цслубиййаты. Бакы.1962, сящ.146-147

misrasındakı dər yaya, dər yaya, dəryaya sözləri cinas kimi götürülə bilsə də, onları omonim hesab etmək doğru deyildir. Cinas kimi bunlardan birincisi «Yayın içində, yayın içərisində», ikincisi «qapının yayı, qapının dartqısı» və nəhayət, üçüncüsü «dəniz» anlamalarını ifadə edir. Omonim kimi burada yalnız yay sözündən bəhs etmək olar. «Kamandarın oxu dər yaya düşdü» misrasındakı yay sözü «ox atmaq üçün yay», «Qışın çilləsində dər yaya düşdü» misrasındakı yay sözü isə «qapının yayı, qapını örtmək üçün istifadə edilən dartqı» mənasında işlədilmişdir.

Çalışma 2. «Loğmanın şəyirdi» nağılından götürülmüş aşağıdakı parçada sinonim sözləri tapıb göstərin.

*Müqəssir dedi:*

-- *Padşah sağ* olsun, *mən bağbanam. Bir gün bağda işlədiyim zaman oğruya* rast *gəldim. Qaçıb* onu tutmaq *istəyəndə yüyürüb divara çıxdı, küçəyə atılanda yıxılıb qıçı sındı. Məni* dustaq edib *dedilər: «Günah səndədi ki, bağın hasarını* uca *eləmisən. Divar hündür olmasaydı, oğru* hoppananda *yıxılıb qıçı sınmazdı, təqsirin çoxdur, səni cəzalandırmaq lazımdır ».*[27]

*Padşah* dedi: - *Düzdür, lap doğrudur.*

Çalışma üzərində aparılan iş nəticəsində aşağıdakı sinonimlər müəyyənləşdirilir:

*Qaçıb - yüyürüb*
*Günah - təqsir*
*Uca - hündür*
*Atılanda -* hoppananda
*Düzdür - doğrudur*

Çalışma 3. Verilmiş atalar sözlərində antonimləri tapıb altından xətt çəkin.

[27] Азярбайъан фолклору антолоэийасы. Икинъи китаб. Бакы 1968, сящ. 70.

*Ağ gün ağardar,*
*Qara gün qaraldar.*
*Azdan az demişlər, çoxdan çox.*
*Əyri oturaq, düz danışaq.*
*Yaxşılığa yaxşılıq hər kişinin işidi.*
*Yamanlığa yaxşılıq nər kişinin işidi.*
*Gündüz gəzir obanı,*
*Gecə sancır dabanı.*
*Hər şeyin təzəsi, dostun köhnəsi.*

Çalışma üzərində aparılan işdən sonra antonim qoşalıqları qruplaşdırılır:

*Ağ - qara*
*Ağardar - qaraldar*
*Az - çox*
*Əyri - düz*
*Yaxşılıq- yamanlıq*
*Gündüz - gecə*
*Təzə - köhnə*

Məlumdur ki, şifahi xalq ədəbiyyatı nümunələri zamanlardan aşmış, özündə hazırda dilimizdə işlənməyən, lüğət tərkibindən ya tamamilə çıxmış, ya da çox az işlənən sözləri qoruyub saxlayır. Ona görə də köhnəlmiş sözləri tədris edərkən tələbələrə şifahi xalq ədəbiyyatı nümunələri verərək oradan köhnəlmiş sözləri tapmaq onların bu mövzuya aid biliklərinin dərinləşməsinə, məşğələnin daha canlı və maraqlı keçməsinə səbəb olur. Bu zaman tələbələrə aşağıdakı folklor nümunələrini təqdim etmək məqsədə uyğundur:

*Əmək nəğmələri –*
*İranadakıboz öküz,*
*Qoparıbdı toz öküz,*
*Alıb yerin canını,*

*Çıxsın yaman göz öküz.*

*Dağ döşündə yatana,*
*Gün gedər ay batana.*
*Qara öküz qarğıyar*
*Cütün macın tutana.*[28]

*Bayatılar –*
*Eləmi, fərən düzə,*
*El gedər forən düzə.*
*Kəkliyin ölsün, fələk,*
*Dağılsın fərən düzə.*

*Mən aşiqəm, odu zağ,*
*O cənnətdir, o duzax,*
*Səməndər quşu mənəm,*
*Olmaz məndən od uzaq.*

*Eləmi, yasin deyim,*
*Oxuyun ya sin deyim,*
*Bir canım var, min dərdim,*
*Bilmirəm hansın deyim?!*[29]

*Aşıq şerləri -*
*Evlər yıxan ola daneyi-xalı,*
*Bir dəm kəm olmaya məndən xəyalı*
*Aya , günə bənzər ola camalı,*
*Həm də ola bənzi arı istərəm!*[30]

*Nə ağlarsan, nə sızlarsan,*

---

[28] Азярбайъан фолклор антолоэийасы. Бакы 1968, сящ.10.
[29] Байатылар . Бакы.1985, сящ. 32, 15
[30] Азярбайъан ашыглары вя ел шаирляри. Бакы. 1983, сящ.36.

*Bir dərdi beş* olan *könlüm!*
*Axırda zünnar bağlarsa,*
*Qəmə yoldaş* olan *könlüm!*[31]
*Hayıf* ola, *ağ biləklər, bazılar !*
*Ahum* otlar ceyran *ilə yazılar.*
Qohumum *yox, qardaşım yox, qazılar !*
*Yarəb, mənim* hal-*əhvalım* necola ?

*Gəl* bir *Məhəmmədi* dindir,
*Suçunu* boynuna mindir,
*Öldürürsən, özün öldür,*
*Qanım səndən* alan *yoxdu.*[32]

Çalışmalar üzərndə iş apararkən altından xətt çəkilmiş sözlərin aşağıdakı mənalarda işləndiyi, sonradan dilin lüğət tərkibindən çıxdıığı müəyyənləşdirilir:

*İrana - cütün açdığı şırım*
*Mac - cütün əl ilə* tutulan *hissəsi*
*Foran - o saat, o an*
*Zağ - qarğa*
Duzax - *cəhənnəm*
*Sin - qəbir*
*Arı - təmiz*
*Zünnar - qurşaq*
*Yazan - çöl, çəmən*
*Suç - günah*

[31] Йеня орда, сящ. 62.
[32] Азярбайъан ашыглары вя ел шаирляри. Бакы.1983, сящ.99,154.

Sözün quruluşca növlərini tədris edərkən şifahi xalq ədəbiyyatı nümunələri əsasında tərtib olunmuş aşağıdakı çalışmalardan istifadə etmək olar:

Çalışma 1 . Verilmiş atalar sözlərindən sadə sözləri seçib altından xətt çəkin.

*Ac toyuq yuxusunda darı görər.*
*Ağac bar gətirəndə başını aşağı dikər.*
*Qızınmadıq istisinə, kor olduq tüstüsünə.*

*İgid odur atdan düşə atlana,*
*İgid odur hər əzaba qatlana.*

*Keçmə namərd körpüsündən, qoy aparsın sel səni*
*Yatma tülkü kölgəsində, qoy yesin aslan səni.*[33]

Çalışma 2. Aşıq Ələsgərin «Dağlar» rədifli qoşmasından bir parçada düzəltmə sözləri seçib göstərin və onların necə əmələ gəldiyini izah edin.

*Bahar fəsli, yaz ayları gələndə,*
*Süsənli, sünbüllü, lalalı dağlar.*
*Yoxsulu, ərbabı, şahı,gədanı*
*Tutmaz bir-birindən alalı* dağlar.* [34]

Çalışma 3 . Verilmiş qəhrəmanlıq nəğmələrində mürəkkəb sözləri seçib göstərin.

*İgidlər oylağı o Çənlibeldə*

---

[33] Азярбайъан фолклору антолоэийасы. Бакы 1968, сящ. 171,179
[34] Ашыг Ялясэяр.1999, сящ. 59
* алалы – фяргли

*Daşdan qala quran qoç Koroğludu.*
*Kinli paşalara meydan oxuyan,*
*Çox köhlənlər yoran qoç Koroğludu.*[35]

*Nəbinin Bozatı dəlidi, dəli,*
*Çiynində aynalı, belində əli.*
*Nəbinin köməyi o mövlam Əli*
*Yağıdı soltana, bəy-xana Nəbi,*
*Bac alar, bac verməz divana Nəbi!*

*Azəri elinin qəhrəman oğlu,*
*Azadlıq yolunun qurbanı oldun,*
*And içdin vətənə , igid Səttarxan,*
*Yurdunun vüqarı, imanı oldun.*[36]

Say bəhsinin tədrisində miqdar saylarını keçərkən şifahi xalq ədəbiyyatı nümunələrindən – atalar sözü və məsəllərdən istifadə edilməsi də dərsin daha maraqlı keçməsinə səbəb olur. Bu zaman tələbələrə *atalar sözləri* və *məsəllərdən* nümunələr verərək miqdar saylarını tapmağa tapşırmaq olar.

Məsələn :

*Ayının yetmiş iki oyunu bir armudun başındadı*
*Mollanın qarnı beşdir, həmişə biri boşdur.*
*Başı mollanın, leşi mollanın,*
*Altıdan da beşi mollanın,*
*Yerdə qaldı bir dənə,*
*Onda da var işi mollanın.*
*Yüz ölç, bir biç.*
*Əldən qalan əlli il qalar.*
*Beş gün yaraq, bir gün gərək.*

---

[35] Азярбайъан фолклору антолоэийасы. Бакы 1968, сящ. 88.
[36] Азярбайъан фолклору антолоэийасы. Бакы 1968. Сящ. 97.

*Bir budağa çıxıb min budaq silkələyir.*

Morfologiyadan başqa mövzuların tədrisində də bu qayda ilə şifahi xalq ədəbiyyatı nümunələrindən istifadə etmək olar.

Sintaksisin tədrisində də folklor nümunələrindən istifadə edilməsi dərsin canlı və maraqlı keçməsinə, mənimsəmə üçün optimal şərait yaradılmasına imkan verir.

Yarımçıq cümlənin tədrisində tapmacalardan didaktik material kimi istifadə etmək daha məqsədə uyğundur. Tapmacalarda əsas məqsəd fikirdə tutulmuş məfhumu tapıb yerinə qoymaq olduğundan, onlarda daha çox mübtədası buraxılmış yarımçıq cümlələrdən istifadə olunur, yəni bilərəkdən cümlənin subyekti gizlədilir, buna görə də bu subyekti çox vaxt tapmacanın cavabında axtarmalı oluruq.

Məsələn :

*Bizdə bir kişi var,*
*Hər gələnə əl verir.(qapı dəstəyi)*

*Bir güzgüm var qapaxlı,*
*Dörd qırağı saçaxlı.(göz)*

*Bir yuvada iki toyux,*
*Biri isti, biri soyux.(yay və qış)*

*Gecə-gündüz yol gedər,*
*Yenə durar yerində.*

*Ayaq haça, baş haça,*[37]
*İki üzük, iki qıça.(Qayçı)*

[37] Азярбайъан фолклору антолоэийасы. Эюйчя фолклору. Бакы-2000.сящ. 628 .

Vasitəsiz nitq keçirilərkən nağıl və dastanlarımızdan, lətifə və rəvayətlərdən istənilən sayda didaktik material kimi istifadə edilə bilər. Çünki bu nümunələr süjetli xarakterdə olduğundan burada vasitəsiz nitq kimi işlənən cümlələr çoxdur.

Azərbaycan dilinin tədrisində yazı işləri aparılarkən də şifahi xalq ədəbiyyatı nümunələrindən didaktik material kimi istifadə etmək olar.

## ƏLİ YUSİF OĞLU HƏSƏNOVUN 50 İLLİYİNƏ TƏBRİK!

Əziz Əli müəllim !

Bu gün Sizin anadan olmağınızın yarım əsri tamam olur. Sizin ulu Göyçənin füsunkar kəndlərindən olan doğma Qoşabulaqda dünyaya göz açdığınız günün sevincini keçirənlərin böyüklü-kiçikli hamısının xoş çöhrələri sanki gözümün önündədir.

Uşaqlıq yaddaşı möhkəm olur; gözaydın lığına gələnləri də, muştuluq verənləri də, Allahtalaya dua edənləri də yaxşı xatırlayıram…Elə bil ki, o vaxtdan bizi 50 il deyil, az bir zaman kəsiyi ayırır. Mən Sizdən bir neçə yaş böyük olsam da uşaqlığımızı da, gəncliyimizi də birlikdə keçirmişik, necə deyərlər, bir-birimizin gözü qarşısında yaşa dolmuşuq.

Siz ömrünüzün mənalı 37 ilini doğma Göyçə mahalında -- dədə-baba yurdunda yaşamış, burada ictimai-siyasi həyata atılmış, göstərdiyiniz səy və bacarığın müqabilində geniş ictimaiyyət arasında nüfuz qazanmışsınız. Sizə etibar və həvalə edilən bütün vəzifələrdə namusla, vicdanla çalışmışsınız, camaatın marağını üstün tutmuşsunuz, güzəranının daha da yaxşılaşdırılmasını təmin etmək üçün var qüvvənizi əsirgəməmişsiniz. Sizdən yaşca böyük olan və uzun illər Basarkeçərdə məsul vəzifələrdə işləyən sələflərinizin görə bilmədikləri işlərin öhdəsindən kolxoz sədri kimi layiqincə gəlmişsiniz…

Ad günününüzdə olub- keçənləri xatırladıb Sizi kövrəltmək fikrində deyiləm. Məqsədim bir anlığa həm Sizi, həm də bu şad

gününüzün iştirakçılarını ötən illərinin xoş xatirələrinə, ötəri də olsa, ekskurs etdirməkdir. Sizin mərdliyiniz, mərdanəliyiniz, dostluqda sədaqət və dəyanətiniz, daha doğrusu, dostcanlığınız, sadalamağa ehtiyac bilmədiyim bu kimi müsbət xüsusiyyətləriniz son dərəcə müqəddəs və ali keyfiyyətlərinizdir. Bu dediklərimi yalnız Siz şəxsiyyətdə, Siz təmkində olanlar duyarlar. Siz geniş ictimaiyyət arasında yeri, hörməti və nüfuzu olan bir şəxsiyyət, ziyalı, rəhbər işçi, ailə başçısı və vətəndaşsınız. Sizin həyatda qazandığınız mənəvi dəyərlərin fövqündə dayanan bu gün bu təntənədə əyləşən çoxsaylı dostlarınızdır. Burada qədəhlər qaldıran, ünvanı bəlli, tanıdığımız bu gözəl insanlar həm Sizin üçün, həm də bizim üçün böyük mənəvi sərvət və dayaq olmaqla yanaşı, ömrümüzə bəzəkdirlər…

Oturub-durduğun şəxsiyyətlərin, milli dəyərlərini yüksək qiymətləndirdiyin dostlarınızdan Hamlet, Fikrət, Kərim, Dilqəm, Hümbət, Vaqif, Zakir, Məhəmməd, İslam, Rauf, Xanlar, Akif, Sabir, Vladimir, Şərif və adlarını sadalaya bilmədiklərim təkcə Sizin ailə üçün deyil, bütün doğmaların üçün də əzizdir.

Mən də əmioğlu kimi, bir həmvətənli soydaşın kimi bu dostlarınla bahəm Sizlə fəxr edirəm. Yarıməsrlik yubileyinizi ürəkdən təbrik edir, möhkəm cansağlığı, səadət, xoşbəxtlik, bütün işlərinizdə uğurlar arzulayıram. Qoy ulu Tanrı üstünüzdə yar olsun, bütün xatalardan qorusun və mətləb- muradınızı versin!.. 50 yaşın – ad günün mübarək, Əli müəllim!

**Dərin hörmət və ehtiramla: Ziyəddin, Namiq, Firəngiz, Sadə, İlhamə, Ruhiyyə, Vüsalə, Orxan, Leyla və Fidan. 15 noyabr 2001-ci il.**

## SABİR YADİGAR OĞLU VƏLİYEVİN 60 İLLİK YUBİLEYİNƏ TƏBRİK

Əziz Sabir müəllim !

Bu gün Sizin anadan doğum gününüzün 60 ili tamam olur. Sizin ulu Göyçənin füsunkar dağları qoynuna sığınan ən mənzərəli kəndlərindən olan doğma Yuxarı Zağalıda dünyaya göz açdığınız günün sevincini keçirənlərin bir çoxu dünyasını dəişdirdiyindən indi aramızda yoxdur, bir çoxları isə taleyinə yazılan qaçqınlığı ilə müxtəlif ərazilərdə doğma yurd yerlərinin həsrəti ilə Allah talanın onlara qismət etdiyi ömrü yaşayırlar. Ömrünüzün ən mənalı günlərindən olan bu təngənəli məclisinizdə qohum – qonşulardan kimlərin iştirak etdiyini bilməsəm də, Siz ömrünüz boyu, daha doğrusu , ictimai həyata atıldığınız ilk gündən özünüzü hamının dostu, qardaşı, yaxın silahdaşı kimi tanıtmışsınız.

Uşaqlıq yaddaşı möhkəm olur; Sizi Daşkənd orta məktəbində oxuyanda rayonun başqa kəndlərindən burada təhsil alanlara nümunə göstərərdilər, gələcəyiniz barədə müəllimlərinizin hələ o zamanlar söylədiyi fikirlər nail olduğunuz, qazandığınız bu gün burada, bu möhtəşəm zalda sadalanan müvəffəqiyyətlərinizdən xəbər verirdi. O günləri, sazlı-sözlü anları yaxşı xatırlayıram…

Elə bil ki, o vaxtdan bizi 40 il deyil, az bir zaman kəsiyi ayırır. Mən Sizdən bir neçə yaş kiçik olsam da uşaqlığımızın da, gəncliyimizin də demək olar ki, müəyyən anlarını birlikdə keçirmişik, necə deyərlər, bir-birimizin gözü qarşısında yaşa dolmuşuq.

Uşaqlığınızdan zirvəsində xəstə üçün qar olan uca dağların qoynunda əzəmətlə görünən Çiçəklini dünyanın cənnəti, gələcək firavan həyatınızın mə’nası saymış, burada məktəbə qədəm qoymuş, ana, vətən barədə ilk duyğularınızı da burada müqəddəsləşdirmiş, çətinlikləriniz olsa da, valideynlərinizə hiss etdirməmiş, yaddaşınıza həkk etdiyiniz acılı-şirinli xatirələrinizi

nikbincəsinə qəlbinizdə yaşatmaqla həyatda bütün istək və arzularınıza çatmışsınız.

1969-cu ildə Kənd Təsərrüfatı İnstitutunu fərqlənmə diplomu ilə bitirərək tə'yinatla Qubaya Kənd Təsərrüfatı Kadrlarının İxtisasını artıran məktəbə müəllim göndərilməyiniz, 1970-ci ildə aspiranturaya daxil olmağınız, «Radiasiya rejimi müəllimin yorulmadan yazıb-yaratdığı, və onun üzüm sahələrinin struktur tərkibinin təşkilindən asılı olaraq günəş radiasiyasından istifadə» mövzusunda geniş elmi araşdırma aparmağınız, 1974-cü ildə Krımın Yalta şəhərindəki Ümumittifaq Elmi-Tədqiqat Üzümçülük və Şərabçılıq «Maqaraç» İnstitutunun İxtisaslaşmış Elmi Şurasında göstərilən mövzuda namizədlik dissertasiyasını uğurla müdafiə edərək biologiya elmləri namizədi alimlik dərəcəsi almağınız, gənc alim kimi SSRİ Yeyinti Sənaye Nazirliyinin tə'yinatı ilə Azərbaycan Dövlət Üzümçülük-Şərabçılıq İstehsalat Komitəsinə böyük mütəxəssis kimi işə göndərilməyiniz, burada əvvəlcə Kənd Təsərrüfatı İdarəsinin rəis müavini, 1977-ci ildən 1986-cı ilədək Baş Üzümçülük İstehsalat İdarəsinin rəisi və DÜŞİK-də kollegiya üzvü olmağınız, 1986-88-ci illərdə Dövlət Aqrar Sənaye Komitəsinin Meyvə-Tərəvəzçilik və Üzümçülük və Şərabçılıq Baş İdarəsinin nazir müavini səlahiyyətində rəis müavini, 1988-89-cu illərdə Elm – İstehsalat Şərabçılıq Birliyinin Baş direktoru – Azərbaycan Elmi-Tədqiqat Üzümçülük-Şərabçılıq İnstitutunun direktoru, 1989-93-cü illərdə «Azərkənd-kimya» Respublika Birliyinin sədr müavini, 1993-cü ildən isə Kənd Təsərrüfatı Nazirliyinin müxtəlif aparıcı idarələrində, o cümlədən Baş Bitkiçilik Məhsullarının İstehsalı İdarəsinin rəisi vəzifələrində işləməyiniz Sizin ictiman-siyasi fəaliyyətinizin ayrı-ayrı məqamlarının salnaməsidir. Dağlıq Qarabağda və onun ətrafında baş verən hadisələrin ilk ağır vaxtlarında Şuşada olmağınız, vilayətin təsərrüfat rəhbərlərinin iştirakı ilə yığıncaqlar keçirməyinizi, əmək adamlarına əməli yardım və köməkliklərinizi indi də yaxşı xatırlayırlar.

Sizin bir şəxsiyyət kimi o qədər gözəl , səciyyəvi xüsusiyyətləriniz var ki, onları saymaqla qurtaran deyil. Burada əyləşən, uzun illərdən bəri Sizinlə çiyin-çiyinə çalışan iş yoldaşlarınızın, dostlarınızın, eyni zamanda sadə əmək adamlarının hansı birindən soruşsalar tərəddüd etmədən deyərlər: Sabir müəllim mə’nəvi-milli dəyərləri yaşadan ziyalıdır. Bir dəfə duz-çörək kəsdiyi adamı ömrü boyu unutmur. İnsanlara qarşı çox həssas və mehribandır. Sözü bütövdür. Sazla-sözlə bağlı adamlarla dostluq işlədir, şe’riyyəti, xalq yaradıcılığını sevənlərlə oturub-durur. Çaldığı saz havaları, oxuduğu gözəlləmələri bir dəfə dinləyən təkrar eşitməyin həsrətini çəkir. Sabir müəllim ürək dostu olanları çox sevir. Onun dostluğunun mə’nası olduqca dərindir, aran havası kimi barlı-bəhrəli, yaylaq havası kimi təmiz və rayihəlidir, ətirlidir. Sabir müəllimin kimliyini bu ətri duyanl ailəvi dostları bilirlər.

Sabir müəllim ! Siz ömrünüzün ən mənalı illərini doğma Azərbaycanda yaşamış və burada ictimai-siyasi həyata atılmışsınız, göstərdiyiniz səy və bacarığın müqabilində geniş ictimaiyyət arasında nüfuz qazanmışsınız. Sizə etibar və həvalə edilən bütün vəzifələrdə namusla, vicdanla çalışmışsınız, camaatın marağını üstün tutmuşsunuz, güzəranının daha da yaxşılaşdırılmasını təmin etmək üçün var qüvvənizi əsirgəməmişsiniz.Ad günününüzdə olub- keçənləri xatırladıb Sizi kövrəltmək fikrində deyiləm. Məqsədim bir anlığa həm Sizi, həm də bu şad gününüzün iştirakçılarını ötən illərinizin xoş xatirələrinə, ötəri də olsa, ekskurs etdirməkdir. Sizin mərdliyiniz, mərdanəliyiniz, dostluqda sədaqət və dəyanətiniz, daha doğrusu, dostcanlığınız, sadalamağa ehtiyac bilmədiyim bu kimi müsbət xüsusiyyətləriniz son dərəcə müqəddəs və ali keyfiyyətlərinizdir. Bu dediklərimi yalnız Siz şəxsiyyətdə, Siz təmkində olanlar duyarlar. Siz geniş ictimaiyyət arasında yeri, hörməti və nüfuzu olan bir şəxsiyyət, ziyalı, rəhbər işçi, ailə başçısı və vətəndaşsınız. Sizin həyatda qazandığınız mənəvi dəyərlərin fövqündə dayanan, bu gün bu təntənədə əyləşən çoxsaylı dostlarınızdır. Burada

ünvanı bəlli, tanıdığımız bu gözəl insanlar həm Sizin üçün, həm də bizim üçün böyük mənəvi sərvət və ömrümüzə bəzəkdirlər…

Oturub-durduğun şəxsiyyətlərin milli dəyərlərini yüksək qiymətləndirdiyin dostlarınızdan Kənd Təsərrüfatı Naziri İrşad Əliyev cənabları başda olmaqla adlarını sadalaya bilmədiyim ünvanlı şəxsiyyətlər bütün doğmalarınız üçün də əzizdir.

Mən də bir həmvətənli soydaşınız kimi bu dostlarınızla bahəm Sizlə fəxr edirəm. Altmışillik yubileyinizi ürəkdən təbrik edir, möhkəm cansağlığı, səadət, xoşbəxtlik, bütün işlərinizdə uğurlar arzulayıram. Qoy ulu Tanrı üstünüzdə yar olsun, bütün xatalardan qorusun və mətləb- muradınızı versin!.. 60 yaşın – ad günün mübarək, Sabir müəllim!

***Dərin hörmət və ehtiramla: Ziyəddin, Namiq, Firəngiz, Sadə, İlhamə, Ruhiyyə, Vüsalə, Orxan, Leyla və Fidan. 17 may 2002-ci il.***

MÜNDƏRİCAT

TANINMIŞ ZİYALILAR, ELM VƏ MƏDƏNİYYƏT ADAMLARI…

PUBLİSİSTİKA



ZİYƏDDİN MƏHƏRRƏMOV
(Ziyəddin Həmil oğlu Məhərrəmov)

SÖZÜN YADDAŞI ƏBƏDİDİR
(Azərbaycan dilində)

